Azərbaycan Milli Elmlər Akademiyası Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutu elmi şurasının 10 iyul 2009-cu il tarixli 7 №-li iclasının qərarı ilə nəşr edilir.

**Redaktoru:** **Möhsün Nağısoylu, filologiya elmləri doktoru**

**Rəyçilər:** **Nəsib Göyüşov, filologiya elmləri namizədi,**

**Sabir Rüstəmoğlu, dosent**

**Kompüter icraçısı:** **Pəri Qeyisova**

**Kompüter düzümü:** **Suad Əhmədov**

**Raqub Kərimov. Abdulla bəy Asinin həyat və yaradıcılığı. Abdulla bəy Asi. Şeirləri. Bakı: Nurlan, 2009, 210+83 s.**

## ABDULLA BƏY ASİ
## (1841 - 1874)

XIX əsr Qarabağ ədəbi mühiti bir sıra parlaq və istedadlı şairlər yetirmişdir ki, onlardan biri də incə, lirik şeirlər müəllifi kimi tanınan Abdulla bəy Asidir. Abdulla Əli bəy oğlu Fuladov 1841-ci ildə Şuşa şəhərində anadan olmuşdur. Abdulla bəy ilk təhsilini həmin dövrdə Şuşada fəaliyyət göstərən mədrəsələrdən birində almış, yüksək istedadı sayəsində qısa müddət ərzində ərəb, fars, rus və cığatay dillərini mükəmməl öyrənə bilmişdi. Təbii ki, onun uğur qazanmasında gənc Abdullanın fitri istedadı və şairliyə meyil etməsində ana babası dövrünün böyük şairi Qasım bəy Zakirin (1784-1857) xüsusi rolu olmuşdur. Xan ailəsinə yaxın olmasına baxmayaraq, Abdulla bəyin həyatı ağır keçmiş, özünün sonralar yazdığı kimi, «gecə-gündüz cigərinin qanını içmiş, Qarabağ şəhərində hasili yalnız dərdü qəm» olmuşdur.[1] O, atasını erkən yaşlarında itirmiş, iki qardaşı və bir bacısı ilə babası Zakirin himayəsində yaşamışdı. Abdulla bəyin atası Əli bəy əvvəllər həllac olmuşdur. Mehduqulu xan İrandan vətənə döndükdən sonra (1827) Əli bəyin nəcibliyini, halal və sədaqətli bir insan olduğunu nəzərə alaraq onu sarayına gətirmiş, bütün təsərrüfat işlərinə nəzarəti ona tapşırmışdı. Getdikcə xanın rəğbətini qazanan Əli bəy tezliklə xan ailəsinin doğma üzvünə çevrilmiş və bu yaxınlığı doğmalaşdırmaq üçün Xan öz bacısı nəvəsi Nənəş xanımla (Qasım bəy Zakirin böyük qızı) onun izdivacını təşkil etmişdi. Mehdiqulu xan Əli bəyə qəlbən bağlandığı və inandığı üçün onun ilk övladını oğulluğa götürərək atasının şərəfinə onun adını İbrahim qoymuşdur. Bu yaxınlıq xanın sağlığında ailəyə xoşbəxtlik gətirsə də, Mehdiqulu xanın ölümündən sonra (14 may 1845) onların fəlakətinə səbəb oldu. Xanın ölümü düşmənlərin intiqam alması üçün real şərait yaratdı. Uzun müddət xanla ədavətdə olan Şuşa şəhərinin qəza rəisi milliyyətcə erməni olan

[1] AMEA-nın Əlyazmalar İnstitutu cüng. B-132/1750. B-236/1854.

Konstantin Tarxan —Mouravov, Şuşa qazısı Mirzə Əbdülqasım və nəhayət, xanın qardaşı oğlu, babası ibrahim xan öləndən sonra (1806) uzun müddət əmisi Mehdiqulu xanla hakimiyyət uğrunda mübarizə aparan Cəfərqulu xan Əli bəydən intiqam almaq qərarına gəldilər. Bu şəxslərin hər birinin Mehdiqulu xan və Zakirlə ədavətləri var idi. Qarabağda əvvəl polismeystr, sonra mahal rəisi vəzifəsində işləyən Tarxan Mauravov Zakirin qardaşı oğlanları Rüstəm və Behbudu haqsız yerə öldürtmüş və Zakirin tutulmasında əsas rol oynamışdır. Bu düşmənçiliyin ibtidası da Zakirin Mehdiqulu xana və Əli bəyə yaxın olmasından başlayır. Sağlığında Mehdiqulu xandan çəkinərək məkrli niyyətini həyata keçirə bilməyən Tarxan Mauravov yaranmış vəziyyətdən məharətlə istifadə edərək xanın intiqamını onun ən sadiq və yaxın adamı olan praporşik Əli bəy Fuladovdan almaqda da fəal iştirak etdi.

Cəfərqulu xanın Mehdiqulu xanla olan ədavətinin isə daha qədim bir tarixçəsi vardır. Bu ədavətin bünövrəsi hələ 1805-ci ildə, bəlkə ondan da öncə qoyulmuşdur. Qrabağ xanı İbrahim xan sağlığında böyük oğlu Məhəmmədhəsən ağanı özünə vəliəhd təyin etmiş və bu haqda bütün rəsmi dairələrə məlumat vermişdir. Lakin 1805-ci ildə hələ İbrahim xan sağ ikən oğlu Məhəmmədhəsən ağanın vərəmdən ölməsi vəziyyəti dəyişdi. Ibrahim xan ikinci oğlu Mehdiqulu ağanı onun əvəzinə varis təyin etdi. Bu hadisə Məhəmmədhəsən ağanın böyük oğlu, yetkinlik yaşına (25-26 yaş) çatmış Cəfərqulunu son dərəcə məyus etdi. O, atasından sonra varisliyin qanuni şəkildə ona çatmalı olduğu halda, əmisinə verilməsini qeyri-qanuni hesab edərək həmin gündən Mehdiqulu xana düşmən kəsildi və demək olar ki, bütün həyatı boyu onunla hakimiyyət uğrunda mübarizə apardı. Ancaq onun bütün cəhdləri boşa çıxdı. Nəhayət, Mehdiqulu xanın ölümü istəyinə çatmaq üçün onun qəlbində yenidən ümid çırağı yandırdı. Cəfərqulu xan heç olmasa Mehdiqulu xanın var-dövlətinə sahib olmaq məqsədilə əmisi arvadı Bədrcahana elçi düşüb, onu özünə, qızı Natəvanı

isə oğlu Hidayətə almaq istədiyini bildirdi. Lakin onun bu ümidi də puça çıxdı. Növbəti dəfə uğursuzluğa düçar olan Cəfərqulu xan digər narazı qüvvələrlə birləşərək Xan ailəsinin ən sədaqətli adamı olan, Mehdiqulu xanın ölümündən sonra da ağasına sadiq qalaraq onun bütün təsərrüfatını göz bəbəyi kimi qoruyub, namusla idarə edən Əli bəydən intiqam almaq qərarına gəldi. Onun səfərbər etdiyi narazı qüvvələrdən biri də Şuşa qazisi Əbülqasım idi. Görkəmli tədqiqatçı alim Kamran Məmmədov bu hadisəyə münasibət bildirərək yazır: "Mehdiqulu xan vəfat etdikdən sonra... onlar Mehdiqulu xana yaxın olan adamlardan, o cümlədən, Əli bəydən, Zakirdən və onlara yaxın olan adamlardan qisas almağa və onları bir-bir "dənləməyə" başlayırlar... Mehdiqulu xan vəfat etdikdən sonra Əlibəy Fuladov da öz ailəsi ilə Ağdamdan Şuşaya köçür. Şuşa qazisi Mirzə Əbülqasım Cəfərqulu xanla birləşərək Əlibəyin Şuşaya köçməsi ilə yeni bir hiylə düzəldir və dolayı yolla Zakirdən intiqam alırlar"[1].

Nəhayət, intiqam hissi hər üç məkrli düşməni birləşdirir və onlar öz istəklərinə nail olurlar. Bunun üçün onlar Kərbəlayi Allahverdi adlı birisini öyrədib Əli bəyə şər atdırırlar. Güya Əli bəy üç nəfər şahidin yanında ondan 1200 tümən borc almış və bu günə qədər də onu qaytarmamışdır. Yalançı şahidlər —Ağa Novruz, baqqal Hüseynəli və kar Cəfər vasitəsilə uydurulmuş böhtana haqq qazandırılır və nəticədə Əli bəyin hamamı alınaraq Kərbəlayi Allahverdiyə verilir. Bu hadisədən bərk sarsılan Əli bəy haqsızlığa dözməyərək dünyasını dəyişir. Bununla da ailənin faciəli həyatı başlayır. Bu hadisələrin canlı şahidi olan və bu ədalətsiz dünyada əli heç yerə çatmayan Zakir təskinliyini həcvi yazmaqla tapır. O, "Üsuli və şeyxi təriqət mollaların həcvi" adlı şeirində ölkədə baş alıb gedən qanunsuzluq, rüşvətxorluq və ədalətsizlik kimi qeyri-normal həyat şəraitini tənqid etməklə yanaşı, konkret olaraq kürəkəni Əli bəyin başına gətirilən müsibətləri və bu

---

[1] K.Məmmədov. Qasım bəy Zakir.B.1957, səh.24

müsibətlərin əsas səbəbkarı olan ayrı-ayrı şəxsləri, ümumiyyətlə isə cəmiyyətin özünü tənqid edərək yazırdı:

Bir içim çay ilə yüz şahidi-bidin tapılır,
Necə kim, Əli bəyin çıxdı göyə əfqani.

Cəfəri-kar ki, eşitməz, çalalar, zurna səsin,
Der imiş mən hamıdan yaxşı eşitdim ani.

Yeddi gündən sora bir şəxs Dizaqdan yetişib,
Qaziyi-şəhr yazıbdır biri də filani.

Eşidiblər ki, olur şahidi-şiə məqbul,
Bağlayıb uzun Hüseynəli dəri-dükkani.

Həzrəti-qaziyə yanındakı Ağa Novruz,
Eyləyib hər biri bir tərz münasibxani.

Biri bəqqali-bədəfalü kəlambazü füzul,
Biri əhli-zələmə zadeyi-Şəkkərbani.

...Doğruluq qalmayıb əsla bu fəna aləmdə,
Sərnigun ola, görüm, beylə yaman dövrani[1].

Növbəti dəfə ailəni himayəyə götürən Zakir hədəfə çevrilir. Zakir sanki qabaqcadan hiss etmişdi ki, bu amansız düşmənlər gec-tez onun da başına müsibətlər gətirəcək, kürəkəni Əli bəy kmi onu da şərə salacaqlar:

Hər kimin var isə həmmami edər qərzin əda,
Bari bizlər kimiyə atmayalar böhtani.

---

[1] Qasım bəy Zakirin seçilmiş əsərləri Bakı 1953, səh.434.

Onun şübhələri düz çıxdı. Əli bəyə qurulan tordan məharətlə bəhrələnən düşmənlər bu çirkin oyunu davam etdirərək əvvəlcə Zakirin oğlu və qardaşı oğlunu tutdurur, daha sonra isə özünü ağır əzablara düçar edirlər. Düşmənlərin güclü olması Zakiri mübarizədən çəkindirə bilmədi. O, yeganə silahı olan şeirin gücünə arxalanaraq öz həcvlərilə düşmənlərini qədərincə atəşə tutub, onları rusvayi-cahan etdi. Bütün bu hadisələrin şahidi olan balaca Abdulla intiqam eşqiylə alovlansa da, çıxış yolu tapa bilməyib yaşadığı ədalətsiz dünyada bütün dərdləri ürəyində çəkməklə kifayətləndi. Bəlkə də elə bunun nəticəsi idi ki, o cəmi 34 il ömür sürdü.

Abdulla bəy Asinin həyatı haqqında dövrün mənbələri və sonrakı tədqiqat əsərlərində verilən məlumatlar üst-üstə düşür. Şairin anadan olma tarixi Mir Möhsün Nəvvabın «Təzkireyi-Nəvvab» əsərində, Firidun bəy Köçərlinin «Azərbaycan ədəbiyyatı» kitabında, Salman Mümtazın verdiyi qısa məlumatda 1256-cı il (1841) kimi, vəfatı isə, Müctəhidzadənin «Riyazül –aşiqin təzkirəsi» də daxil olmaqla bütün qaynaqlarda 1291-ci ilin şəban ayı (13 sentyabr 1874) kimi qeyd olunmuşdur (yalnız Salman Mümtaz şairin ölüm tarixini 1290-cı il kimi (1873) göstərmişdir).

Bu mənbələrin hər birində Abdulla bəy Asinin həyatı haqqında olduqca qısa məlumat verilir. Salman Mümtaz adı çəkilən digər müəlliflərdən fərqli olaraq, Abdulla bəyin naçalnik dəftərxanasında qeydiyyatçı və tərcüməçi vəzifəsində işlədiyini də göstərmişdir. Həmin məlumat daha çox əhəmiyyət kəsb etdiyi üçün onu olduğu kimi veririk: «Asinin adı Abdulla bəy, Azərin ortancıl qardaşıdır. Təvəllüd edib 1256-cı ilin zilhiccə ayının üçüncü günü, təlimi olub Şuşa şəhərində, ərəbi, farsi, türki, rusi təlim alıb. Naçalnik dəftərxanasında registrator və tərcüməçi olub. Qerbernski sekretarlıq çini alıb. Vəfat edib 1290-cı ildə. Nəşi göndərilib Ətəbati —Aliyata. Təbi-səri və səlimi var idi —Mümtaz».[1]

[1] AMEA-nın əlyazmalar İnstitutu, S.Mümtazın arxivi.

Bu qeydlərdən aydın olur ki, Asi dövlət idarəsində çalışmış, savadlı olduğu üçün katiblik rütbəsinə qədər ucalmışdır. Lakin onun cəsədinin Ətəbati —Aliyə —(müqəddəs ziyarətgahlardan birinə) göndərilməsi məlumatı bizdə şübhə doğurur. Çünki əgər bu, həqiqətən də, belə olsaydı, yəqin ki, digər mənbələr, xüsusilə də Nəvvab, Müctəhidzadə və Köçərli həmin məlumatı hökmən böyük iftixarla dönə-dönə qeyd edərdilər. Azərbaycan MEA M.Füzuli adına Əlyazmalar İnstitutunun arxivində saxlanılan bir fraqmentdə[1] Asinin 1836-cı ildə anadan olub 1871-ci ildə vəfat etməsi haqqında məlumat verilir. Ümumilikdə isə onun 36 il ömür sürdüyü qeyd olunur. Lakin bu göstərilənlər fakta əsaslanmır və bizim fikirimizcə, bu məlumat dəqiq deyil. Burada Abdulla bəyin bir şair kimi formalaşmasında həm Zakirin, həm də böyük qardaşı Azərin rolu olduğu da qeyd olunur. «Türkcəsində Zakirin təsiri görüldügü kibi, farscasında Azərin təsiri duyulur».[2]

Bu, bir danılmaz həqiqətdir ki, istər Abdulla bəyin, istərsə də onun iki qardaş və bir bacısının şair olmasında bilavasitə babaları Qasım bəy Zakirin böyük rolu olmuşdur. Ancaq böyük qardaş Azərin Asiyə nə dərəcədə təsir etdiyini söyləmək bir qədər çətin və məsuliyyətlidir. Çünki bir şair kimi Asi ondan qat-qat qüdrətli və istedadlı olmuşdur.

Asi haqqında məlumat verən bütün mənbələr istinasız olaraq onun şəxsiyyətinə ehtiramla yanaşmış, yüksək şairlik istedadına malik bir şəxs olduğunu iftixarla qeyd etmişlər. Tədqiqatçılar Abdulla bəyin təxəllüsünə ehtiyatla yanaşmış, dövrü üçün bir o qədər də məqbul hesab edilməyən bu təxəllüsün əsl mənasını qismən yumşaltmağa çalışmışlar. Hər şeydən öncə qeyd etmək lazımdır ki, «Asi» təxəllüsü xüsusilə XIX əsrdə geniş yayılmışdır. Bizə bu dövrdə Abdulla bəyin müasiri olan daha üç «Asi» təxəllüslü şair məlumdur və onların hər birinin əsərləri əlyazma şəklində M.Füzuli adına Əlyazmalar İnstitutunun arxivində saxlanılır. Bunlar Asi Məhəmməd İs-

---

[1] AMEA-nın Əlyazmalar İnstitutu. Müznibin arxivi, Fr-831/7979
[2] Yenə orada.

mayıl Buzovnalı (B —1473 (avtoqraf), Asi Mir ağa (B - 576), Asi Molla İbrahim Səlyanidən (B - 1495) ibarətdir. Bir məqamı da xüsusi olaraq qeyd etmək lazımdır ki, sözügedən «Asi»lərin hər biri son dərəcə dindar olmuş və yaradıcılıqlarında dini mövzulara, onun təbliğinə geniş yer vermişlər. Onu da qeyd edək ki, Abdulla bəydən fərqli olaraq onların hər üçü din xadimi olmuşlar. Belə olan halda «Asi» sözünü «Allaha asi düşmək», «inamsız», «dinsiz» mənasında yozmaq tamamilə yanlış olardı. Ancaq buna baxmayaraq, Abdulla bəyin «Asi» təxəllüsünü seçməsi tədqiqatçılar arasında müxtəlif mənalarda yozulur. Bir qisim tədqiqatçılar bunu Abdulla bəyin şəraba qurşanması, dinə inanmaması, Allaha asi düşməsi ilə bağladıqları halda, digər qisim tədqiqatçılar bunu nisbətən yumşaq tərzdə dövrlə, zamanla barışa bilmədiyi üçün seçdiyini iddia edirlər. Bizim fikirimizcə, «Allaha asi düşmək», «dinsizlik» müddəaları əsassız və yanlışdır. Düzdür, Asinin şəraba meyil etməsi, onun meyə, şəraba aid şeirlər yazması bir fakt olaraq qalır, bunu müqtədir tədqiqatçı F.Köçərli də qeyd edir: «Asi əleyhirrəhmə özü dəxi öz əməlindən razı deyildi. O, həmişə əhibbaları arasında özünün günahkar, xar və zəlil olmağına kəmali-nədamət və peşimançılıq ilə bəyan edirdi və tövbə, inabə yoluna üz çöndərməyə amadə idi və məsiyət dəryasına qərq olmağından naşı «Asi» təxəllüsünü hali-şəninə ən münasib bilib, onu intixab etmişdi.»[1] Lakin unutmaq olmaz ki, şair eyni zamanda dinə, islam ehkamına, tarixi dini şəxsiyyətlərə, xüsusilə də Kərbəla hadisəsinin iştirakçılarına, onların müsibətlərinə ürək yanğısı ilə yanaşmış və bu vaqiələri əsl dindar müsəlman kimi qələmə almışdır. Bu da məlum həqiqətdir ki, Asi dinsiz, mülhid bir şəxs olsaydı, yəqin ki, M.M.Nəvvab kimi Qarabağ ədəbi ictimaiyyətində tanınan, öz dini görüşlərilə məşhur olan bir şəxs ona ehtiram bəsləməz və onun «din yolçusu sayıldığını» təzkirəsində yazmazdı. Və bu da inandırıcı olmazdı ki, təkcə qarabağlıların deyil, ümumilikdə XIX əsrin ikinci yarısında yaşa-

[1] F.Köçərli. Azərbaycan ədəbiyyatı. II cilddə, II cild. B.1981, səh.109.

yıb-yaratmış bütün poeziya həvəskarlarının sözün əsl mənasında sevimlisi olan bir şəxs özünə «dinsiz», «imansız» ləqəbi seçsin. Eləcə də «Asi» sözünün daşıdığı yalnız bir məna üzərində dayanıb qərar vermək də, fikrimizcə, düz olmazdı. Ərəb mənşəli bu söz əsasən iki mənada işlənir: 1)itaət etməyən, baş əyməyən, üsyankar; 2)günahkar, günah işlədən, çılğın. Bizim fikrimizcə, Abdulla bəy məhz özünü Allah qarşısında günahkar hesab etdiyi üçün «asi» sözünün ikinci mənasına görə özünə «Asi» təxəllüsünü seçmişdir.

XIX əsr Qarabağ ədəbi mühitinin yetirdiyi görkəmli şair Abdulla bəy Əlibəy oğlu Asi təzadlarla dolu son dərəcə mAraqlı bir həyat yolu keçmiş, cəmi 34 il ömür sürməsinə baxmayaraq, ədəbi ictimaiyyətin dərin rəğbətini qazana bilmişdir. Təkcə Qarabağda deyil, Azərbaycanın digər regionlarında yaşayıb-yaradan ən görkəmli sənət adamları da ona dərin ehtiram bəsləmiş, qüdrətli qələm sahibi olduğunu dönə-dönə qeyd etmişlər. Asinin yüksək istedada malik olması haqqında dövrün bütün mənbələrində məlumat verilir. Mir Möhsün Nəvvab onu «şux və incə zövqlü bir cavan» kimi təqdim edir və «Biçarənin ömrü vəfa etmədi, yoxsa ki, şairliyə lazım olan hər şey onda var idi» qeydləri ilə təəssüfləndiyini bildirir; Müctəhidzadə onun Qarabağda əvvəlinci şair olduğunu yazır:: «Müxtəsər, kəlamı-müəzzəməleyh bu sərdə Şuşa şəhərinin əhli-zövq və ərbabi-şövqündən əvvəlinci hesab olunmuşdur»;[1] Görkəmli tədqiqatçı Firidun bəy Köçərli isə təzkirəçilərdən fərqli olaraq onun əsərləri haqqında konkret fikir söyləyərək şairin digər regionlarda da böyük şöhrət qazandığını iftixarla qeyd etmişdir: «Asinin təbi-şeriyyəsinin sədası hər yerə yayılıb, öz əsrində kəlam əhlinin sərəfrazı, şerü qəzəl deməkdə üdəbalar mümtazı olub, onun namü şöhrəti Şəki, Şirvan, Gəncə və Qazax mahalına yayılmışdır».[2] Göstərilən nümunələrdən məlum olur ki, dövrünün ən məşhur şairlərindən olan Asi müasirləri ilə geniş yaradıcılıq əlaqəsi

---

[1] M.Müctəhidzadə. Riyazül-aşiqin. B. 1995, səh. 161.
[2] F.Köçərli. Azərbaycan ədəbiyyatı. II c. B. 1981, səh. 104.

yarada bilmişdir. Asinin belə məşhur olmasının bir neçə səbəbi vardır: Fikrimizcə, bunlardan birinci və ən başlıcası onun gözəl şairlik istedadına malik olması; ikincisi, müqtədir şair Qasım bəy Zakirin nəvəsi olması; üçüncüsü isə Xan qızı Natəvanı həcv etməsi idi.

Asi irsinin ilk tədqiqatçısı Firidun bəy Köçərli onun irsinə rəğbətlə yanaşmış, sənətini yüksək qiymətləndirərək, əksəriyyət tərəfindən sevildiyini qeyd etmişdir. Tədqiqatçı, Asinin qüdrətli şair olmasını faktlarla sübut etməyə çalışmışdır. Bunun üçün o, birinci növbədə XIX əsrin ən böyük şairlərindən olan, adını ehtiramla çəkərək «şairi-dövran», «ədibi-süxəndan» deyə müraciət etdiyi Seyid Əzim Şirvaninin Asiyə olan münasibətini əsas götürərək yazır: «Mərhum Asinin şöhrəti və hörməti xüsusən Şirvan şüəravü ürəfası mabeynində intişar bulmuşdu. Belə ki, Hacı Seyid Əzim kimi müqtədir bir şairi-dövran və ədibi-süxəndan Asini məlikiüş-şüəra məqamında tutub özünü ona nisbət bir kəmtərin qulam hesab edir. Necə ki, deyibdir:

Nə Asi, ol ki, dəri-izzətinə Seyyidi-zar,
Qulamı olmaq ilə sahibixtiyar olacaq…»[1]

Daha sonra F.Köçərli təkcə Seyid Əzimin Asiyə olan münasibəti ilə kifayətlənməyib bütünlükdə «Beytüs-Səfa» ədəbi məclisinin aparıcı üzvləri —Qafil, Rağib, Bixud, Salik, Səfa, Zövi, Zühurinin də Asini kamil bir şair kimi qəbul etdiklərini ikinci bir fakt kimi qələmə alır. Tədqiqatçı qeyd edir ki, onlar Füzulinin məşhur:

Təriqi —fəqr tutsam, təb tabe, nəfs ram olmaz-
Qina qılsam tələb, əsbabi-cəmiyyət təmam olmaz

mətləli qəzəlinə yazmış olduqları nəzirələrdən hansının daha məqbul olduğunu müəyyənləşdirmək üçün həmin şeirləri Asiyə göndərib «… ol qəzəllərin biri-birindən əla pabəst olmağın tərtibən imtiyaz edib, elam buyuralar ki, ta bu qəzəllərin hansı hansından əla olduğu məlum və müşəxxəs ola»[1]

---

[1] F.Köçərli. Azərbaycan ədəbiyyatı. II c. B. 1981, səh. 104.
[1] Yenə orada, səh. 105.

Həmin məktuba «Məclisi-xamuşan»ın bütün üzvləri münasibət bildirsələr də, onun birbaşa «səramədi-dövran və qibleyi-ürfan Abdulla bəy Asiyə» ünvanlanması, əlbəttə, böyük hadisə idi. Asi poeziyasının vurğunu olan Firidun bəy Köçərli bir sıra məqamlarda onu Nəvai, Zakir səviyyəsinə ucaldır və hətta bəzən onlardan da yüksək tuturdu: «...Cığatay lisanını (Asi-R.K.) bir dərəcədə öyrənmişdir ki, o dildə gözəl qəzəllər yazıbdır ki, onlardan bəzi Nəvainin kəlamına bərabər ola bilər»[1]. Yaxud: «Təbi-şeriyyəsinə gəldikdə, demək olar ki, cəddi-büzürgvarı Qasım bəy Zakirin təbinə bərabər onun təbi vardır və lakin Asinin təbi Zakirinkindən xeyli səri və yeyin idi»[2]. Bununla kifayətlənməyən F.Köçərli onu Füzuli səviyyəsinə ucaltmaqdan da çəkinməmişdir. O, Asinin Şirvan şairlərinə cavab olaraq elə həmin bəhr və qafiyədə yazdığı qəzəli qiymətləndirərkən yazırdı: «Abdulla bəyin bu kəlami-xoşməalı həm mənən və həm fəsaətcə cəmii-müasirinin əsərlərindən mümtaz olub, bəlkə Füzuli əleyhirrəhmənin qəzəlindən dəxi bir az artıq ola»[3]. Gətirilən nümunələrdən açıq-aşkar hiss olunur ki, F.Köçərli Asini bəzi məqamlarda özü də fərqinə varmadan olduğundan daha yüksək mərtəbəyə ucaltmağa çalışmışdır. Bu, bir həqiqətdir ki, nə Asi, nə müasirləri və nə də Füzulidən sonra yaşayıb-yaratmış «bir qəzəli yüzlərlə şairlər üçün ilham mənbəyi olan Füzuli» (Cəfər Cabbarlı) səviyyəsinə çatacaq ikinci bir sənətkar olmamış və yəqin ki, olmayacaqdır da. Təbii ki, Köçərlinin Asi haqqındakı fikri subyektiv xarakter daşıdığı üçün ümumi rəy kimi qəbul edilə bilməz. Lakin onun «şux və incə zövqlü bir cavan», «Şuşa şəhərinin əhli-zövq və ərbabi-şövqündən əvvəlinci hesab olunduğu», «öz əsrində kəlam əhlinin sərəfrazı, şerü qəzəl deməkdə üdəbalar mümtazı» olduğu da danılmazdır.

Qeyd etdiyimiz kimi, Asi haqqında ilk məlumatı «Təzkireyi-Nəvvab» və «Riyazül-aşiqin» əsərlərinin müəllifləri

---

[1] F.Köçərli. Azərbaycan ədəbiyyatı. II c. B. 1981, səh.105.
[2] Yenə orada. səh. 104.
[3] Yenə orada. səh.107

vermişlər. Onun şeirlərinin müəyyən bir qismini günümüzə qədər çatdıran da məhz bu mənbələr olmuşdur. Bunlarla yanaşı, Azərbaycan MEA Füzuli adına Əlyazmalar İnstitutunun arxivində B-3352/4977 və B-3348/22369 şifrləri altında saxlanılan cünglərdə Asinin, demək olar ki, bədii irsini təşkil edən şeirlərin əsas hissəsi toplanmışdır. Bunlardan orijinal hesab etdiyimiz B-3352/4977 şifrli əlyazmasında şairin azərbaycanca 42. farsca isə 39 şeiri günümüzə qədər gəlib çatmışdır. Araşdırmalar göstərir ki, bu əlyazması həcm etibarı ilə indikindən daha çox olmuş, onun bir neçə, təqribən 14-15 (bəlkə də daha çox) vərəqi itib-batmışdır. İndiki vəziyyətdə əlyazması 30 vərəqdən ibarətdir. Sonradan qoyulmuş səhifələrlə yanaşı, tərtib olunan zaman cüngdə qoyulmuş səhifələr də mövcuddur. Bu səhifələrə əsasən məlum olur ki, vərəq 1[a]-dan, 5[a]-ya kimi 3 vərəq (6 səh.); vərəq 15[a]-dan 16[a]-ya qədər 5 vərəq (10 səhifə), vərəq 17[a]-dan 18[a]-ya qədər 5 vərəq (10 səhifə) çatışmır. Cüngün əvvəldən və sondan naqisliyini də nəzərə alsaq, itmiş vərəqlərin daha çox olduğunu güman edə bilərik.

B-3348/2369 şifrli əlyazmada şairin farsca 10 qəzəli (bunlardan bir neçəsi natamamdır), 122 fərdi, azərbaycanca isə 7 şeiri verilmişdir.

B-236/10536 şifrli əlyazmada şairin farsca 4 qəzəli və 31 fərdi, azərbaycanca isə 5 qəzəli verilmişdir.

Mənbələrin verdiyi məlumata görə Asinin irsi həcm etibarı ilə bir o qədər də çox olmamışdır. Nəvvab onun irsinin 1400 beytdən[1], Köçərli isə 1500 əfraddan[2] ibarət olduğunu qeyd edirlər. AMEA Əlyazmalar İnstitutunda saxlanılan bir əlyazmada isə «onun 3000 sətrə yaxın şeiri olmuşdur[3]» qeydinə rast gəldik. Göründüyü kimi, bütün məlumatlar bir-birini tamamlayır və bu da fakt olaraq yuxarıda qeyd etdiklərimizi təsdiq edir. AMEA Əlyazmalar İnstitutunun arxivindəki iyirmiyə yaxın əlyazmada Asinin şeirlərindən nümunələr

[1] M.M.Nəvvab. Təzkireyi-Nəvvab. B. 1998 səh. 85
[2] F.Köçərli. Azərbaycan ədəbiyyatı. B. 1981, səh. 121.
[3] Əlyazmalar İnstitutu Fr. 811/7979.

verilmişdir. Bunların əksəriyyəti eyni adlı şeirlər olub, müxtəlif cünglərdə təkrarlanır[1]. Xatırladırıq ki, cünglərdə olan bu şeirlərin əksəriyyəti üzərində çox zaman düzəlişlər, əlavə və ixtisarlar aparılmış, nəticədə, orijinalla müqayisə zamanı bunlar təhrif kimi meydana çıxmışdır. Bu qəbil şeirlərdə tez-tez fikir təhrifinə, vəzn pozğunluğuna və sair nöqsanlara rast gəlmək olur. İstisnasız olaraq istər təzkirələrdə, istərsə də tədqiqat əsərlərində bu mənzərənin şahidi oluruq. Bunun əsas səbəbkarı isə savadsız mirzələr, səviyyəsi yetkin olmayan şeir həvəskarları, yaxud da özünə güvənən təzkirə müəllifləri olmuşlar.

Asinin şeirlərinin bir qismi də Firidun bəy Köçərlinin «Azərbaycan ədəbiyyatı» kitabında toplanmışdır. Burada toplanan şeirlərdə də orijinalla müqayisədə müəyyən fərqlər meydana çıxmışdır. Lakin təzkirə müəlliflərindən fərqli olaraq, Köçərlinin etdiyi düzəlişlər uğurlu olmuş, şeirin ümumi məzmunu və möndəricəsinə ciddi xələl gətirməmişdir.

Asinin ədəbi irsi ilə maraqlanan tədqiqatçılardan biri də Salman Mümtaz olmuşdur. AMEA Əİ Arx. 38, № F14 (316) şifrli əlyazmasında toplanmış materiallardan məlum olur ki, Asi yaradıcılığı Salman Mümtazın da diqqətini cəlb etmişdir. Buradakı materiallarda Asinin, demək olar ki, əsərlərinin əksəriyyəti toplanmış, özü haqqında isə son dərəcə qısa məlumat verilmişdir. Ümumilikdə S.Mümtaz tərəfindən toplanan materiallarda Asinin azərbaycanca 34 qəzəli, (bunlardan üçü cığatay ləhcəsində, biri isə nəzirədir), 1 təcnis, 1 təcribənd, 1 tərkibbənd, 1 natamam müəşşər və 1 müşairə, fars dilində 13 qəzəli verilmişdir. Toplanan materiallarla yanaşı, Salman Mümtaz Asinin şeirlərinin möndəricəsini də vermişdir. 9 səhifədən ibarət olan həmin möndəricədə Asinin farsca 79, türkcə 42 şeirinin siyahısı, daha dəqiq desək, qəzəllərin birinci misrası verilmişdir. Lakin möndəricədə göstərilən şeirlərin

[1] Bu haqda bax: AMEA-nın Əlyazmalar İnstitutu. B-1602, B-1761, B-114, A-642, B-5155, A-84, B-1980, B-2248, B-1643, B-132, B-5055, B-1969, B-208, B-1421.

yalnız bir qismi gəlib bizə çatmışdır. Hiss olunur ki, S.Mümtaz Asinin əsərlərini nəşr etdirmək üçün toplamış, lakin hansı səbəbdənsə bu işi axıra çatdıra bilməmişdir. Burada diqqəti cəlb edən maraqlı faktlardan biri ondan ibarətdir ki, tədqiq etdiyi əsərlərə həssaslıqla yanaşan tədqiqatçı Asinin iki şeirinə müdaxilə edərək oradakı kişi adını (Qara) qadın adları (Telli, Sona) ilə əvəz etmişdir. Sevgi, məhəbbət mövzusunda olan bu şeirlər üçün qadın adlarının daha münasib olduğunu nəzərə alsaq, S.Mümtazın haqlı olduğuna bəraət qazandıra bilərik. Digər şeirlər üzərində aparılan cüzi dəyişiklər istisna edilərsə, demək olar ki, S.Mümtaz müəllif hüququna ehtiramla yanaşaraq digər yazarlardan fərqli olaraq, onun əsərlərini orijinalda olduğu kimi saxlamışdır.

Şairin yaradıcılığına dərin məhəbbət bəsləyən Müctəhidzadə, «Riyazül-aşiqin» əsərində bəhs etdiyi 79 şairin içərisində ən çox yer verdiyi sənətkar da Asi olmuşdur. O, burada Asinin azərbaycanca on dörd qəzəlini, iki müxəmməs, iki bəhri-təvilini, bir növhəsini, Şirvan şairi Bixudun Asiyə mənzum məktubunu və Asinin ona cavabını, Asinin şərabdan tövbə etməsi münasibətilə Şirvan şairlərinin ona təşəkkür məktubunu, farsca beş qəzəlini vermişdir. Müctəhidzadə Asi şeirlərinə ehtiramla yanaşmış, bəzi cüzi dəyişikliklər nəzərə alınmazsa, demək olar ki, onları orijinalda olduğu kimi vermişdir. Onun 1995-ci ildə kiril əlifbası ilə nəşr olunmuş «Riyazül-aşiqin» əsərindəki şeirləri ilə orijinal hesab etdiyimiz B-3352/4977 və B-3348/22369 şifrli əlyazmalardakı şeirləri müqayisə etdikdə bir sıra fərqlər meydana çıxmışdır. Xatırladırıq ki, bu fərqlərin bəziləri texniki xarakter daşıyır və onların transfoneliterasiya zamanı meydana çıxması ehtimalı da böyükdür.

«Baxar» rədifli qəzəlin «Arizdə gözüm ol zülfi-səmənsayə baxar» misrasında («Riyazül-aşiqin», səh.167) «ariz» sözü orijinalda «arizində» kimi verilmişdir ki, vəzn baxımından bu daha düzgündür. Eləcə də həmin qəzəlin altıncı missrası: «Mubəmu gəzdi, ziya tapmadı könlümdən əsər» misrası, orijinalda «Mubəmu şanə gəzib tapmadı könlümdən əsər» (B-3352/4977 vər. $1^b$ ) kimi verilmişdir. Göründüyü kimi, təz-

kirədə verilən misrada anlaşılmazlıq var və aparılmış «düzəliş» yerinə düşməmişdir. Həmin qəzəlin təzkirə variantının məqtə beytindəki «məni-rüsvayə baxar» ifadəsi orijinalda «səni-rüsvayə baxar» kimi verilmişdir ki, bu daha düzgündür. «Zülf» rədifli qəzəlin (səh.168) yeddinci —«Mərdümlük eyləyir yenə fil-cümlə gözlərin» misrası orijinalda «Mərdümün eyləyir günah filcümlə, gözlərin» kimi; «Könlümün» rədifli qəzəlin doqquzuncu- «Kuyində, Asiya, bu qədər nalə eylərəm» misrası (səh. 169) orijinalda —«Asi bu qədər kim Əşgində sızıldar» kimi verilmişdir. «Zülfündən» rədifli qəzəlin beşinci —«Nedim, yox çarə, dövri-kəcruyin sərbəsər tutmuş» misrasındakı «dövri-kəcruy» (əyri üzün dövrəsi) ifadəsi yerinə düşmür və məna çaları yoxdur. Orijinalda isə bu misra «Nedim, yox çarə dövri-künci-ruyin sərbəsər tutmuş» kimi verilmişdir ki, bu daha düzgündür. Çünki burada verilmiş «dövri-künci-ruyin» (üzünün küncünün ətrafını) birləşməsi məna tutumuna görə misranı tamalayır.

Təzkirədə verilmiş «Bir Mahmud namın tərifində» adlı müxəmməsin birinci bəndində orijinalda olan üçüncü misra: «Cümlə fitnə baxışı —icaddı Mahmud» - misrası çatışmır. Eləcə də «Mahmud» rədifli doqquz bənddən ibarət ikinci müxəmməsdə də bəzi uyğunsuzluqlar var. Belə ki, müxəmməsin I bəndində birinci dörd misra 13 hecadan, V misra isə 12 hecadan ibarətdir. Heca çatışmamazlığı digər bəndlərin də misrasında mövcuddur və şeirin ümumi ahəngində də bu qüsur hiss olunur. Orijinalda isə bu qüsur rədif qafiyədə olan sözə «i» səsi artırmaqla aradan götürülmüşdür. Bunu nəzərə alaraq şeiri orijinaldakı kimi saxladıq.

«Bəhri-təvil»lərdə də bəzi fərqlər var. Ey «Zülməti-zülf içrə üzü mehri-münəvvər» misrası ilə başlayan bəhri-təvilin təzkirə variantındakı «Gülbən qurubən dar üzünü asdı müəlləq» misrası orijinalda «onu asdı» kimi, «Tifltək pu edər ahunu görəndə» misrasındakı «pu edər» ifadəsi orijinalda «vəpu edər» kimi, «Bir et məni xürsənd, vey buseyi-pünhan» missrasındakı «vey» sözü orijinalda «ver» kimi verilmişdir ki, orijinal variantının daha üstün olduğu açıq-aşkar görünür. Eləcə

də «Saqiya, ey biti-zərrin kəmərü sərvi-səmənbər» mətləli ikinci bəhri-təvilin təzkirə variantında «nə rəva möhnəti-gərdun edə mən bikəsi dilxun» misrası ilə «nola gər yar ola bəxtim» misraları arasında orijinalda olan «Günbəgün qallam avarəvü məhzun, ola qəm əfzun» misrası; «Ərzimə guş eylə bənim ey sənəmi-məhvəsim» misrası ilə «muyi-siyahi-həbə-şim» misraları arasındakı orijinalda olan «Arizi ali günəşim, ləli ləbi- badəcəşim» misrası verilməmişdir. Həmçinin «zülfi-dirazi-siyəhim» yanlış olaraq təzkirədə «zülfi-dirazi-səhim» kimi, «xəncəri-bürranım» isə «xəncəri-bürrağım» kimi verilmişdir.

Təzkirədə verilmiş farsca şeirlərdə də bəzi uyğunsuzluqlar var. «Məgər ke dide moəzzen xorame-an qədo qamət» misrası ilə başlayan qəzəl orijinalda yeddi beyt, təzkirədə isə altı beyt həcmində verilmişdir. Təzkirə variantında «Be rah-e eşğ nəbayəd nəhəd pay to qol; Bər an kəsi ke, be pərhizəd əz zəban məlamət» beyti çatışmır. «Baz çəmən gəşt əz nəmove şəqayeq» misrası ilə başlayan qəzəlin IV beytinin I misrası təzkirədə «Moysem-e eyş əsto nuşe-saqiye-qolrox» kimi verilmişdir. Buradakı «nuşe-saqiye-qolrox» birləşməsi heç bir məna vermir. Əgər misranı tərcümə etsək «Eyş mövsümüdür və gül üzlü saqini içmək» kimi uğursuz bir tərcümə alınar. Orijinalda isə bu misra «Movsem-e eyş əst-o nuş, ey saqiye-qolrox» (Eysü nuş mövsümüdür, ey gül üzlü saqi,) kimi verilmişdir ki, bu da növbəti misra ilə uzlaşır.

«Təzkireyi-Nəvvab»da da farsca verilmiş şeirlərdə müəyyən fərqlər var. Orijinalda on bir beytdən ibarət olan «Çu zolfət bər rox əfşan afəridənd» misrası ilə başlayan qəzəl «Təzkireyi-Nəvvab»da 9 beyt, eləcə də orijinalda 9 beytdən ibarət olan «Ey zolf, nist piço xəmətra nəhayəti» misrası ilə başlayan qəzəl təzkirədə 5 beyt həcmində ixtisarla verilmiş, qəzəlin I misrasında Nəvvab tərəfindən dəyişiklik də edilmişdir. Orijinalda həmin misranın tərcüməsi belədir: «Ey zülf, sənin qıvrımlarının sonu yoxdur (nəhayətsizdir)». Təzkirə variantında isə «sonu» (nəhayət) sözü «misli» sözü ilə əvəz edilmişdir ki, bu da beytin növbəti «Qıvrım olsan da, qiyamə-

tədək uzunsan» misrası ilə uzlaşmır. Şairin məqsədi qıvrım olduğuna baxmayaraq, saçların qiyamətə, sonsuzluğa (nəhayətsizliyə) qədər uzanıb getməsini təsvir etmək olduğu üçün «nəhayətsiz» sözü «misli» sözü ilə əvəz edildiyinə görə onun mənası itmiş, beytin məzmununda naqislik yaranmışdır.

«Edər sehr ilə daim bu xəta kanı qara gözlər» misrası ilə başlayan qəzəlin məqtə beytindəki «yekdilliklə» sözü Köçərli və Nəvvabın əsərində «yektalıqla» kimi verilmişdir. «Zahida, guşeyi-məsciddə nəyim var mənim?» misrası ilə başlayan qəzəl «Təzkireyi-Nəvvab»da 6 beyt, Köçərlinin əsərində isə 5 beyt həcmində; orijinalda 8 beytdən ibarət olan «Nəsibim gərçi eşqində bəladır» misrası ilə başlayan qəzəl «Təzkireyi-Nəvvab» və «Azərbaycan ədəbiyyatı» kitabında 7 beyt həcmində verilmişdir. Hər iki əsərdə:

Əcəb qafildi lə’linin şərbətindən
İsgəndəri-təşneyi-abi-bəqadır[1]

beyti çatışmır. «Rəhm qıl, dəymə, səba, zülfi-kəci-dildarə» misrası ilə başlayan qəzəlin «Riyazül-aşiqin» variantında, «Səbağə itsam əhvalımnı şərh, imdad qılğaymu?» misrası ilə başlayan qəzəlin «Təzkireyi-Nəvvab» və «Azərbaycan ədəbiyyatı»ndakı variantlarında da müəyyən fərqlər mövcuddur. Təzkirədə II beytin I misrasındakı «virlən» sözü orijinalda «viranə», Köçərlinin əsərində «viran» kimi, orijinalın III beytin I misrasında olan «birlə us ol» ifadəsi təzkirədə «pirlə uşol», Köçərlinin əsərində isə «birlə ol şol» kimi verilmişdir ki, hər iki halda orijinal variantı düzdür. Təzkirə variantında II beytin II misrasında verilmiş «sipəhi-dərdi-qəmin» birləşməsi Köçərlinin əsərində «sipahi-dərdü qəmin», orijinalda «Şəhri-dərdü qəmin» kimi verilmişdir. Bu halda Köçərli variantı daha məqbul hesab olunur.

Bu, bir həqiqətdir ki, istər təzkirə müəllifləri, istərsə də tədqiqatçı alimlər tərəfindən aparılan düzəlişlərin əksəriyyəti xoş məramla edilmişdir. Onlar şeiri daha səlis, mənalı, məzmunlu etmək üçün bu addımı atmışlar. Ancaq bunu da unut-

---

[1] AMEA Əlyazmalar İnstitutu, cüng, B-236, vər. 71[b]

maq olmaz ki, müasir mətnşünaslıq tələbləri baxımından hər hansı bir klassik şairin sənətinə və şəxsiyyətinə ehtiramla yanaşılmalı və onlar üzərində heç bir düzəliş aparılmamalıdır.

Öndə qeyd etdiyimiz kimi, Asinin bədii irsi həcm etibarilə o qədər də çox olmamışdır. Əfsuslar olsun ki, az hesab etdiyimiz bu irsin özü də göstərilən həcmdə günümüzə qədər gəlib çatmamışdır. Bu gün əlimizdə olan seir nümunələri bizi tam şəkildə qane etməsə də Asi sənətkarlığı, onun XIX əsr poeziya aləmindəki mövqeyi haqqında müəyyən fikir söyləməyə imkan verir. Bu nümunələrdə Asi böyüklüyü, onun istedadı, yüksək zəka sahibi olması aydın şəkildə görünür.

Məlum olduğu kimi XIX əsr ədəbiyyatı özünün bir sıra xüsusiyyətlərinə görə digər dövrlərdən köklü şəkildə fərqlənir. Bu dövr ədəbiyyatı həm şifahi, həm də yazılı surətdə yaranır, yeni mövzu, ideya və bəddi sənətkarlıq keyfiyyətləri ilə zənginləşir, şairlər insanın mənəvi dünyasının daxili alıminin təsvir və tərənnümünə üstüklük verir, cəmiyyət üçün son dərəcə vacib olan məsələləri ədəbiyyata gətrir, insanlarda mənəvi saflıq, humanizm, zəhmətə və zəhmət adamına hörmət, eybəcərliyə nifrət, sosial ədalətsizliyə etiraz hissləri aşılamağa çalışırlar. Onlar klassik ənənəyə söykənərək zaman və mühitin tələblərinə cavab verə biləcək yeni ruhlu sənət əsərləri yaratmaqla ədəbiyyatımızın inkişafına öz dəyərli töhfələrini bəxş edirdilər. Əlbəttə, bunu bir neçə şair istisna olmaqla XIX əsrdə yaşayıb-yaratmış bütün şairlərə şamil etmək heç də düzgün olmazdı. Çünki bu şairlərin əksəriyyəti yuxarıda qeyd etdiklərimizi yaradıcılıqları üçün əsas mövzu olaraq seçməmiş, şəxsi həyatlarında baş verən hadisələrlə əlaqədar olaraq bu və ya digər dərəcədə həmin mövzulara toxunmaqla kifayətlənmişlər. Təbii ki, orta əsrlərdə olduğu kimi, XIX əsr ədəbiyyatımızda da başlıca yeri poeziya və onun aparıcı qolu olan qəzəl janrı tuturdu. Heca vəzni ədəbi aləmə vəsiqə alsa da, hələlik ədəbi məclislərdə tam şəkildə zəngin ənənəyə söykənən qəzəl janrı səviyyəsiə ucala bilməmişdi. Ona görə də şairlərin əksəriyyəti

qəzəl janrına üstünlük verib yuxarıda qeyd etdiyimiz yenilikləri məhz şeirin bu növündə ifadə etməyə çalışmışlar. Nəticədə qəzəlin quruluş və formasında heç bir dəyişiklik etməsələr də onun məzmununa yeni mütərəqqi ideya gətirə bilmişlər. Başda Qasım bəy Zakir olmaqla əksər Qarabağ şairləri də bu janrda yeni mövzuda şeirlər yazırdılar. Düzdür, onlar klassik poeziyanın əsas mövzusu olan gül, bülbül, ləl dodaq, lalə yanaq, qönçə dəhən  və sairədən də bol-bol istifadə edirdilər. Lakin bunlarla yanaşı gözələ, məşuqəyə, şəraba münasibətdə realist mövqedə dayanıb onları müəcərrəd romantik aləmdən təcrid edərək real zəmində oxuculara təqdim edirdilər. Belə şairlərdən biri də Abdulla bəy Asi idi. Onun adı bütün mənbələrdə ehtiramla yad edilir və qüdrətli şair olduğu təkrar-təkrar qeyd olunur. Böyük Füzulinin istedadlı davamçısı olan Asi sözün həqiqi mənasında əsil məhəbbət şairi idi. Onun şeirinin mayası bəşəriyyətin ən incə və zərif məxluqu olan qadınlara məhəbbətdən yoğrulmuşdur. Tarixin bütün dönəmlərində qadın və onun gözəlliyinin vəsfi şeirin, xüsusilə də qəzəlin əsas mövzusu olaraq qalmışdır. Bu mövzuda milyonlarla şairlər saysız-hesabsız qəzəllər, məhəbbət şeirləri yazmış, həmin şeirlərə obyekt seçdikləri gözəlin gülüşünü, yerişini, duruşunu, nazını, qəmzəsini, cövrünü, cəfasını, zahiri və xarici aləmlərini, bir sözlə, gözə görünən, xoşa gələn nə varsa hamısını dönə-dönə vəsf etmiş və biz deyərdik ki, hamısı da eyni mövzunu təkrar-təkrar işləmişlər. Təəccüblü burasıdır ki, biz oxucular bu təkrarları görə-görə, duya-duya ona pis baxmamış, əksinə, onların hər birində zövqümüzə, ruhumuza uyğun nəsə taparaq hamısını məqbul hesab etmişik. Məsələyə bu prizmadan yanaşdıqda bizim bu şeirlərin əksəriyyətini nəzirə, təqlid hesab etməyə tam ixtiyarımız var. Lakin bu fikir yanlış olardı. Çünki hər bir şeir, xüsusilə də məhəbbət mövzusunda yazılmış şeir, sevən bir insanın, indiki halda şairin fərdi və intim hisslərinin məhsulu olmaqla yalnız ona məxsusdur. Bu şeirlər eyni mövzuya həsr olunsa da, onların hər birinin özünə

məxsus gözəlliyi, doğmalığı və orijinallığı var. Onların mövzuya fərdi yanaşma üsulundan asılı olmayaraq təsvir olunan obyekt-əksər hallarda qadın, bütün məqamlarda hər bir şairin öz dünyagörüşü, bacarıq səviyyəsi, istedadı hüdudunda bədii təsvir və ifadə vasitələri ilə bəzədilmiş şəkildə oxuculara təqdim olunmuşdur. Təbii ki, bütün zamanlarda qəzəl janrının aparıcı mövzusu olan qadın və onun gözəlliyi mövzusu, XIX əsrdə də öz aktuallığını itirməmiş, "cəmiyyəti gözəlləşdirən bu ali məxluq" lirik şeirin baş qəhrəmanı olaraq qalmışdır. "O yerdə ki, gözəllikdən söhbət gedir, orada mütləq sənətkarı vəcdə gətirən, onun ilhamına qol-qanad verən, həyat və yaşayışını şirinləşdirən incə zövqlü qadın olmalıdır"[1].

Peyğəmbərcəsinə deyilmiş bu kəlamın təsdiqinə ehtiyac yoxdur. Ədəbiyyatımızın görkəmli tədqiqatçısı K.Məmmədov sanki Asinin əsərlərini oxuduqdan sonra bu qənaətə gəlmişdir. İstisnasız olaraq Asinin əksər şeirlərində yer üzünün əşrəfi olan insan, məxluqatın ən zərifi olan qadın bütün gözəlliklərin fövqündə dayanan ən ali qüdrət kimi təsvir edilmişdir:

Yetirsə bağibani-sün əgər nun nəxli-tubatək,
İnanmam, rast söz, rəna ola ol sərvi-balatək.

Görüb ləli-rəvanbəxşin hədisi-möcüzün guya,
Əyaq çəkmiş cahandan çeşmeyi-heyvan Məsihatək.

Qəddinin fikri iki gözdən edib xunabi-qəm cari,
Şikaf etmiş bu dəryanı əsa hökmilə Musatək.

Allahın yaratdığı ən gözəl və müqəddəs nə varsa —istər əfsanəvi tuba ağacı, istərsə də dirilik suyu nə boy-buxunda və nə də insana həyat bəxş etməkdə şairin sevgilisinə çata bilməz. Hətta Adəm peyğəmbər onun qəddinə bərabər bir sərv tapmaq üçün gedib cənnətdə tuba ağacına baxar:

Adəm istərdi tapa qəddinə həmta bir sərv
Ol səbəbdən gedib rövzədə tubayə baxar.

---

[1] Kamran Məmmədov XIX əsr Azərbaycan şeirində satira. B.1975, səh.250.

Lakin şair onunla razılaşmır:

Kimdi tuba eyləsin qəddi-movzun ilə bəhs,
Ya nədir xurşid edə rüxsari-gülgün ilə bəhs.

Çünki onun yarı elə bir gözəldir ki, seyrə çıxanda şümşadı, nərgizi və gözəllik rəmzi olan nə varsa, hamısını heyrətdə qoyur:

Edib sərvi-rəvanım bağarı bərpa qiyamətlər,
Çəkib qamət, verib şümşadü sərvə yüz xəcalətlər.

Qalıb bir küncdə xofilə durmuş nərgizi-şəhla,
Ki nuri-vahidi dərk eyləməz hər bibəsərlər.

Urub hüsni-rüxindən dəm, məhi-kənan düşüb caha,
Budur əcri edə sultanına hər qul xəyanətlər.

Şairin yarı qənirsiz gözəldir. Onu sevməmək mümkün deyil. Onu görən hər bir kəs hətta ən qatı din adamı da tərəddüd etmədən bu gözəllik qarşısında dinindən, imanından, varlığından belə keçməyə hazırdır.

Şair sevgisini vəsf edərkən ondan heç nə əsirgəməmiş, onu zəngin romantik boyalarla təsvir etməyə, onu ilahi gözəllər səviyyəsinə ucaltmağa çalışmışdır. O, seçdiyi gözəli bu məqama çatdırdıqdan sonra onu görəndə zahidlərin dinindən dönməsinə, onların əqlini itirərək rində çevrilməsinə bəraət qazandırmağa çalışır və sanki bununla şair demək istəyir ki, gözəllik qarşısında tab gətirə biləcək heç bir qüvvə yoxdur, bəşər övladı vəzifəsindən, mövqeyindən asılı olmayaraq bu qüdrət qarşısında acizdir. Çünki «Məhəbbət elə bir qüvvədir ki, insanı öz şəxsi mənfəətlərindən əl çəkməyə, ümumi mənfəət üçün varlığından keçməyə vadar edir».[1]

Məgər ke dide moəzzən xoram-e an ğədd-o ğamət,
Ke verd-e u ğədd-o ğamət sənast ta be ğeyamət.
(Azançı o qəddi-qamətin nazını görsə,
Qiyamətə qədər o qəddü-qamətin söhbətini edər.)

---

[1] H.Araslı. Böyük Azərbaycan şairi Füzuli. B., 1958, s. 123.

Didəmət ruy bedanestəm bəhr-e çe Xəlil
Ali-emrani qoft məh-i taban ra.
(Sənin üzünü gördüm, bildim ki, Xəlil nə üçün
Ali-imranə məhi-taban dedi.)

Oxucu şübhə etmir ki, şairi ilhama gətirən bu gözəl, onun həyatda, məişətdə gördüyü, valeh olduğu incə belli, zərif telli, nazlı-qəmzəli real gözəldir. Şair bu gözəli təsvir etməklə yanaşı, eyni zamanda, ona olan səmimi hisslərini də etiraf etməkdən çəkinmir. Bu etirafda gizli bir təmənna da var. O da şairin sevgilisindən dərdinə çarə istəməsi, vəslinə şərait yaratmasından ibarətdir. Bu istək və arzu ilə o, sevgisini göylərə qaldırır, onu bütün yaradılmışların zirvəsinə ucaldaraq həyat və təbiət gözəlliklərinin tacına bərabər tutur. Və bu yolda onun üçün yarından müqəddəs, qüdrətli heç nə, heç bir qüvvə yoxdur. Ona görə də yarının qaşları onun mehrabı, onun yaşadığı yer isə Kəbəsidir və bunu görən hər bir kəs dinin ən müqəddəs məbədi olan Kəbədən də üz çevirər.

Tiği-kəc ilə döndərəsən taği-əbruyuna,
Mehrabə səcdə eyləyəni iştibahilə.

Əvvəllər mehrabın hörməti bu qədər deyildi,
Sənin qaşlarının tağı ilə indi belə möhtərəmdi.

Belə bir gözəlin vəslinə yetmək də olduqca müşkül bir məsələdir. Çünki o öz gözəlliyinin qədərini bilən, nələrə qadir olduğunu yaxşı dərk edən, naz-qəmzəli bir gözəldir. Lakin sədaqətli aşiq yarının acısı da şirin olan bu əzabına dözür və vüsal ümidi ilə yaşayır. Bu ümid ona ruh verir, onu yeni arzularla yaşamağa, sevgi dolu romantik bir həyata səsləyir. Şair bundan təsəlli tapıb yarının vəslinə qovuşmaq ümidi ilə hicranın ağır yükünü çiyinlərində daşımağı özünə şərəf bilir:

Asi xəyal edir ki, yetə xaki-payina
Qürbi-qəda məhaldır hərçənd şahilən.

Asi, ömrünü sərf eylə rəhi-eşqində
Bu ümid ilə ki, bir gün məni-rüsvayə baxar.

Asiyə görə, əsl sevən aşiq üçün ən böyük nemət ecazkar qüdrətə malik olan məhəbbətdir. Hqiqi aşiq ona layiq olmaq üçün bütün əzablara dözməli, sədaqət göstərməyi bacarmalıdır. Onun məhəbbəti ötəri hisslərdən, şəhvani meyllərdən doğan duyğular deyildir. Bu Allahın ona bəxş etdiyi, onun həyatını, ömrünün mənalandıran, ona yüksək həyat zövqü aşılayan əvəzsiz bir nemətdir. Şair bu neməti şükranlıqla qəbul edib, özünü dünyanın ən varlı və xoşbəxt bəndəsi sayır. Hətta Şərqdə saysız-hesabsız var-dövlət sahibi olan Qarunla müqayisədə özünü ondan da zəngin hesab edir:

Çün ruyi-zərdimdə gülgün əskidir simü zərim
Kəsrəti-dövlətdə, Asi, eylə Qarun ilə bəhs.

Eləcə də o, məhəbbətinin pak və ülvi olduğunu sübut etmək üçün sevgilisinin üzünü Qurana, onun üzünün nurunu isə Quranın təfsirinə bənzədir.

Sənin ey hurliqa, nuri-rüxündür təfsir,
Nə qədər ayəyi-rəhmət yazılıb Qoranə.

İlk baxışda oxucuda romantik aşiq təsəvvürü yaradan şair, əslində həyata açıq gözlə baxan, realist bir insandır. O, zahidin yalançı vədlərinə, əfsanəvi huri və behiştə inanmır. Buna görə də özü özünü xəbərdar edir ki, vəd olunmuş nisyə kövsərə aldanıb əlində olan nəqdi cami-meyi vermə.

Eyləmə tərk eşqini huri-behiştə aldanıb,
Zahidə baxma, Asiya, ol büti-bibədilə bax.

Kövsəri vədə edirsən mənə gərçi nisyə
Nəqd dəstimdə bu gün cami-meyim var mənim.

Bu reallıqla yanaşı bəzən Asi yaradıcılığında təsəvvüf izlərinə də rast gəlirik. Qeyd etmək lazımdır ki, XIX əsr də daxil olmaqla tarixin bütün mərhələlərində milli klassik ədəbiyyatımızın istisnasız olaraq bütün nümayəndələri bu və ya digər dərəcədə təsəvvüfə meyl etmiş, onun dövrü üçün məq-

bul hesab olunan konsepsiyasından bu və ya digər dərəcədə bəhrələnmişlər

Sufizmin əsas qanunlarını əldə rəhbər tutan mütərəqqi ruhlu təsəvvüf ideoloqları insanlara anlatmağa çalışırdılar ki, hər bir bəşər övladı məqsədinə nail olmaq üçün güclü iradə nümayiş etdirməklə yanaşı, özünü dərk etmək qabiliyyətinə malik olmalıdır. Bununla onlar sübut etmək istəyirdilər ki, insanın xilas olması yolu yalnız onun öz içindən başlayır və öz içində də qurtarır. Burada heç bir kəsin müdaxilə və köməyinə ehtiyac yoxdur. Bu qəbil mütərəqqi ideyalar bütün zamanlarda fəlsəfi düşüncəli alim və şairlərin diqqətini cəlb emişdir. Hətta heç bir təriqətə mənsub olmayan və ədəbiyyatımız tarixində «qəlb şairi» kimi tanınan böyük Füzuli də bu məramla təsəvvüfə biganə qalmamış, «zəngin ifran və başqa mədəniyyət qaynaqlarından faydalanaraq buradan aldığı məzmunları zahiri və donuq şəkildə deyil, öz bədii zövqünə və şair təxəyyülünə uyğun incələnmiş, onları əsatir, inanc və xalq düşüncə tərzindən gələn məzmun çalarları ilə gözəlləşdirmiş, ...eşq çeşməsi ilə saflaşdırmış, ən başlıcası isə türk sözünün bədii sehri... ilə cilalanmış, billurlaşdırmış və doğmalaşdırmışdır» (N.Göyüşov). Eləcə də, Füzulidən sonra gələn digər şairlər, o cümlədən, XIX əsr şairləri də təsəvvüfə bu aspektdə yanaşaraq onun dini fəlsəfi problemlərinə toxunmamış, geniş təbliğinə də cəhd göstərməmişlər. Bu mənada onların yaradıcılığında rast gəldiyimiz təsəvvüf ruhlu şeirləri klassik ədəbi ənənədən gələn ədəbi fənd kimi qəbul etmək, fikrimizcə, daha düzgün olardı.

Təbii ki, XIX əsr ədəbi mühitinin fəal üzvü olan Abdulla bəy Asi də digər müasirləri kimi mövcud ənənəyə biganə qala bilməzdi. Bunun nəticəsidir ki, o da çox az miqdar şeirlərində cüzi də olsa bu məsələyə toxunaraq təsəvvüfə münasibət bildirmişdir.

Asiya, gər zərre-yi xurşid-i ru-yi düsti,
Bəs çera həmvare əz çeşmət bovəd əndər hecab.

(Ey Asi, əgər sən dostun üzünün günəşinin bir zərrəsisənsə,
Bəs nə üçün həmişə o sənin gözlərindən hicabdadır.)

Könül, piri-muğanın feyzi gər olsa şamil,
Meyi-vəhdət əyağın al ələ, bu mey həram olmaz.

Məlum olduğu kimi, Asi üçün heç bir müşkül şeir forması mövcud deyildi. O, şifahi xalq ədəbiyyatından gələn janrlara yaxından bələd olduğu kimi, rənqarənq klassik şeir şəkillərindən də məharətlə istifadə edə bilirdi. Dediklərimizi şairin müxtəlif bəhr və janrlarda yazdığı şeirlər əyani şəkildə sübut edir. Belə bir istedadlı şairin heca vəznində az şeir yazması və onun ən geniş yayılmış forması olan qoşma janrında bir dənə də olsa şeir nümunəsinin olmaması özlüyündə sual doğurmaya bilməz. Lakin şeirlər hansı səbəbdənsə it-bata düşmüş, gəlib əsl sahibinə-biz oxuculara çata bilməmişdi. Əlimizdə bu fikri təsdiq edən tutarlı faktlar çoxdur. Onlardan başlıcası şairin günümüzə qədər gəlib çatmış heca vəznində yazdığı üç təcnisdir. Məlumdur ki, təcnis lirik janrın ən çətin formalarından biridir. Təcnisdə qafiyələr cinas sözlər üzərində qurulur və bu sözlərin müxtəlif məna daşıması əsas şərt kimi qəbul olunur. “İlk nəzərdə formal cəhət kimi görünən bu şərt sənətkardan-aşıqdan böyük ustalıq, məharət, dilinin müxtəlif çalarlığından, söz əlvanlığından, məna zənginliyindən istifadə bacarığı tələb edir”.[1]

Təbii ki, şeir sənəti ilə məşğul olan şairlərin əksəriyyəti təcnis üçün qoyulan tələblərin nə qədər çətin, ciddi və məsuliyyətli olduğunu anladıqları üçün şeirin bu növünə az maraq göstərmiş, qələmlərini bu sahədə sınaqdan keçirməyə ehtiyat etmişlər. Hətta, məşhur aşıqların hamısı təcnis yaza bilməmişlər. “Ona görə ki, təcnis yaradıcı istedad, dilin inkişaf qanunauyğunluqlarını müəkəmməl bilmək, janrın tələblərini hərtərəfli qorumaq bacarığı tələb edir. Bu janr çətin bədii üsullarla, dil zənginliyi və məcazlar bolluğu, hər bənddə

---

[1] Ş.Mikayılov. Ədəbiyyat nəzəriyyəsi (IX-X siniflər üçün dərs vəsaiti). B.2000, səh.35.

formaca yeni, məzmunca müxtəlif cinas, qafiyə və rədiflərlə yaranır".[1]

Bu cəhətləri özündə ehtiva edən Asi hətta, ən istedadlı aşığın qibtə edəcəyi səviyyədə yüksək şeir nümunəsi yarada bilmişdir. Sözün həqiqi mənasında bu şeirlərin hər biri mükəmməl sənət əsəridir. Nümunə üçün "Göz ala" rədifli şeirə nəzər salaq. Burada şairin dilin rəngarəng çalarlarından, zəngin söz əlvanlığından məharətlə istifadə edərək gözəl şeir nümunəsi yaratdığının şahidi oluruq:

Qorxum budur imanımı əlimdən,
Süzgün baxmaq ilə gülən göz ala.
Sənansifət döndəribən elindən,
Zünnari-zülfilə sala gözala.

Məhəbbət tapılmaz dilə xalından,
Dil mürğünə daim verir xalından.
Ey gül, sənin zülfü xəttü xalından,
Yüzüm bir dəm istəməyir göz ala.

Ey dil, girmə bəhri-hicrə dərindi,
Nihali-vəsildən səmər dər indi.
Gör necə düzülüb yüzə, dər indi,
Çün alır aşiqdən xumar göz ala.

Zülfi-siyah hüsni-yar aşiqidi,
Hər kəs onu sevməz, yar aşiqidi.
Bir ahu baxışlı yar aşiqidi,
Könül, mail olmuyasan gözala.

Ruxi-alə düşüb zülfi-asiya,
Zinət nə lazımdır, xoşdur asiya.
Vəhşi könül qəzalini, Asiya,
Mahir səyyad imiş, götdü göz ala.

---

[1] A.Hacıyev. Ədəbiyyatşünaslığın əsasları. B.1999, səh.285.

Şeirdəki təcnis yükünü daşıyan “göz ala” ifadəsi birinci bəndin ikinci misrasında “göz” mənasında, dördüncü misrada “işə, hadisəyə sala, aldada” mənasında, səkkizinci misrada “gözünü çəkməmək”, on ikinci misrada “ala gözün xumarlanması”, on altıncı misrada “ahu, qəzal” mənasında və nəhayət, iyirminci misrada “aldatdı, sehrlədi, ovladı” mənasında işlənmişdi. Bütün hallarda şair şeirin zahiri gözəlliyi ilə məzmun gözəlliyini də qoruyub saxlaya bilmişdi. Şeiri nəsrə çevirdikdə bu vəhdət daha aydın şəkildə görünür:

Birinci bənddə şairin qorxusu ondandır ki, yarının gülən gözləri süzgün baxışlarıyla onun imanını əlindən alsın və Sənan kimi elindən döndərib zünnar saçlarıyla onu hiyləyə salıb, aldatsın. Ikinci bənddə yarın xalından onun ürəyinə qarşı məhəbbət yoxdur. Ancaq ürək quşuna daim öz xalından (dən verir ki, onu tələyə salsın). Lakin buna baxmayaraq onun zülfündən, xəttü xalından bir dəm gözünü çəkmək istəmədiyini söyləyir. Üçüncü bənddə şair ürəyinə müraciət edərək ona hicran dəryasına girməməyi tapşırır. Çünki bu dərya çox dərindi. Ona vəsl ağacından indi səmər götürməyi tövsiyə edir: “Görürsənmi onun üzündə tər indi necə düzülüb? sualına özü də cavab verir: Ona görə ki, ala göz aşiqdən xumar alır”. Dördüncü bənddə qara zülf yar hüsnünə aşiq olduğu üçün yara aşiq olan hər kəs onu sevməz. Bir ahu baxışlı yara aşiq olduğu üçün şair könlünə müraciət edir ki, başqasına meyl etməsin; Və nəhayət, beşinci –sonuncu bənddə şair sanki sevdiyi, məftun olduğu gözəllə üzbəüz dayaıb onu təsvir edir. Onun qara zülfləri al yanaqlarına düşmüşdü. Bu gözəlliyə artıq zinət vurmaq olmaz. Ona görə ki, aşiqə belə sadə gözəllik xoşdur. Məhz onun sevgilisi bu gözəlliklə onun vəhşi könül ahusunu mahir ovçu kimi sehrləyib ovlamışdı.

Asinin qeyd etdiyimiz heca vəznində yazdığı üç təcnisindən başqa onun daha iki cinas qafiyəli qəzəli də vardır. Həmişə yenilik axtarışlarında olan Asi sırf milli şeirimizə məxsus olan xüsusiyyətləri böyük məharətlə əruz vəznində yazdığı

qəzələ də tətbiq edərək son dərəcə uğurlu şeir nümunəsi yarada bilmişdir:

Ta düşdü gözüm sən kimi yekta bütə, Telli*,
Az qaldı ki. səbrim tükənib ta bitə, Telli.
Can çıxdı qəmindən, vəli candan qəmi-eşqin,
Çıxmaz təni-zarım çıxa gər tabitə, Telli.

Zülfi-siyəhin saldı dili-zarı əyağə,
Yüz vermə ona payə salıb ta bitə, Telli.
Ərər nəçidir sərvi-qədin tək ola azad,
Gül kimdi, gül arizinə ta bitə, Telli.

Hicran qəmini çəkməsə, dil vəslə yetərmi,
Xalis olumu görməsə zər ta butə Telli.

Lazımdı müjən suzən ola, riştə siyah zülf,
Kim edə rüfu zəxmi-dirun ta bitə, Telli.

Asi nə rəva vəsli-rüxundan ola məhrum,
Bil, yaxşı degil bu hərəkat, a bütə Telli.

Qəzəlin rədif qafiyəsini təşkil edən və əsas cinas yükünü daşıyan "bütə, bitə" sözü şeirdə səkkiz dəfə təkrarlanmış və hər dəfə də yeni məna kəsb etmişdir. Belə ki, birinci misrada "gözəl", ikincidə "tab itə, dözüm itə", dördüncüdə "tabut", altıncıda "tapdamaq", səkkizincidə "bitmək, çıxmaq, kök salmaq", onuncuda "buta-qızıl əridilən qab", on ikincidə "bitib

---

* Qeyd: Xatırladırıq ki, orijinalda müraciət olunan şəxsin adı Telli deyil, Qara kimi verilmişdir. Lakin Salman Mümtaz həmin şeir üzərində düzəliş apararaq "Qara" adını "Telli" ilə əvəz etmişdir. Şeirin ümumi ruhunun qadın adına daha uyğun olduğunu nəzərə alıb biz də onu "Telli" kimi saxlamağı məsləhət bildik (R.K.).

sağalmaq" və nəhayət, on dördüncü misada "gözələ" mənasında işlənmişdir. Bir sözün yüksək poetik təfəkkürlə bir qədər dəqiq mənalarda işlədilməsi əlbəttə, şairdən xüsusi istedad, döyük məharət tələb edir.

Asinin şeirləri işərisində üç müxəmməsi də vardır. Müxəmməs müştərək şeir forması olub həm aşıq şeirində, həm də klassik ədəbiyyatda işlənir. Bu janr şifahi xalq ədəbiyyatına, aşıq şeirinə yazılı ədəbiyyatdan keçmişdir. Yazılı ədəbiyyatdakı müxəmməslə aşıq poeziyasındakı müxəmməs arasında bəzi fərqlər vardır. Onlardan ən başlıcası klassiklərdə müxəmməsin əruzla, aşıqlarda isə heca vəznində yazılmasıdır. Asi müxəmməslərini əruz vəznində yazmışdır. Lakin onlarda heca atributları da mövcuddur. Müxəmməslərdən biri beş,biri yeddi, digəri isə doqquz bənddən ibarətdir. Onlardan ikisi Mahmud adlı şəxsə ünvanlanmışdır. Lakin şeirin ümumi ruhundan onun qadına yazıldığı tam aydınlığı ilə hiss olunur.

Asinin əldə olan cüngündə iki tərcibəndi də var. Yüksək sənətkarlıqla yazılmış bu tərcibəndlərdən biri «Sona»[1] adlı şəxsə ünvanlanmış, digəri isə klassik tərcibəndlər kimi daha geniş mövzuya həsr olunmuşdur. Hər iki tərcibənd altı hissədən ibarətdir. Birinci tərcibənd ənənəvi olaraq saqiyə müraciətlə başlayır, daha sonra isə baharın gəlişi münasibətilə ana təbiətin oyanması və hər tərəfin gülzara dönməsi ilhamla tərənnüm olunur. İlk baxışda bu şeir oxucuya Xətainin «Bahariyyə»sini xatırladır. Lakin diqqətlə araşdırdıqda görürük ki, bu şeirlərdə Xətaidən daha çox Zakirin təsiri hiss olunur. Çünki Zakir bəzi tərcibəndlərin baharın vəsfi və saqiyə müraciətlə başladığı kimi:

«Saqi, dolanım başına, allahı sevərsən,
Bir cami-şəfəqqun ilə qıl könlümü rövşən».[2]

---

[1] Orijinalda bu şeir «Qara» adlı şəxsə ünvanlanmışdı. Lakin Salman Mümtaz topladığı materiallarda «Qara» adını «Sona» ilə əvəz etmişdir. Biz də bu düzəlişi münasib hesab edib həmin variantı saxladıq (R.K.).
[2] Q.Zakir. Əsərləri. B., 1964, s. 295.

—Asi də onun yolu ilə gedərək tərcibəndini saqiyə müraciətlə başlayır:

Saqiya, ey büti-məhpeykəri xurşidcəmal,
Ələ al badeyi-gülgün qədəhin mala-mal.

Dur ayağa, tök əyağ içrə meyi-səhbanı
Ki, ayaqdan salsın könlümü, etsin ehmal.

Daha sonra şair «şərab» sözünün hər bir hərfini belə mənalandırır:

Ol sərabi ki, onun «şin»i şəkərdir, «rey»i ruh,
«Əlif»dir abi-bəqa, «ba»dan ibarətdir bal.

Şərabdan məst olan şair dünyaya yeni bir gözlə baxır. Təbiət onun gözlərində daha da gözəlləşir, dünya-aləm cənnətə dönür. Bu gözəllikləri qələmə alan şair mahir bir rəssama çevrilir. Onun yaratdığı tablolar oxucunu bu gözəlliyi yaşamağa sövq etməklə ona ruhi zövq verir.

Çünki bu bir belə mövsümdü ki, şahənşəhi-gül,
Təxti-gülşəndə hökumətlə tutub istiqlal.

Səf çəkib cümlə müqabildə cüyuşi-səbzə,
Sərv qaldırdı çəməndə ələmi-meymun fal.

Etdi məğhur çəmən ləşgərini şahi-bəhar,
Çərxəçivar girib ərsəgəhə badi-şimal.

Bijəni- «ordubeheşt» eylədi «fərvərdin»ə zur,
Qəl'eyi-gülşənə Kavusu-səbadır kutval.

Şeiri oxuyarkən alleqorik obraz kimi təsvir olunmuş Gülün şahənşah kimi öz gülşən təxtində əyləşdiyi, bütün gül-çiçəyin, yaşıllığın onun qarşısında səf çəkdiyi, Sərvin çəməndə qələbə bayrağını ucaltdığı, Çəmən ləşgərini Bahar şahın məğlub etdiyi Şimal küləyinin çərxəci kimi döyüş meydanında dolaşdığı, bahar ayı olan ordubehiştin qışın sonuncu ayı fərvər-

dinə güc gəldiyi və Gülşən qalasında Səbanın olduğu gözlərimiz qarşısında canlanır. Altı bənddən ibarət olan bu tərcibəndin hər bəndində şair ayrı-ayrı məsələlərə toxunur. İkinci bənddə qönçə, nəsrin, gül, söyüd yarpağı, səba, lalə və s. «Şahnamə» qəhrəmanları - Rüstəm, Bəhmən, Fərzin, Sifəndəramiz, Söhrab, Giv, Keyxosrov, Səyavuş, Firəngiz və başqalarının timsalında şəxsləndirilməklə yanaşı, bu qəhrəmanların başına gəlmiş məlum hadisələr xırda ştrixlərlə, eyhamla təsvir olunur:

Əfsəri-gönçə qoyub başə şəhi-fərvərdin,
Payi-təxtində məqam etdi vəziri-nəsrin.

Rəxsi-piləfkəni-şax üstə çıxıb Rüstəmi-gül,
Rüx tutub Bəhməni mat etməyə sürdü Fərzin.

Bərgi-bid eyləmiş amadə xədəngi-dilduz,
Vurmağa çeşmi-Sifəndəramizə qıldı kəmin...

Üçüncü bölmədə bülbül və qumru quşunun oxuduğu nəğmələr fonunda muğamatın şöbələri —şur, hisar, humayun, rast, simayi-şəms, dilkəş, zəminxarə və s. adı çəkilir.

«Şur» qanunun edib bağdə bülbül ağaz,
Yetirib çərx «hisar»ına «humayun» avaz.
Qumru ahəng qılıb zümzümeyi-səhraşub,
Zirü bəm pərdeyi-«ku-ku»də əcəb qılmış saz.

Bununla yanaşı, şeirdə dövrün gözəl xanəndəsi Firuzun da adı qeyd olunur.

Ləhni-Firuz çəkib «rast»ı «simayi-şəms»ə,
Dili-üşşaqə nəva böylə salıb suzü güdaz.

Dördüncü bölmədə yarının cəfakar olduğu, əğyara meyl etdiyi təsvir olunur və bu səbəbdən də gileylənir ki,

«Əşki-gülgün axıdır didə o gündən ki, könül
Mayili-lələbü arizi-gülzar olmuş»-dur.

Beşinci bənddə yarının ona mehr salmaması, ahu kimi ondan hürküb qaçması, hər tərəfdən onun üzərinə kədər, qüssə, qəm yağdığını məyusluqla qeyd edir və bundan çıxış yolunu məst olub qiyamətə qədər ayılmamaqda görür:

Rahi-reyhan ilə qıl öylə məni bixud kim,
Məstü mədhuş qılam bir də qiyamətdə qiyam.

Nəhayət, altıncı bənddə şair sanki söylədiklərinə yekun vuraraq özünü bu işdə təqsirli bilmir. Çünki o, «çeşmi-xumar eşq əmiri ilə tirü kaman çəkib onun səbrü qərarın əlindən almışdır», «əqlini məhbus edib cahi-zənəxdanda, silsileyi-zülfündə əsir etmişdi». Əqilsiz cismin əlindən isə heç nə gəlməz. Çünki nur saçan günəş olmasa cahan zülmət qaranlığa qərq olar. Şairin «Ey qamu xublara şah Sona» misrası ilə başlayan tərcibəndi də yüksək sənətkarlıqla yazılmışdır. Hər iki əsəri oxuyarəkn hiss olunur ki, onlar həssas ruhlu, incə zövqlü, şairanə təbiətli, həyata açıq gözlə baxan müdrik bir insanın qələmindən çıxmışdır. Odur ki, Asinin böyük məhəbbətlə qələmə aldığı bu əsərləri heç bir mübaliğəsiz XIX əsrdə yaranmış tərcibəndlərin ən gözəl nümunəsi hesab etmək olar.

Ədəbiyyatımızın ayrılmaz tərkib hissəsi olan nəzirə ədəbiyyatına münasibət tədqiqatçılar arasında həmişə birmənalı olmamış, onu bəziləri təqdir, bəziləri isə tənqid etməklə iki qarşı cəbhədə dayanmışlar. Nəzirəçiliyə son dərəcə qısqanclıqla yanaşan tədqiqatçılar onu ədəbiyyatşünaslıq elmində mənfi bir hal kimi səciyyələndirməyə çalışmışlar. Çox zaman bu məsələ kampaniya xarakteri daşımış, necə deyərlər, alimlərimiz ağına-bozuna baxmadan bütün nəzirələri qeyri-məqbul, ən yumşaq halda təqlid kimi qiymətləndirmişlər. Lakin məsələnin dərinliyinə varıb ədəbiyyatımızın keçdiyi ziqzaqlı yollara nəzər saldıqda bir həqiqəti də dərk etməli oluruq. Bu həqiqət məsələnin heç də düşünüldüyü kimi deyil, onun köklərində hansısa bir sağlam, ədəbiyyatın inkişafına xidmət edə biləcək rüşeymin gizləndiyi faktının olmasıdır. «Mövzu, vəzn və qafiyə cəhətdən bir-birinə oxşayan əsərləri nəzirəçilik ad-

landırıb keçmək ədəbi-tarixi prosesi doğru qiymətləndirməyə kömək edə bilməz. Çünki Yaxın Şərq ədəbiyyatındakı bədii yaradıcılıq təcrübəsi aydın göstərir ki, bütün sənətkarlar bir-birini sadəcə təqlid etmək məqsədilə deyil, bir növ yaradıcılıq müsabiqəsinə qoşularaq, yarışmaq yolu ilə eyni mövzuda, eyni janrda əsərlər yaratmışlar»[1]. Son dərəcə sərrast deyilmiş bu fikri rəhbər tutaraq hər bir tədqiqatçı nəzirə barədə fikir söyləməzdən öncə onun necə, hansı şəraitdə və hansı münasibətlə yazıldığına, əsərin məna və məzmununa, onun təqlidçilik çərçivəsindən kənara çıxıb çıxmaması məsələlərinə aydınlıq gətirməlidir.

Bu, bir həqiqətdir ki, nəzirə ədəbiyyatı Xaqani və Nizamidən tutmuş günümüzə qədər bütün dövrlərdə olmuş və bu zaman kəsiyində elə bir şair olmamışdır ki, özündən öncə yaşamış, yaxud müasiri olduğu qüdrətli şairin əsərinə nəzirə yazmasın. Onu da unutmaq olmaz ki, bu proses təkcə bizim xalqımızın ədəbiyyatında deyil, bütün xalqların ədəbi prosesində yaşanmış və bu gün də yaşanmaqdadır. Bunu proses adlandırmağımız təsadüfi deyil. Həqiqətən də, məsələnin dərinliyinə varanda, bunun real, ədəbiyyatımız tarixində özünə vətəndaşlıq hüququ qazanmış bir ənənəvi poetik proses olmasını aydın şəkildə görürük. Təbii ki, «…hər qəzəl yazan və Füzuliyə nəzirə tərtib edən müqəllid Füzuli müaqibi sayıla bilməz»[2]. Eləcə də güclü şairin zəif nəzirəsi də ola bilməz. Füzuli və Zakir kimi şairlərin nəzirələri buna aydın sübutdur. Əksər hallarda bu kimi şairlərin yazdıqları nəzirələr orijinaldan qat-qat üstun olduğu üçün ictimaiyyət arasında orijinal kimi qəbul olunmuş və nəzirə olduğu tamamilə unudulmuşdur. Bu xüsusiyyət əsasən poetik təcrübə və poetik ənənədən irəli gəlir. Söz sənəti və eləcə də sənətkarların formalaşmasında bu iki faktorun müstəsna rolu vardır. Poetik ənənə və təcrübəyə malik olmayan hər hansı bir sənətkarın ədəbi ictimaiyyətdə uğur qazanması qeyri-mümkündür. Çünki

---

[1] M.Quluzadə. Füzulinin lirikası. Bakı, 1965, səh. 421.
[2] H.Araslı. Böyük Azərbaycan şairi Füzuli B.1958, səh. 291.

«söz sənəti ictimai fikrin elə sahəsidir ki, poetik təcrübə və poetik ənənə ilə bağlanmadan inkişaf edə və yeniləşə bilməz. Eləcə də poetik ənənə və təcrübənin özü də kənarda, nəzarətçi kimi deyil, milli poeziya ilə birlikdə inkişaf yolu keçir»[1].

Bir qayda olaraq istər hər hansı bir şair tərəfindən, istərsə də kollektiv şəkildə nəzirə üçün götürülən şeir bütün parametrlərinə görə digər şeirlərdən özünün yüksək sənətkarlıqla yazılması, gözəl qafiyə sistemi, forma, məna və məzmun kAmilliyi ilə seçilirdi. Bu da nəzirə yazanların məsuliyyətini daha da artırır, onlarda yüksək sənət əsəri yaratmaq vərdişini inkişaf etdirirdi. Bu ədəbi ənənə xüsusilə XIX əsr məclis şairləri arasında daha geniş yayılmışdır. Çox zaman bu prosesdə 5-6, yaxud 8-10 şair, bəzən də bütün məclis üzvləri iştirak edirdilər. Unutmaq olmaz ki, şairlərin bu ədəbi prosesə qoşulmaları qaçılmaz idi. Çünki bu hər şeydən öncə dövr və mühitin tələbi idi. İstər-istəməz hər bir şair bu prosesdə iştirak etməli və öz sözünü deməli idi. Bunu bir növ şeir müsabiqəsi, daha dəqiq desək, şairlərin öz aralarında güclərini sınaması kimi də qiymətləndirmək olar.

Ancaq unutmaq olmaz ki, nəzirəçilik kompaniya xarakterli olub kütləvi hal aldıqda çox zaman şeirin məna və məzmununda təkrarçılığa, təqlidçiliyə yol verilmiş və nəticədə haqlı olaraq bu qəbil əsərlər müasir tədqiqatçılarımız tərəfindən qeyri-məqbul epiqonçu ədəbi nümunə kimi qiymətləndirilmişdir. Danılmaz faktdır ki, qəzəl şairlərinin hamısında oxşar cəhətlər var. Bu o demək deyildir ki, onlar biri digərini təkrar edibdir. Bu bənzəyişi qəzəlin, ümumən lirikanın məzmun və formasından gələn cəhət kimi qiymətləndirmək daha doğru olardı. Lakin bunların içərisində yüksək tələblərə cavab verən orijinal şeirlərin də olmasını yaddan çıxarmaq olmaz. Biz bu məqamda tədqiqatçı Nəsrəddin Qarayevin fikirləri ilə tam razılaşır və onun: «Ədəbiyyatşünaslıqda çox vaxt eyni rədif və qafiyəli qəzəllərin hamısına nəzirə kimi baxırlar. Lakin XIX əsrdə yazılmış bir neçə eyni rədifli qəzəllərin

[1] Q.Cahani. Azərbaycan ədəbiyyatında Nizami ənənələri. B. 1979, səh.5

yaranma tarixi ilə tanış olduqdan sonra biz belə qənaətə gəlirik ki, bu cür qəzəlləri ucdantutma nəzirə hesab etmək düzgün deyildir»[1] qənaətinə gəlməsini düzgün hesab edirik. Daha sonra tədqiqatçı fikrini təsdiq etmək üçün Natəvanın «Ağlaram» rədifli qəzəlinin təsiri ilə müxtəlif şairlər tərəfindən yazılmış «Ağlaram», «Ağlama», «Ağlasın» rədifli qəzəlləri əyani sübut kimi misal çəkir və onların hər birinin ayrı ayrılıqda orijinal sənət əsəri olduğunu sübut etməyə çalışır[2]. Əlbəttə, bu şairlərin hamısı Natəvanı sevir və dar gündə ona dayaq olmağa çalışırdılar. Bu cəhətdən də onların yazdıqları şeirlər təsəlliverici nəsihətamiz mövzuda qələmə alınmışdı. Təbii ki, bu şairləri epiqonçuluqla bağlamaq düzgün olmazdı. Bu yuxarıda qeyd etdiyimiz poetik ənənənin davamı idi. Bütün tarix boyu davam edən bu proses XIX əsrdə xüsusilə böyük vüsət tapdığı üçün regionçuluq çərçivəsindən çıxaraq daha geniş arialda yayılmış və Azərbaycan klassik poetik ənənəsinin inkişafına güclü təkan vermişdir.

Nəzirəçilik XIX əsrdə öz ilkin mahiyyətindən bir qədər uzaqlaşaraq artıq, məclis şairləri arasında müsabiqə xarakteri almış və bu keyfiyyət də poeziyanın inkişafında mühüm rol oynamışdır. AMEA Əlyazmalar İnstitutunun arxivində saxlanılan bir cüngdə[3] biz belə bir mənzərənin şahidi oluruq. Cüngün tərtibçisi İsgəndər bəy Rüstəmbəyov özünə məxsus səliqə və dəqiqliklə bu şairlərin şeirlərini qələmə almış və onları ardıcıl olaraq əsərində vermişdir. O, cüngün 68[a] vərəqində İsgəndər bəyin:

Bəni salmış xətayə bir xəta kanı qara gözlər,
Degil imən füsuni-hiylədən ani, qara gözlər —

mətləli beş beytdən ibarət şeirini, onun ardınca isə bu şeirə nəzirə olaraq Aşiqin:

Alıb bir kəc nigahilə bu gün canı qara gözlər
Dili-məcruhə urmuş qəmzə peykanı qara gözlər - mətləli;

---

[1] Nəsrəddin Qarayev. XIX əsr Azərbaycan ədəbi məclisləri (namizədlik dissertasiyası) Bakı 1971. səh.135
[2] Yenə orada. səh 162.
[3] RƏİ —B —236/10536.

Asinin:
Edər sehr ilə daim bu xəta kanı qara gözlər,
Könül şəhrini yəğma türkü türkanı qara gözlər — mətləli;
Əbdüssəməd bəyin:
Salıb məgər dili-məhzunə heyranı qara gözlər,
Nədir ol binəvanın səhvi, nisanı, qara gözlər? — mətləli;
Növrəsin:
Edən dəmdə bənə nəzzarə pünhanı qara gözlər,
Verir bərbadə onda dinü imanı qara gözlər — mətləli;
Mirzə Sadiqin:
Edər hər qəmzədən məqtul yüz canı qara gözlər,
Salıbdır mərdüm içrə gör nə qovğanı qara gözlər — mətləli

hərəsi beş beytdən ibarət qəzəllərini vermiş, onun ardınca isə əlavə olaraq həmin rədif saxlanılmaqla yeni qafiyəli beş beytdən ibarət daha bir qəzəl də verilmişdir[1]. Bu qəzəlin orijinallığı orasındadır ki, o bir nəfər tərəfindən deyil, dörd şair tərəfindən yazılmışdır. Həmin qəzəlin mətlə beyti İsgəndər bəyə, digər beytlər isə Əbdüssəməd bəy, Növrəs və Aşiqə məxsusdur:

İsgəndər bəy:
Nə müddətdir salıb gözdən bəni yağı qara gözlər,
Yəqin olmuş genə xunilər ortağı qara gözlər.
Əbdüssəməd bəy:
Müjən ox, sinəmə hökm et, səni tarı, eylə ursun,
Sağalmayıb həşrədək qalsın yeri bağı qara gözlər.
Növrəs:
Tərəhhüm qıl, unut, gör xaneyi-mərdüm xərab eylər,
Qaragöz ahu tək gəh dalə baxmağı qara gözlər.
Aşıq:
İçib əhli-nəzər hər dəm məhəbbət badəsin ondan,
Xərab etmiş cahanı ta olub saqı qara gözlər

Səvadın hər tərəf nur bəsər üzrə mühit olmuş,
Üzün içün seçməzəm bən qarədən ağı, qara gözlər.

---
[1] RƏİ. B — 236/10536, vər.69[a]

Bu şairlər Azərbaycan dilində yazdıqları şeirlərlə kifayətlənməyərək bir-birini fars dilində yazdıqları şeirlərlə də imtahana çəkirdilər. Belə ki, qeyd etdiyimiz cüngdə Asinin:

Ey fəda-ye xoram rəftarət,
Rəbb-e tuba şəvəd negəhdarət[1] —mətləli

10 beytdən ibarət farsca qəzəlinə eyni rədif və qafiyədə Növrəs 9 beyt, Əbdüssəməd bəy 5 beyt, Aşiq 9 beyt, Mirzə Sadiq 7 beyt, Məmo bəy 7 beyt nəzirə, eləcə də İsgəndər bəyin «qədim şair» adlandırdığı Rəfiqin:

Məra dər cesm ta can afəridənd,
Be canəm mehr-e canan afəridənd

- mətləli qəzəlinə naməlum şair (laədri) 5 beyt, Məğribi 5 beyt, Asi 11 beyt, İsgəndər bəy 10 beyt, Aşiq 11 beyt, Növrəs 11 beyt, Məşədi Mirzə Sadiq 11 beyt nəzirə yazmışlar. Əslində bunların hər birini ayrı ayrılıqda müstəqil sənət əsəri də hesab etmək olar. Vacib məqamlardan biri də budur ki, Abdulla bəy Asi şərti olaraq şeir müsabiqəsi adlandırdığımız bu prosesin ən fəal iştirakçısı olmuş və həmişə də yüksək sənətkarlıq qabiliyyəti ilə digər şairlərdən seçilmişdir. Təbii ki onun bu mərtəbəyə çatmasında belə müsabiqələrin xüsusi rolu da danılmazdır. Onu da qeyd etmək lazımdır ki, bu şairlərin əksəriyyəti Asidən fərqli olaraq nəzirəçilik çərçivəsindən çıxa bilməmişlər.

Müqtədir tədqiqatçı alim F.Köçərlinin verdiyi məlumatlar da bu deyilənləri təsdiq edir. O yazır: «Asinin vaxtında Qarabağ şüəravü ürəfaları «Beyti —xamuşan» ismində bir məclis tərtib edib, orada şe'rü qəzəl inşad qılardılar və üdəbayi-salifənin asari-cəlilərini mütaliə etməklə və həkimanə söhbətlər ilə övqatlarını keçirərdilər… Bir belə ürəfa məclisi də Şamaxıda bina «Beytüs-Səfa» adı ilə məşhur idi. Bu iki məclisin arasında hər vaxt irsal-mərsul var idi»[2]. Daha sonra Şamaxı şairlərinin Şuşa şairlərinə ünvanladıqları məktubun məzmununu verərək qeyd edir ki, bu ədəbi məclislər arasındakı

---

[1] Yenə orada, vər. 70[a]
[2] F.Köçərli Azərbaycan ədəbiyyatı. Bakı, 1981, səh.105.

əlaqələr təkcə müxtəlif məzmunlu müşairələrlə məhdudlaşmır. Bu şairlər çox zaman şeir sənəti, onun incəlikləri ilə bağlı ən mühüm məsələləri çözmək üçün bir-birinə müraciət etməklə fikir mübadiləsi aparır və bu mübadilə nəticəsində əsl həqiqəti üzə çıxarmağa çalışırdılar. Çox zaman bir məclis daxilində baş verən mübahisəli məsələlərə aydınlıq gətirmək üçün digər məclis üzvlərinə müraciət olunur və nəticədə əsil həqiqət üzə çıxarılırdı. Növbəti dəfə Şirvan şairləri «Mövlana Füzulidən bir qəzəli intixab edib», «mütabiqi-qafiyə onun müqabilini deməyə iqdam etmiş» və onlardan hansının daha yaxşı yazması barədə «Süərayi-Şirvan arasında mübahiseyi-küll və mücadileyi-əzim vaqe olmuşdur». Bu mübahisəni kəsmək üçün onlar həmin şeirləri Şuşaya «Məclisi-fərmasan» üzvlərinə göndərərək həmin əsərləri qiymətləndirməyi onlardan xahiş etmişlər: «Ümid ki, əshabi-firdovsnişan, xüsusən ol səramədi-dövran və qibleyi-ürfan Mövlana Abdulla bəy Asi və Növrəsi-əvvəl və təmami-əhli-məclis ol qəzəllərin biri-birindən əla və pabəst olmağını təqribən imtiyaz edib, elam buyuralar ki, ta bu qəzəllərin hansı hansından əla olduğu məlum və müşəxxəs ola»[1]

Məktubdan göründüyü kimi Şirvan şairləri Asiyə yüksək qiymət vermiş, ona olan ehtiram və rəğbətlərini açıq söyləməkdən çəkinməmişlər. Şuşa şairləri mükəmməl müzakirələrdən sonra yekdil qərara gələrək «…əvvəlinci dərəcədə Bixud həzrətlərinin, ikinci dərəcədə Hacı Seyid Əzimin, üçüncü dərəcədə Zövinin, dördüncüdə Səfa ilə Salikin, beşincidə Qafilin, altıncıda Zühurinin, yeddincidə Rağibin qəzəllərini qoyublar»[2]

Bu məsələ ilə əlaqədar olaraq Qarabağ şairləri də öz şairlik istedadlarını göstərmək üçün Füzulinin həmin qəzəlinə eyni bəhr və qafiyə ilə şeirlər yazaraq Şirvan şairlərinə göndərmiş və həmin qayda ilə onların hansının üstün olmalarını müəyyənləşdirməyi xaşih etmişlər. Füzulinin:

---

[1] F.Köçərli Azərbaycan ədəbiyyatı. B.1981. səh.105.
[2] Yenə orada, səh.106.

Təriqi-fəqr tutsam, təb' tabe, nəfs ram olmaz,
Qina qılsam tələb, əsbabi-cəm'iyyət təmam olmaz.

mətləli qəzəlinə nəzirə olaraq Asinin yazdığı:

Fəna mülkünə aşiq girməyincə nəfsi ram olmaz,
Məqami-«liməəllah» sirri anınçün təmam olmaz-

mətləli qəzəl Şirvan şairləri tərəfindən yüksək qiymətləndirilərək birinci yerə layiq görülmüşdü. Hətta bu şeir Firidun bəyin özünü də o dərəcədə valeh etmişdir ki, o Asinin bu qəzəlinin «Füzuli əleyhirrəhmənin qəzəlindən dəxi bir az artıq» olduğunu söyləmişdir. Nəzirə hesab olunan bu şeirdə orijinallıq xüsusiyyəti daha çoxdur. Bu şeirlər arasında yeganə oxşar cəhət rədif qafiyənin və vəznin eyni olmasıdır. Qalan cəhətlərinə, xüsusilə də məzmununa görə bu şerdə oxşarlıq demək olar ki, yox dərəcəsindədir. Və hətta bəzən bu qafiyələr də tamamilə başqa məna kəsb edir. Məsələn, Füzulidə:

…Dəhanından əsər görməm, miyanından nişan, vəh kim,
Məni —nakamə ömrümdən müyəssər hiç kam olmaz

beytindəki məna belədir: Onun (sevgilisinin) ağzından əsər, miyanından (qəd-qamət, orta, incə bel) isə heç bir nişan (əlamət) yoxdur —yəni şair yarı görə bilmir və ona həsrətdir, qorxusu da budur ki, o heç zaman yarına qovuşmadan həyatdan nakam köçsün.

Asidə isə həmin qafiyə işlədilən beyt tamamilə başqa məna kəsb edir:

… Məqami-qürbi-yarə vasil ola aşiqi-sadiq,
Riyazi-düstdən özgə ona aləmdə kam olmaz.

Yəni, aşiqi-sadiq yarına qovuşduqda ona dostun (yarın) əzabından başqa ayrı bir kam müyəssər olmaz.
Yaxıd,

Təriqi-fəqr tutsam, təb'tabe, nəfs ram olmaz.
Qina qılsam tələb, əsbabi-cəm'iyyət təmam olmaz -

beytində Füzuli demək istəyir ki, «Kasıblıq yolunu tutsam təbiətim (ona) tabe, nəfsim ona ram olmaz. Zənginlik tələb etsəm, cəmiyyətin tələbləri ödənilməz, tamamlanmaz». Asidə isə bu beyt tamamilə başqa məna kəsb edir; O, bu beytində təsəvvüf görüşlərini əks etdirərək, «fəna mülkinə-yəni mə-

nəvi təkamülün yeddinci mərtəbəsinə ucalmayınca insan əsl səadətə, istədiyinə nail olmaz» fikrini təsdiq etməyə çalışmışdır:

Fəna mülkünə aşiq girməyincə nəfsi ram olmaz,
Məqami —liməällah sirri anınçun təmam olmaz.

Bu misalları ayrı-ayrılıqda hər beytə aid etmək olar. Göründüyü kimi, Asi bu şeirində Füzulinin dediklərini sadəcə təkrar etmir, məzmun baxımından ona oxşar fikir söyləmir. Lakin bununla yanaşı, o qoyulmuş qaydadan da kənara çıxa bilmir. Çünki ümumi qəbul olunmuş qayda bunu tələb edirdi. Nəzirə yazan hər bir şair qafiyə və rədifi olduğu kimi saxlamaqla yeni fikir, yeni şeir yaratmalı idi. Məhz bu səbəbdən belə şeirləri ucdantutma nəzirə adlandırmaq da düzgün olmaz.

Bu, bir həqiqətdir ki, XVI əsrdən etibarən Azərbaycan ədəbiyyatında qəzəllərinə ən çox nəzirə yazılan şair böyük Füzuli olmuşdur. Bunu Füzuli dühasının qüdrət və əzəməti kimi də qiymətləndirmək olar. Lakin onu da unutmaq olmaz ki, hətta milli lirikamızın zirvəsi hesab olunan Füzuli də vaxtilə özündən əvvəl yaşamış böyük özbək şairi Əlişir Nəvaiyə istənilən qədər nəzirə yazmışdır. Ələbttə, bunu Fuzuli üçün qəbahət hesab etmək olmaz. Unutmaq olmaz ki, Nəvai də öz növbəsində ən gözəl əsərlərini dahi Nizamiyə nəzirə olaraq onun təsiri ilə yaratmışdır.

Digər klassiklər kimi, Nəvai irsi də XV əsrdən etibarən Azərbaycan ziyalılarının diqqətini cəlb etmiş, şairlər onun əsərlərinə nəzirələr yazmış, bir sıra əsərlərini dilimizə tərcümə etmişlər. Nəvai irsinin ardıcıl tədqiqatçısı prof. C.Nağıyeva ölkəmizdə şairin irsinə müxtəlif zamanlarda olan marağı mərhələlərə bölərək qeyd edir ki, XIX yüzillikdə Nəvai yaradıcılığı ilə əlaqə daha güclü olmuşdur. Bu dövrdə Azərbaycan şairlərinin bir çoxu Nəvainin əksər qəzəllərini əzbər bilmişlər. Bu şəxslər Nəvainin şeirlərini təkrar-təkrar oxumaqla həm də cığatay dilini öyrənmişlər.[1] F.Köçərli öz əsə-

---

[1] C.Nağıyeva. Azərbaycanda Nəvai. B. —2001, səh. 173.

rində bu mövzuya xüsusi önəm verərək «Əlişir Nəvainin bizim Azərbaycan şüəralarına artıq dərəcə təsiri» olduğunu və hətta onlardan bəzilərinin Nəvai şeirlərinə, onun «lisani-möcüzbəyanına» rəğbət göstərərək «özləri də cığatay türklərinin lisanında şeir və qəzəl deməyə, Nəvaiyə nəzirə yazmağa mö'tad olduqlarını» xüsusi olaraq qeyd edir.[1] Daha sonra tədqiqatçı onlardan ən məşhurlarından bir neçəsinin adını çəkir və Asini xüsusi olaraq qeyd edir: «Mərhum Abdulla bəy Asinin cığatay dilində elə dilpəzir qəzəlləri vardır ki, Nəvainin öz kəlamına bənzəyir; ancaq bu dilin ərbabı onlara tərcih verə bilər. Onun cığatay lisanında Şirvan şüərasına yazdığı təcribənd… hər bir əhli-zövq və mərifəti valeh edə bilər»[2].

Asinin cığatay dilində yazdığı şeirlərin çox az qismi gəlib bizə çatmışdır (üç qəzəl və bir mənzumə). Lakin sənətkarlıq baxımından bu şeirləri, doğrudan da, yüksək səviyyədə yazılmış sənət əsəri hesab etmək olar. Onu da qeyd edək ki, bu qəzəllərdə Nəvaidən daha çox Füzuli təsiri hiss olunur. Xüsusilə «Bar» rədifli qəzəldə bu əlamət daha aydın görünür. Ümumiyyətlə, XIX əsr Azərbaycan ədəbiyyatında Nəvai, yaxud, Füzuli ədəbi məktəbindən bəhrələnməyən şair tapmaq qeyri-mümkündür. Lakin bu sairlərin hamısını ucdantutma Nəvai və Füzuli ədəbi məktəbinin davamçıları hesab etmək ən azı sadəlövhlük olardı. Bu məktəbin davamçıları birinci növbədə yüksək istedada malik, şeir texnikasına mükəmməl bələd olan, poeziyanın bütün tələblərinə cavab verə bilən şairlər olmalıdır. Heç bir tərəddüd etmədən Abdulla bəy Asini bu keyfiyyətləri özündə ehtiva edən həmin sənətkarlardan biri, yaxud birincisi hesab etmək olar. Firidun bəy Köçərli demişkən: «Əcnəbi lisanında belə fəsahət və bəlağətlə şeir demək hər adamın hünəri deyil. Meydani-süxəndə, əlhəqq, Asi dəxi türk şüərası beynində binəzir, alitəb və zərif bir vücuddur ki, onunla fəxr etməyə haqqımız var»[3]

---

[1] F.Köçərli. Azərbaycan ədəbiyyatı. I c, B. —1981, səh.122.
[2] Yenə orada. səh.122.
[3] Yenə orada, II c. səh. 111.

Abdulla bəy Asi öz istedadını bəhri-təvil janrında da göstərmişdir. Firidun bəy Köçərli onun bir neçə bəhri-təvili olduğunu göstərsə də günümüzə qədər onun cəmi iki bəhri-təvili gəlib çatmışdır. Şeir janrları içərisində ən gənci olan, XVIII əsrdə Vəsmət adlı şair tərəfindən yaradılan bəhri-təvil haqqında elm aləmində müxtəlif fərziyyələr mövcuddur. Bəzi tədqiqatçılar «bəhr» sözünün yozumunu «dərya», «okean» anlamında qəbul edərək onun uzun, dərin dərya mənasında olması fikrini irəli sürürlər. Lakin bu anlam düz deyil. Çünki «bəhr» sözünün bu tərkibdəki mənası «şeir şəkli» mənasını daşıyır. Və belə olan halda ona ikinci məna verməyə lüzum və ehtiyac duyulmur. Bu ifadəni «uzun bəhr» kimi qəbul etmək, fikrimizcə daha düzgün olardı. Dediklərimizi təsdiq üçün müqtədir şairimiz Qasım bəy Zakirin İsmayıl bəy Qutqaşınlıya yazdığı məktubdan bir beyti xatırlatmaq yerinə düşərdi:

Süxən meydanı, qibləm, təng idi, söz müxtəsər keçdi,
Sənin əfsanəni nəzm etməyə bəhri-təvil istər.

Burada fikir aydın, məna anlaşıqlıdır. Şair qısa bir şeirlə dərdini izah edə bilmədiyini və bunun üçün uzun bir bəhrə, hekayətə ehtiyac duyulduğunu söyləyir.

Asinin yazmış olduğu bəhri-təvillər öz orijinallığı ilə seçilir. Bəlkə də o, qələmini bu janrda sınayan şairlər içərisində yeganə şəxsdir ki, müxəmməs şəklində bəhri-təvil yazmışdır. Orijinal quruluşa malik olan yüksək sənətkarlıqla yazılmış bu əsər son dərəcə maraqlı və oxunaqlıdır. Şairin orijinal hesab etdiyimiz B-3352 sifrli əlyazmasında şeir «Müxəmməsi-bəhri-təvil» adlandırılır. Şeirin ümumi həcmi 55 misradan ibarətdir. Əsər özü hərəsi 11 misradan ibarət beş hissədən (bənddən) ibarətdir. Hər bölmədə əvvəlinci üç misra həmqafiyə, şərti olaraq cığa adlandırdığımız IV, V, VI, VII misralar iki hissəyə bölünməklə həmqafiyə, VIII və IX misralar həmqafiyə, X və XI misralar isə birinci üç misra ilə həmqafiyə şəklində verilmişdir. Bizim fikirimizcə, məhz I, II, III, X, XI misralar həmqafiyə olduğu üçün əsər «Müxəmməsi-bəhri-təvil» adlandırılmışdır. Sonrakı bəndlər də cuzi dəyi-

şikliklə həmin tərtibatla verilmişdir. Lakin yeganə fərq I, II, III, X misraların həmqafiyə, XI misranın isə I bəndin XI misrası ilə həmqafiyə şəklində verilməsindən ibarətdir. Şeirin ümumi quruluşu belədir: I bənd (a, a, a, b(b), b(b), b(b), b(b), v, v, a, a); II bənd: q, q, q c(c) c(c), c(c), c(c), d, d, q, q. Digər bəndlər də ardıcıl olaraq bu prinsiplə qafiyələnirlər. Ümumilikdə hər bəndin daxilində qifiyə sistemi üç dəfə dəyişilir.

Əgər IV, V, VI, VII misraları originalda olduğu kimi bütövləşdirsək, onda müxəmməsin içərisində bir bənd daxili qafiyəli müsəddəsin də yerləşdiyini aydın şəkildə görə bilərik. Ümumilikdə alınan mənzərə belə olar:

Ey zülməti-zülf içrə yüzün mehri-münəvvər,
Vey bağı-rəşadətdə qədi sərvi-sənubər,
Məqbul yaratmış səni ol xaliqi-əkbər,
Vermiş sənə zinət, məşşateyi-qüdrət.
Yox sən kimi löbət, bu nazü nəzakət,
Bu lütfü lətafət, bu qəddü bu qamət,
Həm hüsnü məlahət, ey ayeyi-rəhmət,
Yox kimsədə əsla, ey dilbəri-ziba,
Olmaz sənə həmta Şirinü Züleyxa.
Layiqdi ki, Yusif ola sən sərvərə çakər
Ey qaməti ər-ər, dodağı qəndi-mükərrər.

Şeirin bir gözəlliyi də ondadır ki, IV, V, VI və VII misraların hər biri çox asanlıqla iki hissəyə bölünür və bu hissələrin də hər biri altı hecadan ibarət olur. Onları yarımmisraya bölüb cığa şəklinə saldıqda, sxemdəki mənzərə də dəyişir: (a, a, a, b(b), b(b), b(b), b(b), v, v, a) və şeir altılıq deyil, artıq onluq - müəşşər kimi nəzərə çarpır:

Ey zülməti-zülf içrə yüzün mehri-münəvvər,
Vey bağı-rəşadətdə qədi sərvi-sənubər,
Məqbul yaratmış səni ol xaliqi-əkbər,
Vermiş sənə zinət
Məşşateyi-qüdrət.
Yox sən kimi löbət
Bu nazü nəzakət

Bu lütfü lətafət
Bu qəddü bu qamət,
Həm hüsnü məlahət,
Ey ayeyi-rəhmət,
Yox kimsədə əsla, ey dilbəri-ziba,
Olmaz sənə həmta Şirinü Züleyxa.
Layiqdi ki, Yusif ola sən sərvərə çakər
Ey qaməti ər-ər, dodağı qəndi-mükərrər.

Ümumiyyətlə götürdükdə isə bu bəhri-təvildən daha çox müxəmməs və müsəddəsin sintezindən yaranmış şeiri xatırladır. Çünki burada adı çəkilən şeir formalarının bütün qayda və qanunlarına dəqiq riyaət olunmuşdur. Şeir həm heca vəznin, həm də əzuzun tələblərinə tam cavab verir. Əgər şeirin şərti olaraq cığa adlandırdığımız hissəsini götürsək, onun müsəddəsin, digər hissəsinin isə müxəmməsin bütün tələblərinə cavab verdiyini görərik. Heca bölgüsünə gəldikdə I bəndin birinci iki misrası 14, III misrası 13, IV, V, VI, VII, VIII, IX misralar 12, X, XI misraları da 14 hecadan ibarətdir; II bəndin I, II, III, X, XI misraları 14, VI misrası 11, IV, V, VII, VIII, IX misraları 12 hecadan; III bəndin I misrası 13, III misrası 12, II, X və XI misraları 14, qalanları 12 hecadan; IV bəndin I, II, III, X, XI misraları 14, IV, V, VI, VII, VIII, IX misraları 12 hecadan və nəhayət, sonuncu V bəndin I misrası 13, II, III, X, XI misraları 14, qalan misraları isə 12 hecadan mbarətdir.

Burada I bəndin üçüncü, II bəndin altıncı, III bəndin bir və üçüncü, V bəndin birinci misralarındakı heca çatışmazlığını heca vəznli şeirlər üçün qüsur hesab etmək olmaz. Çünki nəzəriyyə kitablarında göstərildiyi kimi heca vəznli şeirlərdə bir, yaxud ən çoxu iki heca fərqinə yol verildikdə (kütləvi olmasa) o qüsur sayılmaya da bilər. Konkret halda isə əgər o hecaların yerinin boş qaldığı tələffüz zamanı hiss olunmursa, şeirin ahəngi, misranın ritmi pozulmursa, bunu qüsur hesab etmək olmaz. Digər tərəfdən şeir texnikasına yaxından bələd olan Abdulla bəy kimi bir sənətkarın belə qüsura yol verməsini təsəvvürə belə gətirmək çətindir. O, həmişə müasirləri arasında özünün deyim tərzi, yüksək sənətkarlığı ilə

seçilmiş və bu xüsusiyyətləri ilə təkcə əbədi ictimaiyyətin deyil, ümumilikdə şeirsevənlərin sevimlisi olmuşdur.

Şairin ikinci bəhri-təvili də özünün qeyri-adiliyi ilə seçilir. Bu bəhri-təvil altı hissədən ibarətdir. Belə ki, hər hissənin başlanğıcında üç eyni vəznli misra həmqafiyə şəklində yazılmış, sonda isə həmin misralarla həmqafiyə olan dördüncü misra verilmişdir. Əvvəlinci üç misra ilə sonuncu IV misra arasında birinci bənddə beş, ikincidə altı, III, IV, V və VI bəndlərdə isə cümlə şəklində dörd qeyri-standart misra verilmişdir. Bu misraların hər biri bəhri-təvilin ümumi qaydasına müvafiq şəkildə daxili qafiyələrə malik olmaqla əksər hallarda biri digəri ilə də həmqayiə şəklində əlaqələndirilmişdir ki, bu da klassik səci xatırladır:

Saqiya, ey büti-zərrinkəmərü sərvi-səmənbər,
Sənəmi-qönçədəhən, simbədən, mahi-münəvvər,
Üzü lalə, gözü alə, dodoğı qəndi-mükərrər,
Dolanım başına, bəsdir bu təğafül, bu təkahül, yetişib
fəsli-bəhar, açdı bu gün laləvü sünbül,
Ucalıb cəh-cəhi-bülbül, yutişib göylərə qülqül, açılıb
nəstərənü gül, səmənü mövrədi-qərənfil,
Qəm əlindən tutulub dil, tutuban bəzmdə mənzil, tök əyağ
içrə bu gün mül, necə mül,
Vəh-vəh-vəh, ruhi-rəvan, rahəti-can, lə’li-Bədəxşan,
nəçidir abi-bəqa, şəhdi-müsəffa, onun əksində hüveyda
Olub e’cazi-Məsiha, eləyir mürdələr əhya, çata bilməz
ona əsla,
Qəmzədalıqda yəqin eyləgilən, çeşmeyi-kövsər.

Digər qalan beş bənd də bu qayda ilə yazılmışdır. Onların arasındakı yeganə fərq cümlə-misraların sayının az, yaxud çox olmasından ibarətdir. Şeirdə diqqəti çəkən maraqlı cəhətlərdən biri də şairin əruz vəznli qoşmayabənzər mürəbbe yazmaq təşəbbüsündə olmasıdır. Əgər biz hər bəndin birinci üç və sonuncu misralarını götürüb şeir şəklində ayrıca yazsaq, onda əruz vəznində zəngin daxili qafiyəyə malik qoşmaya bənzər mükəmməl mürəbbe alındığını görərik:

Saqiya, ey büti-zərrinkəmərü sərvi-səmənbər,
Sənəmi-qönçədəhən, simbədən, mahi-münəvvər,
Üzü lalə, gözü alə, dodoğı qəndi-mükərrər,
Qəmzədalıqda yəqin eyləgilən, çeşmeyi-kövsər.

Belə mövsümdə rəva görmə dönüm başına, saqi
Ki, qalıb guşeyi-möhnətdə çəkəm rənci-fərağı,
Məni gəl salma ayağa, ələ al bir dəm əyağı,
Ona tay olmaz əqiq ilən laleyi-əhmər.

Bir neçə cam peyapey yetir, ey saqi, edəm nuş,
Elə bir ləhzə məni badeyi-gülgunilə mədhuş,
Eyləyib könlümü qan hicri-ləbi lə'lü bənaguş,
Çün odur şə'şəeyi-nuri-xuda, nəyyeri-əkbər.

Gül ruyə olub əfşan, nə gözəl zülfi-pərişan,
Yoxsa gülşəndə gül ətrafın alıb sünbülü reyhan,
Nə əcəb çahi-zənəxdan, nə gözəl nərgisi-məstan,
Nəçidir navəki-müjgan kimi xunriz ola xəncər?

Şükr qıl, qədrini bil aləmara qadiri-biçun
Sənə lütf eyləyib, ey sərvi-rəvan, qaməti mövzun,
Şərhi-hümmi-düxandır səri-zülfün, dəhənin nun,
Nə münasibdir ona nafeyi-Çin, töhfeyi-ənbər.

Rəhm qıl Asiyi-dilxəstəyə, ey sərvi-dilara,
Səbr ara, məni hicran sipəhi eylədi yəğma,
Sənin eşqində olub Qeys kimi mənzili səhra,
Belə cansuz qəmə dəhrdə tuş olmaya kafər.

Gətirdiyimiz nümunələr bir daha təsdiqləyir ki, Asi daim yaradıcılıq axtarışlarında olmuş, öz qeyri-adiliyi ilə digər müasirlərindən seçilmişdir.

Ədəbiyyatşünaslıqda belə bir bəhri-təvilə və onun analoquna rast gəlmədiyimiz üçün Asini bu səpgidə ilk müəllif, novator şair hesab etməyə tam haqqımız çatır.

Klassik Şərq ədəbiyyatının ən qədim şeir növlərindən olan həcvə Firdovsidən tutmuş günümüzə qədər əksər şairlərin yaradıcılığında rast gəlmək olar. Mövzusu əsasən şəxsi münasibətlərdən doğan həcvləri bir şəxsin, indiki halda bir şairin hər hansı bir nəfərə qarşı bildirdiyi mənfi münasibətin təzahürü və ifadəsi kimi də səciyyələndirmək olar. Adətən, bu qəbil şeirlərdə şəxsi motivlər üstün olduğu üçün onların ictimai əhəmiyyəti az olur. Digər dövrlərə nisbətən bu janr XIX əsrdə, xüsusilə, əsrin iuinci yarısında daha geniş vüsət tapmış, demək olar ki, Azərbaycanda fəaliyyət göstərən bütün ədəbi məclislərdə şeirin bu növünə geniş rəvac verilmişdi. Əlbəttə, həcvdən söz düşəndə dövründən asılı olmayaraq ilk növbədə gözlərimiz önündə Qasım bəy Zakirin əzəmətli siması canlanır. Digər müasirləri kimi Zakirin də yazmış olduğu həcvlərdə bəzən fərdi xarakterli subyektiv ünsürlərə, şəxsi münasibətlərə yer verildiyinin şahidi oluruq. Lakin Zakirin böyüklüyü ondadır ki, o hətta fərdi xarakterli həcvlərində də yaşadığı dövrün vacib, siyasi cəhətcə aktual məsələlərini əks etdirə bilmişdir. Daha dəqiq desək, o, həcvi məhdud çərçivədən çıxararaq ona yeni meydan verməklə satira səviyyəsinə ucaltmış və bununla da ədəbiyyatımızda tənqidi realizmin təməl daşlarını qoymuşdur. Bu mənada novator-şair Zakiri yen bir məktəbin —tənqidi-realizm məktəbinin banisi hesab etmək olar. İstər Zakirin müasirləri və istərsə də davamçıları bu məktəbin təsiri ilə yazıb-yaratsalar da, onlardan heç biri Zakir səviyyəsinə ucala bilməmiş, ədəbi ictimaiyyətdə adi həcv yazan şair kimi tanınmışlır. Bu isə onlara uğur gətirməmiş, çox zaman həcv yazan şairlərin özləri çıxılmaz vəziyyətə düşmüş, ictimai qınağa hədəf olmuşlar. Əksər hallarda həcvlər təkcə iki nəfərin deyil, ümumilikdə iki böyük qrupun, bəzən də ədəbi məclis üzvlərinin qarşıdurmasına, münasibətlərinin pozulmasına səbəb olmuşdur. Lakin bütün hallarda bu janr şəxsi intiqam və tənbeh vasitəsi olaraq qalmamış, bəzi şairlərin yaradıcılığında inkişaf etdirilərək satira səviyyəsinə qədər gəlib çatmışdır. Bunun bariz nümunəsi kimi Qasım bəy Zaki-

rin, Seyid Əzim Şirvaninin, Mirzə İsmayıl Qasirin, Mirzə Mehdi Naci və onlarla digər şairlərin yaradıcılığını göstərmək olar. Təəssüflə qeyd etmək lazımdır ki, adlarını qeyd etdiyimiz şairlər nə qədər mütərəqqi olsalar da, həcv yazarkən digər həcvyazan şairlərdən heç də fərqlənməmiş, onların səviyyəsinə enərək təhqiramiz tabu sözlər işlətməkdən çəkinməmişlər.

Bütün bunlardan ehtiyatlanan Zakir, həcvin şairə baş ucalığı gətirmədiyini, əksər hallarda həcv yazanın özünün pis vəziyyətə düşdüyünü qeyd edirdi:

Həcvü hədyan ilə ovqat keçirdin, Zakir,
Qorx o gündən olasan ta biədəb zərbi-məsəl.[1]

Bu dediklərimizə misal olaraq Mirzə İsmayıl Qasirin Bakıdan Hacı Seyid Əzimə müxəmməs şəklində yazdığı 23 bəndlik «Saqiya, səndə bu gün mehrü müvəddət görünür»[2] misrası ilə başlayan həcvini, Ələkbər Mehdi Namaz oğlu Qafilin ona cavab olaraq yazdığı 23 beytdən ibarət «Ey olan səltənəti-nəzmə müsəlləm Qasir»[3] misrası ilə başlayan həcvini, yenə də M.Ə.Qfilin Qara Məhəmməd Səfa təxəllüslü şair barəsində dediyi: «Ey səfasız, xütun xari-müğilan olsun»[4] misrası ilə başlayan 30 beytdən ibarət həcvini, Mirzə Rəhim Fənamın Fatma xanım Kəminəyə yazdığı: «Ey təkyə sahibi, nədir bu bəzmi-pürhəvəs»[5] misrası ilə başlayan 9 beytdən ibarət həcvini, Fatma xanımın ona cavab olaraq yazdığı: «Ünsiyyətin bizimlə və vəqət oldu, ey ənəs»[6] misrası ilə başlayan 11 beytlik həcvini, bu münasibətlə M.R.Fənaya cavab olaraq Seyid Əzim Şirvaninin yazdığı: «Agah ol, ey Fənayi-təbəhkarü pürhəvəs»[7] misrası ilə başlayan 21 beytdən ibarət həcvini, M.R.Fənanın ona cavab olaraq yazdığı: «Ey badi-səba,

---

[1] Q.Zakir. Seçilmiş əsərləri. B., 1953, səh. 434.
[2] RƏİ. B-132/1750, vərəq $161^b$ —$163^a$
[3] Yenə orada.$161^b$ —vər. $163^a$.
[4] Yenə orada. vərəq $165^b$ —$166^a$
[5] Yenə orada, vərəq $165^a$
[6] Yenə orada. vər.$166^a$
[7] RƏİ. B —236/10536 $167^b$

xütteyi-Şirvanə sən bir əs»[1] misrası ilə başlayan 33 beytdən ibarət həcvini və sairəni göstərmək olar. Xatırladırıq ki, digər regionalara nisbətən Qarabağ və Şirvan şairləri həmişə bir-birləri ilə yaxşı münasibətdə olmuş, bu şairlər arasında səmimi dostluq və qarşılıqlı ehtiram hökm sürmüşdür. Lakin belə yaxın münasibətə baxmayaraq, bəzən onların da arasında ixtilaf baş vermiş, yaxın dostlar belə bir-birini həcv etməkdən çəkinməmişlər. Belə ixtilaflardan biri də iki yaxın dost, həmişə bir-birini ehtiramla yad edən şirvanlı Seyid Əzim Şirvani ilə qarabağlı Abdulla bəy Asi arasında baş verdi. Buna səbəb isə Asinin Xan qızı Xurşidbanu Natəvanı həcv etməsi oldu. Asinin bu addımı hətta onun ən yaxın dostlarının da hiddətinə səbəb oldu. Düzdür, onun bəzi müasirləri həcvin yazılma səbəbini Xan qızının Seyid Hüseynlə izdivacda düzgün seçim etməməsi ilə əlaqələndirərək təəssübkeş kimi Asiyə haqq qazandırmağa çalışırdılar. Lakin burada Asinin təəssübkeşliyi hiss olunmur. Həcvin ümumi məzmunundan təkcə Xan qızına deyil, ümumiyyətlə xanın bütün ailə üzvlərinə —Natəvanın anası Bədrcahan xanıma, bibisi Gövhər ağaya, qızı Xanbikəyə, yaxın qohumu Fatma xanıma, Sadiq həkimə, kor Həsənə, Məhəmməd, Qubuş və sairəyə dərin nifrət hiss olunur.

Böyük ziyalı F.Köçərli bu hadisə ilə əlaqədar olaraq yazır: «Tarixi —hicriyyənin 1280*-cı (1863/64) illərində Abdulla bəy Qarabağ hakimi Mehdiqulu xanın kəriməsi Xurşudbanu həzrətlərinin şairə xoş gəlməyən bəzi işlərindən, xüsusən Seyid Hüseyn ağanın o dərgahə müqərrəb olmağından rəncidəxatir olub, babası Qasım bəy mədhü tərif etdiyi dürriyektanı həcvə layiq bilib, onun mənində bir parça föhşü latayil söyləmişdi»[2].

Firidun bəyin «Şairə xoş gəlməyən bəzi işlərindən» ifadəsi altında nəyin, hansı işlərin gözləndiyini anlamaq bizim

---

[1] Yenə orada. vər. 13[a]

* F.Köçərlinin göstərdiyi tarix düzgün deyildir. Natəvanın ikinci dəfə 1869-cu ildə ərə (Seyid Hüseynə) getdiyini nəzərə alsaq, həcvin də həmin tarixdən sonra yazıldığını qətiyyətlə söyləyə bilərik.

[2] F.Köçərli. Azərbaycan ədəbiyyatı. B. 1981 II c. səh.117.

üçün də çətindir. Lakin bu da həqiqətdir ki, Qarabağda ictimai mənşəyi uyğun olmayan şəxslərin yuxarı təbəqə nümayəndələrindən olan xanımlarla izdivacı zaman-zaman insanların qınağına səbəb olmuş, çox zaman onları həcv etmişlər. Bir qədər öncə Natəvanın bibisi Gövhər ağanın qatırçı Muradın oğlu Xankişiyə ərə getməsi ictimaiyyətdə narazılıq doğurmuş və bu izdivac Heydəroğlu adlı bir şair tərəfindən həcv olunmuşdur:

Xərmöhrəyə layiq olmayan xər,
Səd heyf, cahanda tapdı Gövhər.[1]

Bu həcvdə Heydəroğlunun təəssübkeşliyi aydın hiss olunur. O, xan nəslindən olan bir xanımın qatırçı nəslindən olan bir şəxsə ərə getməsini qəbul edə bilmir və bunu təkcə xan ailəsi üçün deyil, ümumiyyətlə, bütün ictimaiyyət üçün təhqir hesab edirdi.

Zakir də bu əqidədə idi. O, Hacı Böyük bəyə yazdığı həcvində Heydəroğlunun məqamında söylədiyi bu fikrə şərik çıxaraq yazırdı:

Şükr-lillah, ürəfa sinfi olur azadə,
Ehtiyac ola bilməz sən edən imdadə.
Bir binadır ki, qoyan qoydu bizi bərbadə,
Bəli, yaxşı buyurub Arifi-Heydərzadə:
«Layiqi-möhreyi-xər olmayan aldı gövhər».[2]

Zakir bütün məqamlarda xan nəslinə, xüsusilə də Xan qızına böyük ehtiramla yanaşmış, bir qohum kimi həmişə onun xatirini əziz tutmuş, ən çətin anlarda onun yanında olmuşdur. Natəvan da Zakirə qarşı eyni münasibətdə olmuş, bütün zamanlarda ona ehtiramla yanaşmışdır. Bu qarşılıqlı rəğbətin əsas səbəbi onların yaxın qohum (dayıqızı-bibioğlu) olması ilə yanaşı, istər Mehdiqulu xanın və istərsə də Natəvanın ən ağır günlərində Zakirə və onun ailə üzvlərinə qayğı göstərib köməyini əsirgəməmsi idi. Zakir ona və ailə üzvlərinə gös-

---

[1] RƏİ, B —236/10536 vər. 67[a]
[2] Q.Zakir. Əsərləri. B., 1964, səh. 531.

tərilən bu qayğı və himayəni heç zaman unutmamış, bunu iftixar hissi ilə şeirlərində əks etdirmişdir:

Şikəstə Zakirə veribsiz əmək.
Əmək bilməyəni kor etsin fələk.
Neçə ki, baqidir həyat, gərək
Unutmaya xeyir-duadan səni.[1]

Lakin Natəvana olan bu sevgi və ehtirama baxmayaraq, istər Zakir və istərsə də nəvələri —Azər, Asi, Xudadad bəy onun həyatda atdığı səhv addımlara da biganə qalmamış, müəyyən məqamlarda öz narazılıqlarını açıq şəkildə bildirməkdən də çəkinməmişlər. Onların, eləcə də Qarabağ ictimaiyyətinin Natəvana tutduğu əsas irad ailə seçimi edərkən, yüzlərlə və bəlkə də daha çox say-seçmə pərəstişkarları içərisindən yaxşı tanımadığı, xasiyyətini bilmədiyi, adət-ənənəsinə bələd olmadığı Xasay adlı təsadüfi bir adama ərə getməsi idi. Əlbəttə, bu məsələdə Natəvanı suçlamaq ədalətsizlik olardı. Çünki hadisələrin dərinliyinə varanda məlum olur ki, Natəvan bu addımı öz xoşu ilə atmamış, atasının vəfatından sonra onların ailəsi ətrafında baş verən gözlənilməz hadisələr onu sevib-seçmədiyi bir şəxsə ərə getmək məcburiyyəti qarşısında qoymuşdu. Əfsuslar olsun ki, bu seçimə görə o, bütün ömrü boyu əzab çəkmiş, var-dövlət sahibi olmasına baxmayaraq, özünə firavan və xoşbəxt həyat qura bilməmişdi. İzdivacın ilk günlərindən onların xasiyyətlərinin tutmaması hiss olunmuş, tez bir zamanda ailə münasibətləri pozulmuşdu. Uzun müddət (5 il) onların övladlarının olmaması insanlar arasında söz-söhbətə səbəb olmuş, Xasay xan haqqında müəyyən şaiyələrin yayılmasına zəmin yaratmışdır. İlk gündən bu izdivaca mənfi münasibət bəsləyən Zakir sonralar Xasay xanın Natəvana qarşı etdiyi kobud rəftar və etinasız münasibətindən qəzəblənərək onu həcv etmişdir. O, Rəhim bəy Uğurlubəyova məktub şəklində yazdığı həcvində Xasayın «naqolay» bir şəxs olduğunu, payızda Qarabağa gəlib, yayda Elbrusa qaçmasını, aylarla ailəsini atıb getməsini,

[1] Q.Zakir. Əsərləri. B., 1964, səh. 386.

heç bir zəhmət çəkmədən var-dövlət sahibi olmasını, xeyrə-şərə yaramayan və s. bir şəxs olmasını poetik dillə təsvir etmişdir. Nəhayət, Zakir onların övladları olmaması səbəbini də onda görərək:

Bir ayqır taybağırsaq olsa, at ondan qulun tutmaz,
Budur vəhmim — bizim düxtər gəzə subay, knyaz —[1]

deməklə, Xasayın kişilik iqtidarını itirməsinə işarə vurmuşdur. Göstərilən nümunəyə əsasən həcvin təqribən 1853-54-cü illərdə yazıldığını güman etmək olar. Bu zaman artıq 13-14 yaşlarında olan Abdulla, babası Zakirin Xasay xana olan münasibətini görür və onda ailə haqqında fikir formalaşmağa başlayır. On beş, on altı il keçdikdən sonra, 1869-cu ildə Natəvanın ikinci dəfə ərə gedərkən yenə də öz ictimai mənşəyinə uyğun düzgün seçim etməməsi Şuşa ictimaiyyətini, o cümlədən, Asini də qəzəbləndirir. O, artıq həyatda olmayan babası Zakirin missiyasını üzərinə götürərək ən kəsərli silah hesab etdiyi həcvə əl atır. Lakin o, babasından fərqli olaraq əsas hədəf kimi Natəvanın ərə getdiyi adi papaqçı Seyid Hüseyni deyil, onun özünü seçir.

Həcv Natəvana çatdırılarkən əvvəlcə o özü də inana bilmədi ki, onu həcv edən Abdulla bəy Asidir. Çünki Köçərlinin dili ilə desək, «Asi özü də o qapıda müəzzəz və möhtərəm şəxslərdən biri hesab olunurdu».[2] Həcvin Natəvana çatdırılması haqqında xalq arasında mövcud olan söhbətləri qələmə alan Köçərli yazır: «Belə rəvayət olunur ki, məzkur həcv yazılandan sonra xanlıq imarətində yuva tutmuş göyərçinlərdən birisinin ayağına bağlayıb buraxılıbdır və xanlıq qapısında göyərçinin ayağında bağlanmış kağızı görüb və onu tutub kağızı açıb Xurşidbanu həzrətlərinin hüzuruna gətiriblər. Əvvəlcə haman həcvi Qarabağın özgə şairlərinə isnad veriblər, çünki Abdulla bəydən belə naqolay və çirkin əməl gözləməzdi».[3]

Ancaq şeiri diqqətlə oxuyan Natəvan onun «şiveyi-

---

[1] Q.Zakir. Əsərləri. B., 1964, səh. ___
[2] F.Köçərli. Azərbaycan ədəbiyyatı. B., 1978, səh. 118.
[3] Yenə orada, səh. 119.

lisan»və «üslubi-kəlam»ından hiss edir ki, onun müəllifi Asidir. Xüsusilə «bu nə tavus, nə bulvar, nə İsa bulağı» misrasına əsasən müəllifin Asi olduğuna onda şübhə yeri qalmadı. Çünki bu «...mərhum Qasım bəyin babilər haqqında yazdığı həcvdən bir fərdə nəzirə misalındadır ki, deyibdir:

Bu nə Şiraz, nə Zəngan fücurü fisqin-
Hər tərəf kim, baxasan yoxdu hədü payani...»[1]

Rəvayət şəklində olan bu məlumat sonrakı tədqiqatçıların əsərlərində də təkrarlanmışdır. Lakin istər F.Köçərli və istərsə də bu mövzuya toxunan tədqiqatçıların heç biri həcvin yazılma səbəbi haqqında dəqiq məlumat verməmiş, faktlara deyil, xalq arasında dolaşan söhbətlərə əsasən məsələnin mahiyyətini izah etməyə çalışmışlar. Həcvin yazılma səbəbi haqqında üç fərziyyə söylənilir. Bunlardan birincisi Abdulla bəyin Natəvana elçi düşməsi (Xasay xandan ayrıldıqdan sonra) və ondan rədd cavabı alması, ikincisi, Xan qızından narazı olan bəzi bəylərin təhriki və onu içirib üzə salmaları, üçüncüsü isə xan nəslindən olan bir qızın heç bir ictimai mövqeyi olmayan adi bir papaqçı seyidə ərə getməsindən ibarətdir. Bizim fikrimizcə, Natəvanın Abdulla bəydən 9 yaş böyük olması birinci versiyanın reallığını şübhə altında qoysa da, digər versiyalarda müəyyən dərəcədə həqiqətə yaxın ola bilər. Ancaq bunlarla yanaşı məsələnin kökündə bizə məlum olmayan hansısa bir narazılığın olması fikrini də inkar etmək olmaz. Asinin təkcə Xan qızını deyil, ümumiyyətlə bütün xan ailəsini dərin nifrət hissi ilə həcv etməsi bunu söyəməyə bizə əsas verir.

Asinin Natəvana həsr etdiyi həcvin orijinal variantını əldə edə bilmədik. Ancaq müxtəlif cünglərdə həmin həcv fərqli nüsxələrlə, müxtəlif həcmdə verilmişdir. Hətta onun orijinal hesab etdiyimiz B-3352/4977 sifrli cüngündə Kərim ağanı həcv (vər. $6^a$-$7^a$) verilsə də, Natəvan haqqındakı həcv verilməmişdir.

---

[1] F.Köçərli. Azərbaycan ədəbiyyatı. B., 1978, səh. 119.

Əsas vaiant kimi 1892-ci ildə Şamaxıda yazılmış B–132/1750 şifrli cüngdə olan Asinin Xan qızını həcv və Mirzə Mehdi Nacinin ona yazmış olduğu iki cavab məktubu (həcvi) götürülmüşdür. Burada Asinin həcvi 53 beyt həcmində, Nacinin bir həcvi 83, ikinci həcvi isə 26 beyt həcmində verilmişdir. Lakin Asinin buradakı həcvini digər mənbələrdə olan həcvlərlə müqayisə etdikdə bu variantlar arasında ciddi fərqlər olduğu meydana çıxır. Məsələn, Şuşada İsgəndər bəy Rüstəmbəyov tərəfindən tərtib olunmuş B–236 şifrli əlyazmasında həmin həcv 59 beyt həcmində verilmiş, ümumilikdə isə 17 fərqli beyt meydana çıxmışdır. Şamaxı variantında verilmiş bir neçə beytlər, xüsusilə Natəvanın anası, qızı və yaxın qohumları haqqındakı beytlər orada verilməmişdir. Çox güman ki, cüng müəllifi İsgəndər bəy xan nəslinə olan rəğbətinə görə Natəvanın yaxın qohumları haqqında çox söz-söhbətin yaranmaması üçün həcvin müəyyən hissəsini ixtisar etmişdir.

Nacinin yazdığı cavaba əsasən güman etmək olar ki, Asinin yazmış olduğu həcvin ümumi həcmi 83 beytdən az olmamışdır. Bunu nəzərə alaraq müxtəlif nüsxələr əsasında həcvin ümumi həcmini bərpa etməyə səy göstərdik.

Asi özü də gözləmədiyi halda həcv tez bir zamanda bütün ölkə ərazisinə yayılaraq böyük əks-sədaya səbəb oldu. Ölkənin müxtəlif regionlarında Natəvana qahmar çıxan şairlər Asiyə qarşı etiraz səslərini ucaltdılar. Gəncədən Mirzə Mehdi Naci, Qazaxdan İsgəndər ağa, Şirvandan Seyid Əzim və başqaları qələmə sarılaraq Asini bu əməlinə görə tənbeh etməyə çalışdılar. Bu mənzərənin şahidi olan F.Köçərli yazır: «Asi kimi məşhur alitəb şairdən belə qəbih, naşayəstə əməlin baş verməsi cümləni heyrət və təəccübə saldı və hər yerdən ona cavab yazılıb, şairi bədnam və bihörmət etdirlər»[1]. Hətta dostu Seyid Əzim də Xan qızının təəssübkeşi kimi Asinin bu hərəkətindən hiddətlənərək onunla bütün münasibətlərini pozdu. Bir qədər öncə Asidən dürlü-dürlü şeirlər gözləyən,

[1] F.Köçərli. Azərbaycan ədəbiyyatı. B. 1981, II c. səh. 117

«onun dəri-izzətində qulamı olması ilə fəxr edən» Seyid Əzim həcvdən xəbər tutduqda son dərəcə mütəəssir olaraq «Dəyər» rədifli müxəmməsini yazdı. Müxəmməsdə yenə də onun qüdrətli şair olduğunu dönə-dönə qeyd etdikdən sonra belə istedad sahibinin boş şeylərə vaxt sərf edib həcv yazmasına öz etirazını bildirdi:

Tə'bi-şe'rin ki, sənin şöhrət edib dövranə,
Leyk əfsanəyə sərf eyləməyin əfsanə,
Gəldi bir həcv bu günlərdə yenə Şirvanə,
Demiş idiz onu bir nəsli-əzimüş-şanə
Ki, dəri-dövləti yüz dərgəhi-xaqanə dəyər[1]

Daha sonra S.Əzim Natəvanın Seyidə ərə getməsini irad tutan Asinin bu məsələdə haqsız olduğunu və onların bir-birinə layiq cütlük olduqlarını, eləcə də bu işin canlara dəydiyini tənə ilə ona çatdırdı.

Tapmısız eyb bunu ol gühəri-yektadə
Ki, gedib seyyidə, namusunu vermiş badə.
Bu deyil eyb, təfərrüc eləsəz mə'nadə
Ki, bu xanzadə isə, ol biridir şəhzadə,
Həqqi kim, aləmi-mə'nada bu iş cana dəyər[2].

Bizim fikirimizcə, S.Əzimi hiddətləndirən başlıca amillərdən biri də məhz bu məsələ olmuşdur. Asinin Seyid Hüseyni təhqir etməsinə dözə bilməyən şair onu layiqincə cəzalandırmaq qərarına gəlmişdi. Bu məsələdə Mirzə Mehdi Naci də Seyid Əzimlə həmfikir olmuş və Asini tənbeh etməyə çalışmışdır:

Şimdi gəl, mən sənə ərz eyləyim, ey şair,
Düşmə seyidlə bu miqdar ki, cəddəs Həsənəst
…Asiya, asiyi-dərgahi-Əli olmagilən,
Zülfiqari-Əlidən eylə həzər, tizkəsənəst[3].

Hər iki şair, Naci və S.Əzim Asinin keçmişlərə nəzər salmasını, ata-babasının həllac, pambıqsatan olmasını yada salıb onu bəy mərtəbəyə çatdıran Xan ailəsinə, eləcə də Natəvana

---

[1] F.Köçərli. Azərbaycan ədəbiyyatı. B., 1978, səh.119.
[2] Yenə orada. səh.119.
[3] RƏİ —B -132/1750, vər.158[a]

minnətdar olmaqdansa, onları həcv etməsini bağışlanmaz səhv hesab etmişlər:

Bu haman Xan qızıdır ki, buna yox şübhəvü şək,
Eyləyibdir neçə pambıq satanı dəhrdə bəg.
Gör səni kim bəy edibdir, bir utan adından!
Yoxsa, Asi, çıxıb əyyami-səfər yadından[1]?

Asinin belə bir addım atması onları da düşündürür və bu işin baş vermə səbəbini onlar da anlamır, «Bisəbəb tutdun, əzizim nə üçün bu işi sən?» sualına cavab axtarırlar. Lakin Asi susduğu kimi onlar da bu suala cavab tapa bilmirlər. Onları da təəccübləndirən budur ki, öz xeyirxahlığı ilə bütün insanlara əl tutan və el içərisində «dürri-yekta» kimi ad qazanan bu xeyirxah insan nə üçün məhz atasının sayəsində cəmiyyətdə mövqe qazanan bir ailənin övladı tərəfindən təhqirlərə məruz qalıb həcv edilsin?! O, qadın olsa da kişi qeyrətlidir, dözümlü və mətindir. Məhz bu xüsusiyyətlərinə görə şairlər onu sevir və müdafiəsinə qalxırlar:

Gərçi ol zən dəxi bir şirzəni-yektadır
Ki, bu zənlikdə bizim tək kişidən əladır…[2]

Zən hesab eyləyibən cürət edib həcv etdin,
Genə aslan balasudur, demə ona ki, zənəst
…Demə biqədir ona, qudrəti var qadirdir,
Huşyar ol, əzizim, o nə sən əstü, nə mənəst[3]

Qarabağa, onun insanlarına dərin hörmət bəsləyən S.Əzim öz təəssüf hissini gizlədə bilmir, Asinin tutduğu bu işə təəccüblənərək bunun kişiyə yaraşmayan bir iş olduğunu söyləyir:

Biz eşitmişdik olur əhli-Qarabağ qəyur,
Gözləyər bir-birini işdə bəqədri-məqdur.
Səndə bərəksinə bu əmri-əcib etdi zühur,
Edib öz əhlinizi həcv, həm etmək məşhur,
Arif ol kim, bu rəvuş məşrəbi-ürfanə dəyər.[4]

---

[1] S.Ə.Şirvani. Əsərləri, B. 2005, səh.235
[2] RƏİ. B —132/1750, vər. 159[a]
[3] Yenə orada, vər. 160[a]
[4] F.Köçərli. Azərbaycan ədəbiyyatı. B. 1981, səh. 119.

Belə sərt tənbehlərdən sonra S.Əzim Asiyə öyüd-nəsihət verir, həcvin şairə şərəf gətirmədiyini və həcvə adət etməyin pis bir iş olduğunu ona xatırladır:

Şaira, həcv demək izzətə bir mayə deyil,
Həcvə adət eləmək şairə bir payə deyil.

Şübhəsiz ki, Asi ona ünvanlanmış həcvlərə laqeyd qalmayaraq onlara cavab vermiş, bəlkə də özünə haqq qazandırmaq üçün müəyyən səbəbləri də izah etmişdir. Lakin əlimizdə dediklərimizi sübut edəcək heç bir fakt olmadığı üçün bu barədə fikir söyləməkdə çətinlik çəkirik. Bizə məlum olan həqiqət budur ki, Naci, Seyid Əzim və digər şairlərin Asiyə həcv yazmaları Qarabağ şairlərini hiddətləndirmişdir. Onlar da öz növbəsində həmin şairlərə həcvlə cavab vermişlər. Bu məqama aydınlıq gətirən F.Köçərli yazır:

«Mərhum Abdulla bəy yazdığı həcvə cavab verənlərdən, necə ki, sabiqdə zikr olundu, birisi də Mirzə Mehdi Gəncəvi idi —«Naci» təxəllüs. Gün Naci cümlə Qarabağ əhlinin izzü namusuna toxunub, İbrahim xanın hər gecə bir düxtəri-bakirə almağına işarə qılmışdı, ol səbəbdən şüərayi-Qarabağ ona cavab verməyi özlərinə borc bilib, bu əmri Xarrat Quluya həvalə etmişdilər ki, həcvquluqda onun misli yoxdu və Xarrat Qulu dəxi dörd həcv dalbadal Naciyə göndərmişdi[1].

«Yusifi» təxəllüsü ilə şeir yazan Xarrat Qulu öz kəskin qələmi ilə Naciyə xəbərdarlıq edərək bildirmişdir ki, tutduğun bu qəbahət işə görə «Məclisi-fəramışan» üzvlərinin hər biri, o cümlədən, Növrəs, Mahmud, Fəna, Salar, Sadiq, Ağah, Qara, Nazim, Məhzun, Şəhid, Katib, Aşiq, Məxfi, Həkim, Müznib, Azər, Sabit, Hicri və Vəfa sənə həcv yazmağa hazırlaşır, lakin onların qarşısını hələlik alan mənəm:

Ol xəbərdar yəqin «Beyti-xamuşan» əhli
Hər biri həcv yazıb qulluğuna göndərənəst.
Şiri-dərrəndələrin saxlamışam zəncirin,
Yoxsa rubah şikar etməyə cümlə gedənəst[2].

---

[1] F.Köçərli. Azərbaycan ədəbiyyatı. B., 1978, səh. 130-131.
[2] Yenə orada, səh. 131.

Göründüyü kimi, yerində deyilməyən uğursuz bir həcv böyük əks-sədaya səbəb olaraq bölgə şairləri arasına heç kəsə lazım olmayan nifaq toxumu səpmiş və yəqin ki, uzun müddət həmvətənlərimiz bunun əzabını çəkmişlər. Təbii ki, ən çox əzab çəkənlərdən biri də Asi olmuşdur. Araşdırmalar göstərir ki, işin bu səviyyəyə çatdığını görən şair yaradıcılığının sonrakı mərhələsində qəbahətini başa düşərək həcvə çox meyil etməmişdir. Onun gəlib bizə catan külliyatı içərisində cəmi iki həcvin olması dediklərimizi təsdiqləyir. Asinin ikinci həcvi Kərim ağa adlı şəxsə ünvanlanmışdır. Həcvin məzmunundan göründüyü kimi, Kərim ağa mühüm dövlət vəzifəsində çalışmış, cəmiyyətdə müəyyən mövqe qazanmış bir şəxs olmuşdur. Mənbələrdə Kərim ağanın kimliyi haqqında heç bir məlumat əldə edə bilməsək də, Natəvan irsinin ardıcıl tədqiqatçısı Bəylər Məmmədovun «X.B.Natəvan» adlı əsərində Kərim ağa adına rast gəldik. Bu Natəvanın Xasay xandan olan oğlu Mehdiqulunun qayınatası polkovnik Kərim ağa idi. B.Məmmədov yazır: «1878-ci ildə Natəvanın böyük oğlu Mehdiqulu xan Dunay ordusu sıralarından vətənə məzuniyyətə qayıdıb Şuşada polkovnik Kərim ağanın qızı Səltənətbikə xanımla evlənir».[1]

Həmin məlumatdan Kərim ağanın da xan ailəsinə yaxın bir şəxs olduğu müəyyənləşir. Bu da aydın olur ki, Natəvanla Kərim ağa təzə qohum olan zaman, yəni 1878-ci ildə, Asi artıq dörd il idi ki, dünyasını dəyişmişdi. Həcvdə adı çəkilən Kərim ağanın dəqiq həmin şəxs olub-olmaması haqqında qəti qərar vermək fikrimizcə, düzgün olmazdı. Ancaq onu qeyd edə bilərik ki, tərkibbənd şəklində yazılmış bu həcv yüksək sənətkarlıqla qələmə alınmışdır. Burada Kərim ağanın qanmaz, heç kəsin xeyrinə-şərinə yaramayan, əlindən yalnız pislik gələn bir şəxs kimi təsvir olunması ilə yanaşı, məhz bu kimi şəxslərin sayəsində ariflər məskəni olan Qarabağın bədnam olması da qeyd edilir:

[1] B.Məmmədov. X.B.Natəvan. B., 1983, səh. 70.

Sən tək eşşək, adın edib bədnam,
Yoxsa, arif məkanıdı Qarabağ.

Asi sonralar həcv yazmasa da, yerində olmayan bəzi insanlar onun iti qələmindən çəkinərək, şairlə ehtiyatla davranmağı üstün tütmüşlar. Xalq arasında günümüzə qədər gəlib çatan hekayətlər də bunu sübut edir.

Mənbələrin verdiyi məlumata görə Asi son dərəcə hazırcavab, bədahətən şeir demək qabiliyyətinə malik istedadlı bir şair olmuşdur. Onun yaradıcılığının bir qismini təşkil edən fərdlər qeyd etdiklərimizi bir daha təsdiqləyir. Günümüzə qədər şairin farsca 150-yə yaxın, azərbaycanca isə 5-6 fərdi gəlib çatmışdır. Fərd yazmaq şairdən böyük istedad və məsuliyyət tələb edir. Çünki fərdlər bir qayda olaraq son dərəcə yığcam olması, özündə dərin məna yükü daşıması və yaddaqalımlığı ilə digər şeir növlərindən seçilir. Fərdlərin əhatə etdiyi mövzu dairəsi geniş və rəngarəngdir. Bu mövzular dini-əxlaqi, ictimai-siyasi, hikmətamiz-tərbiyəvi olmaqla demək olar ki, insan həyatının, onun yaşadığı cəmiyyətin bütün sahələrini əhatə edir. Asinin yaratmış olduğu fərdlərdə də bu xüsusiyyətləri aydın şəkildə müşahidə etmək olar. Şair fərd yazarkən şifahi xalq danışıq dilində olan atalar sözləri, misallara müraciətlə yanaşı öz düşüncə tərzi səviyyəsində atalar sözləri məqamına ucala biləcək hikmətamiz deyimlər də yaratmağa cəhd göstərmiş və demək olar ki, hardasa buna nail ola bilmişdi.

Məlamət bər del-e şədpare-ye aşeğ bedan manəd
Ke başəd zəxm-e şəmşir-o bedu zənədəş besuzən həm.
(ürəyi yüz parə olan aşiqi danlamaq ona bənzəyir ki,
qılınc yarası olana iynə də batırsınlar)

Yaxud:

Vəsli ke, dər u məlal başəd,
Hicran beh əz an vüsal başəd
(Kədəri olan vüsaldan hicran yaxşıdır)

Asi məişətdə işlənən atalar sözlərindən istifadə etdikdə isə onları olduğu kimi təkrarlamır, yaradıcı şəkildə yanaşaraq

onlara yeni bədii çalar verir. Məsələn, xalq arasında geniş şəkildə işlənən «Dil yarası sağalmaz» deyimi Asi şeirində belə səslənir:

Cərahəti ke ze tiğ-e zəban rəsəd be deli,
Be hiç məlhəm rahət, niku nəxahəd şod.
(Dil qılıncından ürəyə vurulan yara
Heç bir məlhəmlə rahat olub sağalmaz)

Asinin farsca yazdığı fərdlərdən fərqli olaraq, onun Azərbaycan dilində yazdığı fərdlərinin hər biri müəyyən hadisə ilə bağlı olaraq yarandığı üçün xalqın yaddaşına həkk olunmuş, əvvəlcə şifahi şəkildə dillərdə dolaşmış, sonralar isə yazılı ədəbiyyata gətirilmişdir. Yazıçı Y.V.Çəmənzəminli, tədqiqatçı alimlər: F.Köçərli, K.Məmmədov, B.Məmmədov, S.Rüstəmoğlu və başqaları öz əsərlərində bu fərdlərin yaranma tarixi ilə əlaqədar məlumatlar və şərhlər vermişlər. Son dərəcə maraqlı tarixçəsi olan bu fərdlər dövrün tanınmış, nüfuzlu şəxsləri ilə əlaqədar olaraq yazılmışdır. Bunların içərisində şairin dostları ilə yanaşı, onu sevməyən, lakin iti qələmindən ehtiyatlanaraq susmağa məcbur olan insanlar da olmuşdu. Asi bu fərdlərlə bəzən sosial ədalətsizliyə qarşı çıxaraq ədaləti bərpa etməyə çalışmış və qismən də olsa buna nail ola bilmişdi. Buna misal olaraq onun Şuşada böyük nüfuzu olan Bəhmən Mirzəyə yazdığı fərdin yaranma tarixinə nəzər salmaq birzcə kifayət edər: Şorgözlükdə heç də babası Fətəli şahdan geri qalmayan Bəhmən Mirzə ailə üzvlərinə qarşı son dərəcə sərt münasibət bəsləyir, onları ciddi nəzarətdə saxlayırdı. Lakin buna baxmayaraq, onun qızlarından biri ilə Əhməd bəy adlı bir tələbə arasında sevgi macərası baş verir. Bundan xəbər tutan Bəhmən Mirzə gənc Əhməd bəyi tutdurub öz evinin zirzəmisinə saldırır və onu İran dövlətinin qanunları ilə cəzalandıracağını bildirir. Şuşanın adlı-şanlı adamlarının xahişinə baxmayaraq o dediyindən dönmür. Nəhayət, işə Abdulla bəy Asi qoşulmalı olur. Bunun üçün o həmin hadisə ilə əlaqədar yazdığı növhəni bir dəstə gəncə əzbərlədir və özü də onlarla birlikdə ucadan növhə deyə-deyə

Bəhmən Mirzənin evinin qarşısına gedirlər. Növhənin ilk beytini:

Gəlmişik meydanə biz əllərdə tiği-intiqam,
İstərik şahzadədən bakirə düxtər qanlısın.

- eşidən Şahzadə Bəhmən Mirzə el içində biabır olmaqdan qorxaraq dərhal Əhməd bəyi azad etdirir.

Asinin daha bir fərdi də Bəhmən Mirzə ilə əlaqədar olaraq yazılmışdır. Şuşada çoxları Xan qızı Natəvanla ailə qurmaq arzusunda olmuşdu. Xüsusilə Natəvan ilk əri Xasay xan Usmiyevdən ayrıldıqdan sonra bu təşəbbüsdə olanların sayı daha da çoxalmışdı. Onlardan biri də Bəhmən Mirzə idi. Natəvandan yaşca çox qoca olan və ondan rədd cavabı alan Bəhmən Mirzə də digər «aşiqlər» kimi onun qatı düşməninə çevrilmişdi. Həmin ərəfədə Asinin Xan qızını həcv etməsi bir çoxları kimi onu da sevindirmiş və bu münasibətlə Asiyə hədiyyə verəcəyini sifarişlə ona çatdırmışdı. Bir gün onlar təsadüfən hamamda rastlaşarkən Bəhmən Mirzə onun yazdığı həcvi çox tərifləmiş və fəaliyyətini yüksək qiymətləndirmişdi. Görüş zamanı heç bir söz deməyən Abdulla bəy hamamdan yarımçıq çıxmış və aşağıdakı fərdi Natəvana yazdığı həcvin rədif və qafiyəsində yazaraq Bəhmən Mirzənin paltarlarının üstünə qoyub getmişdi:

Sevinirsənmi, köpək, Xan qızını həcv elədim,
Səni də həcv edərəm ……… kim kəsənəst?!

Asinin xeyirxah məramla yazdığı fərdlərdən biri də Şuşada yetim uşaqlara ianə toplamaq kompaniyasında iştirak etmək istəməyən varlı bir hacı ilə əlaqədar olaraq yaranmışdı. Hacının bu hərəkəti Asiyə bərk təsir etmiş və ona görə də aşağıdakı fərdi yazaraq ona göndərmişdi:

Tövbə, vallahi əgər Kə'bə üzün görmüş ola,
Bu hara, Kə'bə hara, öylə məkan, böylə tula?!

İşin ciddiliyini başa düşən Hacı dərhal əl-ayağa düşərək ianəni artıqlaması ilə vermiş və minnətçi salaraq Asidən şeirin ardını yazmamasını xahiş etmişdir.

Asinin dostlarına yazdığı fərdlər də var. Bu fərdlər əvvəlkilərdən özünün mülayimliyi və incə yumoru ilə fərqlənir.

Belə fərdlərdən biri yaxın dostu, Ağdamın Pərioğullar kənd sakini Abbas bəyə ünvanlanmışdı:

Ünas adı ilə zikr olmağın nöqsanı vardır zatə,
Yapış Pəri yaxasından ta kim, sənə pədər tapsın.

Şair burada kəndin qadın adı ilə adlandırılmasından məharətlə istifadə edərək dostunu çətin vəziyyətə salmış və öz hazırcavablığını bir daha nümayiş etdirmişdir.

Yuxarıda qeyd etdiyimiz kimi, Asi Şamaxı şairləri, xüsusilə Seyid Əzimlə yaxın dostluq əlaqəsində olmuşdur. Onlar tez-tez şeir-sənət məsələləri ilə bağlı fikir mübadiləsi aparmış və hətta həyatda yol verdikləri ayrı-ayrı günah və ya səhvlərinə görə bir-birinə həcv yazmaqdan da çəkinməmişlər. Seyid Əzimin nisbətən yeni tipli məktəbə müəllim təyin edildiyini eşidən Asi növbəti dəfə fürsətdən istifadə edib ona sataşmaq məqsədilə farsca bir fərd göndərmişdi:

Şenidəm ke, bər piri keşiş-e deyr şodi,
Xoş be hal-e şoma, aqibət be xeyr şodi.
(Eşitdim ki, qocalıqda kilsə keşişi olmusan,
Xoş sizin halınıza ki, aqibətiniz xeyir oldu)

Əlbəttə, Asinin mütərəqqi bir şəxs olduğunu bildiyimiz üçün bunu onun yeniliyə qarşı mənfi münasibəti kimi qiymətləndirmək düzgün olmaz. Sadəcə olaraq, burada şairin məqsədi məqamından istifadə edərək xəfif bir yumorla dostuna sataşmaq olmuşdur.

Asinin əsərləri içərisində bir sıra dini şeirlər də (növhə və mərsiyələr) günümüzə qədər gəlib çatmışdır. Bu şeirlərdə əsasən Kərbəla hadisələri və onun birbaşa iştirakçısı olan imam Hüseynin faciəsi təsvir olunur. Bununla yanaşı, Asinin fars dilində yazdığı dini məzmunlu bir qəsidəsi isə Peyğəmbərin şiələr arasında xələfi hesab olunan Əli Əleyhüssəlama həsr olunmuşdur. Bu qəsidədə Əlinin böyük nüfuz və qüdrət sahibi olduğu, onun möcüzələri tam şiə təəssübkeşliyi ilə müəllif tərəfindən mübaliğəli şəkildə təsvir olunur. Asinin bu mövzuda yazdığı şeirlər bir daha təsdiq edir ki, o dinsiz, Allaha asi bir şəxs olmamış, əksinə, çoxlarının din yolunda edə bilmədiklərini o böyük uğurla həyata keçirmişdir. Onun

aşiqanə lirik şeirləri ilə yanaşı, dini mövzuda yazdığı mərsiyə və növhələri də dillər əzbəri olmuş, ən mötəbər mərasimlərdə oxunmuşdur.

Son olaraq qeyd edirik ki, Abdulla bəy Asi istər klassik və istərsə də aşiq şeiri üslubunda gözəl əsərlər yaradan, şeirimizin hər iki qanadını paralel aparan dəyərli sənətkarlardan biri olmuşdur. Şübhə etmirik ki, onun zəngin ədəbi irsi olmuş, lakin bir çox digər şairlərimiz kimi onun da əsərlərinin əksər hissəsi itdiyi üçün müasir oxuculara gəlib çatmamışdır. Onun yüksək sənətkarlıq qabiliyyətinə malik olması dediklərimizi bir daha təsdiq edir.

## QƏZƏLLƏR

Yarar, gər alsa yüzün cümlə xublardan bac.
Neyçin ki, xosrovu-hüsnün başına sənsən tac.

Qulami-xalü xəttin hindivü zəngibarü həbəş,
Veribdi Çin ilə Maçin çini-zülfə xərac.

Xətadı zülfi-siyahınla miski tən tutmaq,
Anın şəbahəti vermiş ətiri-mişkə rəvac.

Gözün mərizinə innabi-ləldir məcun,
Əgər ki, gəlsə Fəlatun, yox ondan özgə əlac.

Kaman qaş götürüb türki-çeşmi bədməstin.
Könül qəzalın edib tiri-qəmzəyə amac.

Məqami-sidreyi-zülfündə yanmıyınca pəri,
Edərmi qürb rüxə Cəbraili-dil merac.

Çəkincə şamü səhər hicr düzəxində əzab,
Behişt vəslində, Asi, ölüb qalaydın kac.

*********

Rəhm qılmaz halıma xara könül, xunxar göz.
Sanma olmuş müztərib bica könül, ağlar göz.

Gah-gahi nərm olur könlün çu hali-zarimə,
Eyləyir, gər eyləsə haşa könül israr göz.

Xublar zülfünə deyərdim verməyim könlüm, vəli,
Qoymaz asudə məni rüsva könül, bimar göz.

Gər səgi-kuyinlə həmməşrəb olam dərgahda,
İstəməz bil, cənnətül-mava könül, ənhar göz.

Asiya, gər göz köz olsa gözlərindən, kor ola,
Çünki mayildir ona şeyda könül, xunbar göz.

*********

Rüsvalığıma gərdişi-peymanədi bais,
Mey içməyə ol nərgisi-məstanədi bais.

Cəmiyyəti-zülf içrə könül oldu pərişan,
Şan-şan ola, bu zülmə genə şanədi bais.

Eşqimdən olub hüsnü rüxum aləmə məşhur,
Gül şöhrətinə bülbüli-divanədi bais.

Əfqan edərəm münca, genə bəxtim oyanmaz,
El uyğusuna rəsm imiş, əfsanədi bais.

Dün tövbə veribsən mənə, qəhr eyləmə görsən
Meyxanədə, zahid, demə peymanədi bais.

Təsbihü rida xaneyi-xummardadır rəhi,
Varsam ona  gər sübheyi-səddanədi bais.

Dil mürği görüb zülf ara, Asi, genə xalın,
Gər damə düşə, qətlinə bir danədi bais.

*********

Ülfət xətadı şiveyi-çeşmi siyahilən,
Min ev yıxar baxanda bir oğrun nigahilən.

Çahi-zənəxdə könlüm arar genə hüsnün,
Yusif həvası ilə dutub üns çahilən.

Olmuş siyahpuş könül sanki istəyir
Ülfət tuta bu rəng ilə ol zülfi —siyahilən.

Tiği —kəc ilə döndərəsən taği-əbruyuna,
Mehrabə səcdə  eyləyəni iştibahilən.

Etmə xiyali-busə yüzindən, könül, sağın,
Mirati-zat zəng dutar dudi-ahilən.

Yol bul sərrad qat cəmalə o mahdan,
Yetmiş Xəlil qürbə, könül, mehrü mahilən.

Asi xəyal edir ki, yetə xaki-payına
Qürbi-gəda məhaldır hərçənd şahilən.

*********

Hicri-ləbində bir məhin, ey saqiyi-fərxəndəpey,
Qan oldu könlüm qönçətək bir dəm gətir
minayi-mey.

Bir dilbəri-Leylavəşin eşqində Məcnun olmuşam,
Vəcdilə olmuş mənzilim gəh vəcdü gəh ehraf hey.

Ruyinin qəmindən bənd-bənd atəş düşübdür canıma,
Nal oldu cismim nalədən, ey bivəfa, manəndi-ney.

Aşüftə dellər məcmə'i-zülfi-pərişan şərhini,
Yüz piçü tabə düşdülər, heç etmədi bir kimsə tey.

Bir gül'üzarə dil verib bülbül məgər gülzar ara,
Əfqan edər şamü səhər çün əynü əlifü sadü yey[1].

*********

Zahida, güşeyi-məsciddə nəyim var mənim?
Bərbətü çəngü dəfü nayü neyim var mənim.
Kövsəri vədə edirsən mənə gərçi nisyə,
Nəqd dəstimdə bu gün cami-meyim var mənim.

Hurü qilmanını çox vəsf eyləmə minbərdə,
Gör neçə saqiyi-fərxəndəpeyim var mənim.

---

[1] Əyn, əlif, sad və ye «Asi» sözünün yazılışında istifadə edilən hərflərin adlarıdır.

Nə üçün Kə’bə üçün kuhü biyabani gəzim?
Meykədə mənzili-Leyladi, heyim var mənim.

Yığılıb müğbeçələr piri-muğan dövrünə,
Düxtəri-nə’ş[1] arasında Cüdeyim[2] var mənim.

Asiya, meykədə küncün özünə məskən edib,
Nüsrəti-mülki-Kəyavüsü Keyim var mənim.

*********

Oldun əsiri-həlqeyi-zülfi-duta, könül.
Etdin qara günüm, yüzün olsun qara, könül.

Munca dedim ki, xali-siyəhfama etmə meyil,
Pəndim eşitmədin mənim, ey bihəya könül.

Sevdayi-danə saldı səni dami-zülfinə,
Bu zülmü canıma necə gördün rəva, könül?

Əcrindi, çək qiyamətədək şanə çövrünü,
Düş piçü tabə hər dəm əsəndə səba, könül.

Həlqə urubdu cəmiyyəti-zülf qətlinə,
Amadə ol həlakına, ey binəva könül.

Sevdayi-xaldan degil asudə Hindü Şam,
Aşüftəhali-zülfdü Çinü Xita, könül?
Munca səbadan, Asi, onu eyləmə soraq,
Bir yerdədir əsir ki, olmaz rəha könül.

*********

Arizində gözüm ol zülfi- səmənsayə baxar,
Nuri-xurşidə müqabil şəbi-yeldayə baxar.

---

[1] Kiçik Ayı bürcü
[2] Qütb ulduzu

Vəsl əyyamı qaşın tağına dil göz tikmiş,
Eyd olanda kişi, adətdi yeni ayə baxar.

Qönçə sirri-dəhanın rümuzunu bilmək istər,
Leyk ləbbəstədi, san şərhi-müəmmayə baxar.

Mubəmu gəzdi səba, tapmadı könlümdən əsər,
Nə qədər piçü xəmi- zülfi-mütərrayə baxar.

Nərgisin gülşən ara xirələnibdir çeşmi,
Saralıb rəşk ilə ol nərgisi-şəhlayə baxar.

Adəm istərdi tapa qəddinə həmta bir sərv,
Ol səbəbdəndi gedib rövzədə tubayə baxar.

Asiya, ömrünü sərf eylə rəhi-eşqində,
Bu ümid ilə ki, bir gün məni –rüsvayə baxar.

*********

Əla, ey şuxi-şirinkarü bihəmta, xudahafiz.
Qəmi-eşqində bəsdir olduğum rüsva, xudahafiz.

Nə qədri nəğd səbrim var idi sərf oldu eşqində,
Tükəndi mayə, bir sud etmədi sevda, xudahafiz.

Nə məndə tab var kim, səbr edim bu daği-hicranə,
Nə cövrü zülmdən var səndə bir pərva, xudahafiz.

Rəqibi-divsurət qoymadı firdovsi-kuyində
Dərəm bir ləhzə vəslindən güli-həmra, xudahafiz.

Hərimi-kuyinə məhrəm olub əğyar, mən məhrum,
Qəbul eylər bu zülmü qeyrətim haşa, xudahafiz.

Səgi-kuyin ənisi olmağa oldu könül qane,
O həm ram olmadı məni-bikəsə əsla, xudahafiz.

Səri-kuyində məskən dutmağa Asi degil layiq,
Bu gündən böylə əğyar eyləsin mava, xudahafiz.

*********

Nə növ alə gözündən gözüm göz alə, Qara.
Salıb o xəstəni ol nəzəri —gözalə, Qara

Pozub düzər nə qədər çərx mahi-ənvərini,
Görər yüzün kimi olmaz, salır vəbalə, Qara.

Rəcimdir üzünə zahid etməsə səcdə,
Neyçin ki, münkir olub məzhəri-cəmalə, Qara.

Müsəxxər etmədə, ey şah, hüsn iğlimin,
Xəttin səvadıdı bir mötəbər qəbalə, Qara.

Nə qədər hüsn veribsə sənə müqəddəri-küll,
Yüz anca eşq qılıbdır mənə həvalə, Qara.

Satardı görsə Züleyxa bu nuri-rüxsarı
Dübarə Yusifi bir rismani —zalə, Qara.

Xiyali-muyi-miyanınla cismi —Asiyi-zar.
Zəifdir o qədər, gəlməyir xiyalə, Qara.

***********

Qoyma ey qaşı, gözü, xalü xətti qarə, Qara.
O qara zülf, qara sayə sala qarə, Qara.

Şiveyi-nərgisi-xumarına verdim könlüm,
Tapşıdım səhv ilə bimarımı bimarə, Qara.

Könlümə bəsdi, səba zülfü pərişan etsə,
Qoyma şanə dəxi dəysin o siyəhkarə, Qara.

Nur kəsb etmək üçün şə’şəyi —hüsnündən,
Məhü xurşid gəzər çərxdə avarə, Qara.

İstəməz göz göz ola gərci güli-ruyindən,
Leyk yox səbr günü taqəti-təttarə, Qara.

Nəçidir Yusifi- Misri sənə həmta olsun,
Bir qulamındı, çəkiblər onu bazarə, Qara.

Qanı gül-gül tökülə gül desə Asi yüzünə,
Nə rəvadır ki, gülü nisbət edə xarə, Qara.

***********

Edib sərvi-rəvanım bağara bərpa qiyamətlər,
Çəkib qamət, verib şümşadü sərvə yüz xəcalətlər.

Qaçıb bir küncdə xofilə durmuş nərgisi-şəhla
Ki, nuri-vahidi dərk eyləməz hər bibəsarətlər.

Urub hüsni-ruxindən dəm məhi-Kənan düşüb çaha.
Budur əcri edə sultanına hər qul xəyanətlər.

Şəbi-hicran yetişsə sübhi-vəslə zülf cövründən,
Edərdim ol məhi-bimehrə tulani şikayətlər.

Pərişan etmə könlüm cəm ikən zülfi-siyah içrə,
Səni Tari, səba, ol natəvana qıl inayətlər.

Şəbi-hicran ara ahım sütuni —Bisütun olmuş,
Neyçin kim baş çəkər məndənvəfasız sərv-qamətlər.

Turunca fərq qoymazsan inədən görsən ol mahı
Götür Asidən əl, naseh, əbəsdir bu məlamətlər.

***********

Xaldır ruyində, ya təhrir edən saətdə xət,
Kilki-qüdrətdən rüxi-xurşidə düşmüş bir nüğət.

Gözlərim baxdıqca xətti-səbzinə rövşən bulur,
Gərçi çox nəzzarə qılsan tirə eylər çeşmi xət.

Nola qəddin həsrəti gər tutsa mənzil can ara,
Rəsmi-xəttdir ləfzi-cana əlif olur hərfi-vəsət.

Cəzbeyi-eşq oldu Leyli məhməlinə sariban,
Çəkdi Məcnun sarı, sanma nağe rah etmiş qələt.

Asiya, ləli-ləbindən sor dəvayi-dərdi-dil,
Zəhri-hicrə yoxdu bir təryaği-nafe bu nəmət.

***********

Kimdi tuba eyləsin ol qəddi-mövzun ilə bəhs,
Ya nədir xurşid edə rüxsari-gülgun ilə bəhs.

Qoyma kim dursun müqabil ruyinə ayinəni,
Etməsin ayineyi-əltafi-biçun ilə bəhs.

Rəngi xəclətdən qızarmış, bəzmdən çəkmiş əyağ,
Badə guya eyləmiş ol ləli-meygun ilə bəhs.

Kakilinin valeylin şərhində sərgərdan qalıb,
Etmişəm bu üqdədə zülfüncə Məcnun ilə bəhs.

Çöhreyi-zərdində gülgun əşkdir simu zərin,
Kəsrəti-dövlətdə, Asi, eylə Qarun ilə bəhs.

************

Daima məni - zardan ol dilbəri-bədxu qaçar,
Guyiya səyyad görmüş, rəm qılıb ahu qaçar.

Yoxsa bilmiş kim degildir saz yarə müşkilə,
Rəhm edib zəxmi-dərunə yari-mişkinmu qaçar.

Bilməzəm, aya, necə zülfünlə xu dutmuş könül,
Rəsmdir, çun harda bir şahin görə teyhu qaçar.

Söleyi-ruyinlə məhvəşlər dəm urmaz hüsndən,
Guyiya kim möcüzi —Musa görüb, cadu qaçar.

Gizlənib könlüm hücumi-dərdü qəmdən zülf ara,
Xofdan divanə harda görsə hayü hu, qaçar.

Sərvqədlər içrə guya görməyib sən sərvəri,
Qumrivəş dil axtarır, hər su deyib gu-gu, qaçar.

Asiya, görmüş ki, gül ol gülruxə həmta degil,
Bəhs etməkdən səninlə bülbüli-xoşgu qaçar.

************

Edər sehr ilə daim bu xəta kanı qara gözlər,
Könül şəhrini yəğma türki-türkanı qara gözlər.

Genə sultanı-hindutək sipəhi-xəttə hökm etmiş
Ki, dutsun dövri-ləlində Bədəxşanı qara gözlər.

Qəzali-Çinə bənzətdim bu cadunu, xəta etdim
Ki, anda kəc nigahının şivəsi hanı, qara gözlər?

Könül məcmu ikən zülfi-pərişanda edər dərhəm,
Nə təqsir eyləyib, bilməm bu zindanı,
qara gözlər?

Verib baş-başa Asi qətlinə daim müsəmməmdir,
Bu yekdillikdə yoxdur onlara sanı, qara gözlər.

************

Könül, hər dəm baxanda ol pərinin ləli-nabına,
Olur meyli füzüntər saqinin cami-şərabına.

Kənari-cudə bağ içrə vətən tut kim, görən kəslər
Desin təhvil edib xurşud çərxin bürci-abına.

Səba,  tənha cəfayi-şanə bəsdir bu dili-zarə,
Tərəhhüm eylə sən həm, bais olma iztirabına.

Sənə yüz kəz dedim kim, mayil olma zülfi-pürçinə,
Nəsihət dutmadın, səbr eylə kaş, ey dil, əzabına.

Yüzin təfsiri-safidir, ona subhani-rəhmanın,
Nə qədri ayeyi-rəhmət yazılmış dörd kitabına.

Olub şəhmar zülfün, atəşin rüxsarinə mötad.
Neyçün bəs qıvrılır, bais nə olmuş piçü tabına.

Xiyali-arizin çıxmazsa könlümdən nola, ey gül,
Urar şəh ximegəh təmir üçün mülki —xərabına.

Nə qədri kim, sorar Asi ləbi-ləlindən, almaz söz,
Yapışmışdır həlavətdən, açılmaz söz cəvabına.

************

Yetirsə bağibani-sün əgər min nəxli-tubatək,
İnanmam, rast söz, rəna ola ol sərvi-balatək.

Görüb ləli-rəvanbəxşin hədisi-möcüzün guya,
Əyaq çəkmiş cahandan çeşmeyi-heyvan Məsihatək.

Qəddinin fikri iki gözdən edib xunabi-qəm cari,
Şikaf etmiş bu dəryanı əsa hökmilə Musatək.

Olur Məcnun mənimtək cümlə aqillər, tülu etsə,
Yüzinin vəşşəmsi leyli-zülfdən, ey mah, Leylatək.

Qəddi-sərvə əbəs zinət vurur məşşateyi-qüdrət,
Əlif hərgiz olarmı zib ilə ol qəddi-zibatək.

Sənəmlər həmdəmimdir, gəlsə Yusifsurətim nagah,
Necə pünhan edim ol bütləri, aya, Züleyxatək.

Göz açmaz mehrdən, ey məh, yüzin müştaqıdır Asi,
Edə min məhvəs ərzi hüsni-mehri-aləmaratək.

************

Könül Mənsurinə qurmuş mahcəbinim dar zülfündən.
Kəməndi-xəmbəxəm boynuna salmış tar zülfündən.

Məgər dün sübh, şanə səxt dəymiş, eyləmiş dərhəm,
Gəlir güşə hənuz ahi-dili-bimar, zülfündən.

Nə edim? —Yox çarə, dövri-künci-ruyin sərbəsər tutmuş,
Nə əfsun eyləyim kim, qurtarım şəhmar zülfündən?

Məni imanıyoxlar mən’ edərlər küfri-zlfündən,
Deməz əl çəkməzəm Sənansifət zünnar zülfündən.

Olub divanə Asi bir pərinin iştiyaqında
Uzun illərdi bir sevda başında var zülfündən.

*************

Ey ləbi-ləlin şərabi-nabi-səhbatək ləziz,
Həm zülali-Xızrü həm eynən təsəmmatək ləziz.

Ləfzi-canbəxşin edən saətdə şəkkərbarlıq,
Tutiyi-can kamına şəhdi-müsəffatək ləziz.

Eyləməz şirbirinci - laməkana dil təmə,
Bavər etməz kim, ola ləli-şəkkərxatək ləziz.

Mürdə cismin ləli-nabından bulur daim həyat,
Ey hədisin möcüzi-nitqi-Məsihatək ləziz.

Aldanıb firdövsə, Asi, etmə eşqin tərk kim,
Hiç nemət yoxdu vəsli-yari-zibatək ləziz.

*************

Müşkdür mah üzrə bilməm, yoxsa zülfün ruy ara.
Ya ki, sehr ilə çəkibsən dara mehri muy ara.

Şanə xofundan siyəhpuşü pərişandır könül
Kim, bu rəng ilə dolansın zülfi-ənbərbuy ara.

Xəm qəddilə qalmışam kuyində heyran, ey əcəb,
Quy çovkan içrə acizdir, nə çovkan quy ara.

Zahidi-kəcbəhsə baxma, ey könül, dut rahi-rast,
Fərq var mehrab ilə ol qibleyi-əbruy ara.

Asini xar eyləyib ol şuxə bənzətmiş gülü,
Bəhs anınçün var onunla bülbülü-xoşguy ara.

*************

Ey gənci-hüsn üstə yatan şahmar zülf,
Bir ləhzə, tarı xatirinə, ol kənar, zülf.

Aşüftəhaldır sitəmindən Xitavü Şam.
Maçinü Çinü Hindü Həbəş, Zəngibar, zülf.

Ey şanə, mubəmu gəzibən eylə cüstucu,
Gör handa eyləyib dili-miskini zar, zülf.

Mərdümlük eyləyir genə filcümlə gözlərin.
Likən yüzüqaralıq edibdir şüar, zülf.

Yüz vermə, sal ayağına al intiqamını
Kim, könlümü bəlalara qılmış düçar, zülf.

Ləşgər çəkibdi xalü xəttü çeşmi qəmzədən.
Dil kişvərin yəqin edəcək tarü mar, zülf.

Rüsva nə növ' olmasın Asi cahan ara.
Razi-nihanın eyləmiş aşikar zülf.

*************

Əzizi-Misirdən Yusifcəmalım bac istər,
Xitavü Çindən zülfü bəxaşişü xərac istər.

Töküb zəhri-həlahil kami-cana əfi zülfün,
Könül təryaği-ləlindən o məsmumə əlac istər.

Ləbin dövründə xalından könül, ey qibleyi-üşşaq,
Dilər mətləb anıntək kim hicrdən mirhac istər.

Tökər az cürm üçün çeşmi-siyahməstin könül qanın,
Dolanmaq tündxu bimar ilə qayim məzac istər.

Qalıb sərgəştə zülfün zülmətində nabələd könlüm,
Səri-rahına nur arifin tutsun sirac istər.

Düşüb bir tazə sevdayə, pərişanlıq qılıb adət.
Məgər cəmiyyəti-zülfinlə könlüm imtizac istər.

Səri-kuyində Asi, yüz qoyub xak üzrə dut məskən.
Vəfadan dəm vuran aşiq məgər rəxti-dəvac istər?

*************

Səba, yetir bu pəyamı o sərvi-azadə
Ki, qıldı könlümü qəddin fəraqı üftadə.

Dərində münca gecə sübhədək fəğan edərəm.
Nədəndi rəhm eyləməzsən bu ahü fəryadə.

Misali - margəzidə sızıldaram şəbi-hicr.
Düşər o zülfi- siyəhin çu hər zaman yadə.

Girib behişti-bərrin içrə meyli-hur etməz,
O kəs ki verdi könül sən kimi pərizadə.

Görəndə ləli-ləbin saqi qaçdı bir tərəfə,
Xəcalətdən əyağ çəkdi bəzmdən badə.

Çü türki-məst gözün ox çəkib, kaman tutmuş,
Olubdu qətlinə biçarə könlüm amadə.

Qəmü fəraqə dəva yox təbibdən, Asi,
Budur əlac, gedim padşahımə dadə.

*************

Olmuş məqamı zülfi-pərişanı könlümün.
Bir dəm kəsilməz ah ilə əfqanı könlümün.

Rəhm eylə, səxt dəğmə, səba, tari-muyinə,
Ol piçü tabə tabı görüm hanı, könlümün?

Zünnari - zülfünə uyuban küfrə uğradı
Salim qalır nə növ bəs imanı könlümün?

Mötad olub qara günə, zülfündə xoş keçər,
Min zülm yetsə şami-qəribanı könlümün.

Kuyində, Asiya, bu qədər nalə eylərəm,
Təsir edərmi ol məhə əfqanı könlümün?

*************

Zülməti-zülf ara, könül, nuri-rüxi-cəmilə bax,
Oldu dəlil mehrü mah qürbincə Xəlilə bax.

Zülfdə dillə ruy ara girdi səba, əyağ qoyar
Pərdeyi-liməəllah, cürəti-Cəbrailə bax.

Həlqeyi-zülf şərhini bilmədi muşikaflar,
Munca kəşakəş etdilər, ortada qalü qeyilə bax.

Eyləsə Turi - hüsndə dost üzarın aşikar,
Heybəti-nurdan, könül, zülfü sayı qətilə bax.

Eyləmə tərk eşqini hurü behiştə aldanıb,
Zahidə baxma, Asiya, ol büti-bibədilə bax.

*************

Ey səba, hali-dilim qıl türreyi-tərrarə ərz,
Eylə bu viranə mülkün şərhin sərdarə ərz.

İltimas etsəm qəmindən böylə bimar olduğum,
Sirrimə məhrəmdir, edərmi nərgisi-bimarə ərz.

Gənci-eşqinə əmindir dil zülum olsa nola,
Xaşə olmazmı, ola bu əmr əgər kuhsarə ərz.

Atəşin rüxsarın üzrə türfə güllər bulmuş.
Vəhi günü birdən olmuş guyiya bu narə ərz.

Qaşların tağın görən yüz döndərir mehrabdan,
Eylər imanın səri-zülfün tutub zünnarə ərz.

Rəhm qılmaz çeşmi-məstin şərhi-hali-zarıma,
Eyləsəm zülfün sayınca gərci ol xunxarə ərz.

Munca zülm, ey şux, qılma Asiyi-dilxəstəyə,
Axəri eylər əlindən Heydəri-Kərrarə ərz.

*************

Niqabın sal yüzə hər dəm könül ah eyləsə bünyad.
Təvəccüh etməgə xublar sarı çun dud olur mötad.

Könüldə tiri-qəmzən dütsa yer, ey qatili-üşşaq,
Rəvadır, çünki hər min seydə bir ox dəfn edər səyyad.

Cəmali-mahdan çərx üzrə min qalib düzüb-pozmuş,
Yetirmiş ta ki, itmamə cəmalın hüsnünü ustad.

Ədalət eyləyib övd etməsə ol məh vəfa üstə,
Yəqin qıllam ki, yoxdur məzhəbində ədlilə miad.

Yetib qürbi-vüsalə zülf ara, dil sormaz əhvalım,
Qəfəs küncün gülüstan içrə əsla mürğ edərmi yad.

Dili-sənginə kar etməz, ey şirinzəban, ahım,
Nə gunə rəxnə salmış tişəsilə kuhə bəs Fərhad.

Uzun illər səri-zülfün qəmində Asiyi-miskin,
Pərişandır, gecə ta sübh olunca eyləyir fəryad.

*************

Qara gözlü, qara oldu günüm zülfün kimi qarə.
Pərişan halım ondandır, bulunmaz dərdimə çarə.

Alıb zülfi-müsəlsəl dövri-mahi-arizin yeksər,
Hərəm rahın və ya məsdud edib ə'rab zəvvarə.

Əcəb olmaz əgər lal olsa tuti qönçətək qəmdən,
Açan dəm ləli-səkkərbarını hər ləhzə güftarə.

Könül lafi-«ənəlhəqq» eşqi-ruyində urar daim,
Nola Mənsurtək çəksə qara zülfün onu darə.

Könül maildi nuş etsin ləbi-ləlin şərabından,
Sədayi-hicr rəf olsun ki, düşmüş rənci-xummarə.

Töküb zəhri-həlahil kami-canə əfi zülfün,
Nola təryaği-ləlin eyləyə bu dərdə çarə.

Yetib həddi-nəsabə hüsni-ruyin müstəhəqqindir,
Zəkati-hüsnünü, ey şux, lütf et Asiyi-zarə.

*************

Qönçə bağrı dəhri-bidad ilə əvvəl qan olur,
Sonra yüz lütfilə könlü açılır, xəndan olur.

Danə torpaq içrə şiddət çəksə hər əyyamdə,
Baş qoyar xirmənlərə, arayişi-bustan olur.

Qətreyi-baran ki, bir müddət çəkər həbsi-sədəf,
Yox ikən qədri, tapar qiymət, dürri-qəltan olur.

Möhnətə səbr eyləyən rahət çatar kim Yusifə,
Səltənət təxtinin ol payəsi zindan olur.

Fe'ldir əsl rizayi-səf, nə kim əslü nəsəb,
Xakə fərman bulsalar, Asi, mələk, şeytan olur.

Yüz məşəqqət çəksə, kami-dil tapar əncami-kar.
Hər kimin aləmdə mövlası şəhi-mərdan olur.

*************

Çəkmə şanə, gözəlim, zülfi-ənbərəfşanə,
Rəhm qıl, görmə rəva kim, ola dil viranə.

O qara zülfün əlindən məni qurtar, Allah,
Belə zəncirə necə tab eyləsin divanə?

Sənin, ey hurliqa, nuri-rüxündür təfsir,
Nə qədər ayeyi-rəhmət yazılıb Quranə.

Verə hər kimsənə zünnari-səri-zülfə könül,
Gərək iman gətirib tabe ola Sən'anə.

Vermişəm könlümü ol daneyi-xalə, ey gül,
Talibəm Adəmə, allatdı onu bir danə.

Qələt etdim o lə'li-ləbindən umdum busə,
Etməmiş qan, kişi böylə düşərmiş qanə.

Rəbbi-Minayi-məhəbbətsən, aya, İsmail,
Asiyi-zarı qəbul eyləgilən qurbanə.

************

Nəsibim gərçi eşqində bəladır,
Bəla üşşaqə eyni-müddəadır.

Cəfa gəlməz pərivəş mahlərdən,
Sanır qafil cəfa, leykən vəfadır.

Xoşam, hər cövr ilə qılsa nəvaziş,
Cəfasın çəkməmək, billah, cəfadır.

Ləbi - şirinin ər düşnamə açsa,
Cəvabı-aşiqi-sadiq duadır.

Neyçün lafi-ələst urmazsan, ey məh,
Bilirsən kim, cavabın da bəladır.

Şərabi-ləli-nabın firqətində
Könül rənci-xumarə mübtəladır.

Əcəb qafildi lə'linin şərbətindən
İsgəndəri-təşneyi-abi-bəqadır.

Neçin hicrandan Asi şikvə qılsın,
Riyazi-dust isə ol həm səfadır.

**(Füzuliyə nəzirə)**

Fəna mülkünə aşiq girməyincə nəfsi ram olmaz,
Məqami-«liməəllah» sirri aınınçun təmam olmaz.

Könül, piri-müğanın feyzü lütfi gər ola şamil,
Meyi-vəhdət əyağın al ələ, bu mey həram olmaz.

Əzəl şəmsinə ol talib, həqiqi hüsn ondandır,
Məcazi dilrübalər hüsni aləmdə müdam olmaz.

Hərimi-Kə’bə, səhni-deyr yeksandır, könül, billah,
Əgər mə’lumə talibisən sənə fərqi-məqam olmaz.

Məqami-qürbi-yarə vasil ola aşiqi-sadiq,
Riyazi-dustdən özgə ona aləmdə kam olmaz.

Necə vasil olum ol şahə kim, gər olmasa nəzmi,
Məhü mehpü büruci-nəcm seyrində nizam olmaz.

Təriqi-eşqə, Asi, laübali qoy qədəm bir dəm
Ki, əhli-eşqdə pərvayi-canü nəngü nam olmaz.

## ABDULLA BӘY ASİNİN CIĞATAY DİLİNDӘ YAZDIĞI QӘZӘLLӘR

Sәndin ayrı kunlimin kup nalәvü әfğanı  bar.
Neylasun hicr әlindin daim dili-naşadı bar.

Ey xoş ol kim bu cahanda qüssәdin azad olub,
Sin kimi qarşusıda bir sәrvqәddi-azadı bar.

Cimü vavü әlif, dalın ruyinә baxğan zәman,
Yad qılğıl kim, bu kölümin bülbüli-naşadı bar.

Ey rәfiq alsa rәfiqinin gözi hәr lәhzә can,
Kup әcәb irmas neçun kim qәmzәdәk ustadı bar.

Arizin hicri bir halәtğә salmış Asini
Kim, vucudindin nişan yoğdur, bir ancaq adı bar.

*********

Könül hicri-rüxunda sinsizin daim fәğan eylar.
O ğuşdım kim qәfәsini gül zәmanı aşiyan eylar.

Olus din ya surәn әsrari-könül eşqi-ruxin nәğәdar.
Bәli, naәhllardin künc tapğan kәs nihan eylar.

Bulub külbәm tamuğ diksin sezin hicran tuni, likәn
Cәmalının quyaşı toğsa gülgәşti-xuban eylar.

Könül kim bulğalı yox bir xәbәr likәn min zari
Lәbi-lәlin qılub hәr dәm tәbәssüm bәdğüman eylar.

Gözü qaşınqı göz kac ğuzğalur hәr esidin
Neyçün kim türki-mәst alğac qılıncı әlğә qan eylar.

Әcәb irmas könül zülfündә mәskәn dutmağı zira,
Qәrib olğan kişi hәr ğanda şam olsә, mәkan eylar.

O şul bimehriğə, Asi, buryanlığ bərbətün yaz kim,
Könül hicri-rüxunda sinsizin daim fəğan eylar.

*********

Səbağə itsam əhvalımnı şərh, imdad qılğaymu?
Piyamun kilturub biçarə dilini şad qılğaymu?

Sifariş eylasam şahimğə viranə mülki-dil şərhin,
Şərhi-dərdü qəmin göndərib abad qılğaymu?

Mey içqan dəm rəqibi-rusiyəh birlə uş ol bimehr,
Fərağidin mənum qan yutmağımnı yad qılğaymu?

Sirişkim sudrasə kuyiğə uşbu mürdə cismimi,
Rəvanbəxş irəni birlə tərkizib bir ad qılğaymu?

Fərağiğə böylə xüğər edibdir xəstə könlümni,
Vüsaliğə genə bilməm onu mötad qılğaymu?

İki çeşmin neyçün seyd eylağay avarə könlümnü,
Zəif olğan keyik qəsdin iki səyyad qılğaymu?

O şul kafərğə kup yalbarma, ey dil, mürğini səyyad,
Turağdin nalə qılmaqlıq bila azad qılğaymu?

Mana yetkac cəfavü zülmüğa mötad olur zülfün,
Və ya əğyarlərdə həm bila bidad qılğaymu?

Quyaş ruxsarlardin zərrəcə mehr umamğay, Asi,
Ədalət görməğan kəs şahlərğə dad qılğaymu?

## MÜXƏMMƏSLƏR

Olmuşam mədhuşi-zülfi-şəbistanın sənin.
Ağlımı başdan alıbdır çeşmi-məstanın sənin.
Yandırır canım dəmadəm eşqi-suzanın sənin.
Əqlimi sərdən aparmış iddiayi-divanın sənin,
İstərəm canım ola hər gündə qurbanın sənin.

Qaşdarın miqraztək qət' eylər ömrüm caməsin,
Hüsn evin gər görsə zahid parələr əmmaməsin,
Ağ yüzündə sormuşam mən xali-filfildanəsin,
Yandı canım, ey gözəl, ver ləblərin peymanəsin,
Sərvpərvər degil bağına çahi-zənəxdanın sənin.

Hər xədəngi-navəkin bir süzən olmuş canıma,
Bağrımı dəldi, yetişdi dinimə, imanıma,
Sinəmə çarpaz çalar, işlər təni-üryanıma,
Padişahım, sən bu gündə bir yetiş divanıma,
Əmr qıl, öldür bəni, minnəti fərmanın sənin.

Rişteyi-canım qılarsan bu xəyanətdən güzər,
Sərməsti-ləli-ləbin eylər sərixəyyatı təzər,
Eşq nuşin gərm eylə, çək canıma sərbəsər,
Qıl tamaşa, dudi-ahımdan gəl eylə bir həzər,
Təxteyi-sinəm olub qarşıda puşxanın sənin.

Çun adın Qaffardır, sən keç günahımdan mənim,
İstərəm vüslət şərabın padişahımdan mənim,
Od düşər, atəş yanar bu suzi-ahımdan mənim,
Olmuşam bizar Asiyi-rusiyahımdan mənim,
Kafər isə qıl məhəbbət olsa mehmanın sənin.

## Bir Mahmud namın tə’rifində

Məstanə gözün gör necə cəlladdı, Mahmud,
Üşşaq qanın tökməyə mö’taddı, Mahmud,
Cümlə fitnə baisi icaddı Mahmud,
Sehrindən onun hər könül azaddı, Mahmud,
Yox bir qəmi dünyadə, yəqin şaddı Mahmud.

Döndərdi gözüm yaşini, ey gül, gözün alə,
Min hiylə ilə könlümü saldı gözün alə,
Qorxum budur imanımı əldən gözün alə,
Bir kafiri-bədməsti süzgün gözün alə,
Daim rəvişi zülm, işi bidaddı Mahmud.

Mehrabə edər tə’nə sənin taği-hilalın,
Cüft olmuş edər taqətimi taği-hilalın,
Kəcrovdur ona rast demək şaği-hilalın,
Çəkmiş üzünə tiğ, olub aği hilalın,
Bişəkk, yenə zülfün ona ustaddı, Mahmud.

Ey qaməti ər’ər, dodağı qəndi-mükərrər,
Yüz nur edər kəsb üzündən məhi-ənvər,
Çün padşəhi-eşqə könül oldu müsəxxər,
Hicran oduna yaxma məni misli-səməndər,
Çün baği-rüxin cənnəti-şəddaddı, Mahmud.

Nə növ’ olum ram mən ol vəhşi qəzalə
Kim, vəhşətin əfzun eləyir ah ilə nalə,
Dil mürği təmə eyliyəli daneyi-xalə,
Dami-səri-zülfündə olub dərdə həvalə,
Bilməm bu necə damü  nə səyyaddı, Mahmud?

İcad edib Adəmü Həvvanı Xudavənd,
Mənzur budur, dövri-zəman gərdiş edə çənd,
Nəslindən onun zahir ola sən kimi fərzənd,
Bu hüsni görüb fəhm qıla mərdi-xirədmənd
Kim, sane’i-surət necə ustaddı, Mahmud.

Naseh, məni mən’ etməyə sərf eyləmə ovqat,
Asi edə ol mahvəşin tərkini, heyhat,
Dilbaxtə olmaqlığımı eyləyim isbat,
Bir xalı məni şeşdəri heyrətdə qoyub mat,
Yox çarə xilas olmağa, nərraddı Mahmud.

**YENƏ DƏ**

Ey dil, nəzər et, gör necə dildarıdı Mahmud.
Məcmueyi-məhvəşlərə sərdarıdı Mahmud.
Rüxsarın üzə zülfi-siyəhkarıdı Mahmud.
Gənc üstə yatıb, yoxsa ki, şəhmarıdı Mahmud,
Rə’na qəddinə sərvi demək arıdı, Mahmud.

Ey lə’li-ləbi mübteli-e’cazi-Məsiha,
Vey nuri-rüxi müqtəbisi-şö’leyi-Musa,
Əngüşti-peyəmbər kimi beyni-əlifasa,
Əbrudən edib mö’cüzi-şəqqül-qəmər əfşa,
Ya caduyi-çeşmindəki əsharıdı, Mahmud?

Ta düşdü gözüm sən kimi bir mayeyi-nazə,
Səbrim tükənib, tabü təvan getdi güdazə,
Məhmudi-həqiqi sənsən, baxma məcazə,
Məhmud əgər aşiq idi hüsni-Əyazə,
Mahmud, yüz ol qədr sənə varıdı Mahmud.

Gər cəm’ olalar bir yerə bu aləmi məşhud,
Hurü mələkü ünsnü pəri, cümleyi-mövcud,
Hüsni-rüxin eylər onu bir ləhzədə nabud,
Könlüm sanır idi üzünü atəşi-Nəmrud,
Axırda yəqin etdi ki, gülzarıdı Mahmud.

Zülfündümü hər su dağılıb mahi-cəmalə,
Ya əbri-siyəhdən düşüb ay dövrinə halə?
Ey qaşı kəman, kipriyi ox, gözləri alə,
Eşqin məni-biçarəni gör saldı nə halə,
Müddətdi könül hicr ilə bimarıdı, Mahmud.

Həddi nədi kim, sərv ola qəddinə həmta,
Şümşadü sənubər nədi, ya ər’ərü tuba,
Həqqi-nəməki-lə’lin üçün ey büti-ziba,
Görsəydi səni Misri-məlahətdə Züleyxa,
Haşa, məhi-Kən’ana xiridarıdı, Mahmud.

Kimdir ki, sənin hüsnünə həmta ola Yusif?
Şirinü Züleyxa yığıla, ya ola Yusif?
Çatmaz sənə gər cümleyi-dünya ola Yusif,
Qarşunda əgər istəsə ziba ola Yusif,
Sal cahi-zənəxdanə, günəhkarıdı Mahmud.

Tərki-həvəsi-gülşənü bağ eylədi könlüm,
Zülfü-siyəhin içrə yətağ eylədi könlüm,
Əfqanı ilə taqəti tağ eylədi könlüm,
Şanə gəzübən zülfü sorağ eylədi könlüm,
Gördü çəhi-qəbqəbədə giriftarıdı Mahmud.

Buyi-səri-zülfün dilərəm badi-səbadən,
Könlüm edərəm şamü səhər şad səbadən,
Yə’qub kimi istərəm imdad səbadən,
Çün pirəhənin buyin edər badi-səbadən,
Asi ona hər sübh tələbkarıdı, Mahmud.

## TƏRCİBƏNDLƏR

Saqiya, ey büti-məhpeykərü xurşidcəmal,
Ələ al badeyi-gülgün qədəhin mala-mal.
Dur ayağa, tök əyağ içrə meyi-səhbanı
Ki, ayaqdan salsın könlümü, etsin ehmal.
Ol şərabi ki onun «şin»i şəkərdir, «rey»i ruh,
«Əlif»idir abi-bəqa, «ba»dən ibarətdir bal.
Çünki bu bir belə mövsümdü ki, şahənşəhi-gül.
Təxti-gülşəndə hökümətlə tutub istiqlal.
Səf çəkib cümlə müqabildə cüyuşi-səbzə,
Sərv qaldırdı çəməndə ələmi-meymunfal.
Etdi məğhur çəmən ləşkərini şahi-bəhar,
Çərxəçivar girib ərsəgəhə badi-şimal.
Bijəni-«ordubeheşt»[1] eylədi «fərvərdin»[2]ə zur.
Qəl’eyi-gülşənə Kavusu-səbadır kütval.
Nə rəva bir belə mövsümdə könül kişvərini,
Edə məftuhü müsəxxər sipəhi-dərdü məlal.
Ləblərin hicri qılıb qönçə kimi bağrımı qan.
Kəsrəti-naləvü əfqan eləmiş cismini nal.
Yüz qoyub üstümə dərdü qəmü ənduhü məlal,
Rahi-reyhan qədəhin dövrə gətir dər həmə hal.

*************

Əfsəri-qönçə qoyub başə şəhi-fərvərdin,
Payi-təxtində məqam etdi vəziri-nəsrin.
Rəxşi-piləfkəni-şax üstə çıxıb Rüstəmi-gül.
Rüx tutub Bəhməni mat etməyə sürdü fərzin.
Bərgi-bid eyləmiş amadə xədəngi-dilduz,
Vurmağa çeşmi-Sifəndəramizə qıldı kəmin.
Qönçə Söhrabını əhya edib əbri-neysan,
Nuşdaru eləyib kamına şəbnəm yəqin.
Deji-gülzarə qədəm basdı genə Givi-səba,
Tapdı Keyxosrov güli- bağda izzü təmkin.

---

[1] İran təqvimində ikinci ay
[2] İran təqvimində birinci ay

Laləni xuni-Səyavuşə məgər bənzətmiş
Ki, Firəngizsifət bülbül olubdur qəmgin?!
Saldı min «şur»ü «hisar» çəmənə muyəkünan,
Saz edib suzü güdazilə nəvahayi-həzin.
Saqiya, bir belə mövsümdə tutub cami-səbuh,
Meyi-təlx ilə məzaqım nola qılsan şirin.
Açılıb nərgisi-şəhla bu zaman, görmə rəva,
Çeşmi-bimarın edə könlümü bimarü qəmin.
Qoyma həsrət məni-biçarəni, qıl ərzi-cəmal,
Bir əyağ ilə dili-zarımı bir dəm ələ al!
******
«Şur» qanunun edib bağdə bülbül ağaz,
Yetirib çərx «hisar»ına «hümayun» avaz.
Qumru ahəng qılıb zümzümeyi-şəhraşub,
Zirü bəm pərdeyi-«gu-gu»də əcəb qılmış saz.
Ləhni-Firuz çəkib «rast» «simai– şəms»ə,
Dili-üşşaqə nəva böylə salıb suzü güdaz.
Çəngi-şaxə çəkilib türreyi-sünbüldən tar,
Sövti-«dilkəş»lə dolub mülki-Nişaburü Hicaz.
Keçdi ol vəqt ki bənzərdi «zəminxara»yə,
Rahül-ərvah ilə badi-səhər olmuş dəmsaz.
Öz nigarilə gülüstanda büzürgü kuçik,
Eyləyir hər biri bir güşədə min razü niyaz.
Boylə novruz zamanı nola dil neyrizin,
Edib amadə mənə etməyəsən, ey şəh, naz.
Çünki Mahmudisifət eylədi divanə məni.
Bir pəri silsileyi-zülfə salıb misli-Əyaz,
Unudub mehri, müxalif sözünə tutmuş güş,
Tartək dişrə salıb pərdeyi-xəlvətdən raz.
Çəkərəm şurü nəvalə hicri-rüxündə məhü sal,
Tükənib səbrü təvan, yox dəxi ümmidi-vüsal.
******
Bilməm ol şux neyçün böylə cəfakar olmuş,
Tərk edib aşiqini həmdəmi-əğyar olmuş.
Bülbülün xar qoyub, gül kimi uymuş xarə,
Qeyrilə duşbəduş azimi-gülzar olmuş.

Bağlayıbdır hərəmi-kuyinə əğyar ehram,
Rütbeyi-qürb bulub, məhrəmi-əsrar olmuş.
Qəmi-hicranə edib aşiqi-miskini düçar,
Səg rəqibə uyub ahu kimi qəmxar olmuş.
Nöqteyi-xalı həvasında dili-divanə,
Şikəni-zülfidə sərgəştə çu pərgar olmuş,
Çeşmi-bimarı xəyalilə könül şamü səhər,
Nərgisi - məst kimi xəstəvü bimar olmuş.
Mürği-dil daneyi-xalinə təmə eyliyəli,
Həlqeyi-dami-səri-zülfə giriftar olmuş.
Əşki-gülgün axıdır didə o gündən ki könül,
Mayili-lələbü arizi-gülzar olmuş.
Bağü gülşən mənə zindani-bəla olsa nola,
Zali-bizər məhi-Kən'anə xiridar olmuş.
Ləbi-şəkkərşikənin açmayır ol tutiməqal.
Pürsişi-halıma etmiş məni bu möhnət lal.
******
Mehr salmaz mənə bir zərrəcə ol bədri-təmam,
Hicri-ruyində olub zülfü kimi sübhüm şam.
Simi-əşkim eləmiş çöhreyi-zərd üzrə rəvan,
Qüssədən ol büti-zərrinkəmərü siməndam.
Olmayıb dil, qoyalı kami-rəhi-eşqinə.
Şərbəti-lə'li-ləbi zövqü ilə şirinkam.
Uyudum ahulərə eşqində misali-Məcnun,
Eyləyib rəm, mənə ol vəhşi qəzal olmadı ram.
Çar sudən qoyub üz üstümə ənduhü mühən,
Möhnətü dərdü məlalü qəmü rəncü alam.
Zülfü sevdası ilə ömür yetib payanə,
Bulmadım çünki şəbi-hicrinə, saqi, əncam.

Çarə oldur ki, genə lə'li-ləbi yadı ilə
Badeyi-nab ilə ləbriz edəsən zərrin cam.
Badə tök sağərə, tök, qanıdır, ey şux, həlal,
Söyləsə zahidi-xüdbin meyi-gülguni həram.
Rahi-reyhan ilə qıl öylə məni bixüd kim,
Məstü mədhuş qılam bir də qiyamətdə qiyam.

Belə məxmurluğum baisin, ey nikxisal,
Hazıram eyləməyə rəddi-cəvab, olsa sual.
******
Ərz qıllam o zaman key səmədü həyyi-qədir,
Yoxdu bu Asiyi-miskində bu işdə təqsir.
Eşq əmirilə çəkib tirü kəman çeşmi-xumar,
Qıldı səyyadsifət səbr qəzalın nəxcir.
Günbəgün ləşkəri-hüsn oldu qəvi, əql zəif,
Qıldı dil kişvərini eşqi-cəfacu təsxir.
Eşqi-xuni, səfi-müjkan sipəhi bipayan,
Neyləsin bunlara bir əql, nə etsin tədbir.
Şahi-hüsn oldu cahan içrə çü məbsutül-yəd,
Ləşkəri-möhnətü əndühə qılıb eşqi əmir.
Əvvəli-ma xələqüllah yazıb eşq hüsnün,
Bu cahanı qələmi-sün'i edən dəm təhrir.
Əqli məhbus qılıb cahi-zənəxdan içrə,
Eylədi silsileyi-zülfdə tədbiri-əsir.
Əqlsiz cisimdən, ey vahidi-yekta, nə gəlir,
Zülmət olmazmı cahan olmasa gər mehri-münir?!
Buyurubsan sən özün «lis ləmcinani» şərh,
Məni bu əmrin edib sövqilə bu əmrə dəlir.
Nə bilir aşiqi-şurideyi-biəqlü kəmal
Ki, nədir baisi-rəhmət, necədir xovfi-zilal?!

## Sonaya

Ey qamu xublara şah Sona.
Bürci-hüsn içrə yüzü mah Sona.
Dilrüba dilbərü dilxah Sona.
Sərvi-simintənü, gümrah Sona.
Şahi-zişövkətü zicah Sona.
Götürərmi bunu Allah, Sona?
Gecə-gündüz, gəhü bigah, Sona.
Söylüyüm ah Sona, ah Sona.
Olma məndən belə ikrah, Sona.
Soruş əhvalımı gəh-gah, Sona.

*********

Banəmək, xoşəmüdrək, simbilək,
Gülrüxək, mehri-fələk, nəsli-mələk.
Dilbərək, ləbşəkərək, xubtərək,
Məhvəşək, Yusifi-gülpirəhənək,
Şəkərək ləblərinə dil tutək,
Yoxdu şəkkim, olu xublarda kələk.
Leyk rəhm et mənə kim, yox məntək
Binəva, könlü sınıq, xəstədilək.
Olma məndən belə ikrah, Sona,
Soruş əhvalımı gəh-gah, Sona,

*********

Gün qara çeşminə nərgis olub ağ,
Saralıb çeşmi gətirmiş simlağ.
Olsun, ey çeşmi-siyah, siminsağ,
Hər yaman çeşm bu çeşmindən irağ,
O qara çatma qaşın hüsndə tağ
Taği-Mehrab ona tay olmağı şağ.
Firqətin taqətimi eylədi tağ.
Qoyma kim, munca çəkim rənci-fərağ,
Olma məndən belə ikrah, Sona,
Soruş əhvalımı gəh-gah, Sona,

*********

Ey büti - sərvqədü gülpeykər,
Qalmışam vəsfi-rüxündə müztər.
Valehəm, bilməzəm, ey zərəfsər,
Zülf dövri-rüxun almış yeksər,
Şahi-Çin Rumə çəkib ya ləşkər,
Halə içrə görünür yoxsa qəmər.
Gözlərin şərhidi, ya zağbəsər,
Qabi-qövseyn[1] qaşın tiği-düşər,
Olma məndən belə ikrah, Sona,
Soruş əhvalımı gəh-gah, Sona.

*********

[1] Qabi-qövseyn —yayın ortası ilə ucların birisinin arasındakı məsafə

Bir tərəf gərdişi-dövran  birəhm,
Bir tərəf möhnəti-hicran birəhm,
Həm rəqibi-səgi-nadan birəhm,
Tirədil, zülfi-pərişan birəhm,
Fitneyi-nərgisi-fəttan birəhm,
Hər baxanda alı yüz can, birəhm.
Barı sən olma müsəlman, birəhm.
Könlümü etməgilən qan, birəhm,
Olma məndən belə ikrah, Sona,
Soruş əhvalımı gəh-gah, Sona.

*********

Qəddin, ey simbərü azadə,
Tə'n edir tubayə, həm şümşadə.
Sənsən, ey hurliqa, dünyadə,
Nazənin qızlar ara şəhzadə.
Ey güləndamü zərifü sadə,
Gah-gah aşiqini sal yadə.
Asiyi-xəstədili-üftadə,
Hicr əlindən sənə gəlmiş dadə.
Olma məndən belə ikrah, Sona,
Soruş əhvalımı gəh-gah, Sona.

## CİNASLI QƏZƏLLƏR

### Telliyə

Ta düşdü gözüm sən kimi yekta bütə, Telli,
Az qaldı ki, səbrim tükənib ta bitə, Telli.

Can çıxdı qəmindən, vəli candan qəmi-eşqin,
Çıxmaz təni-zarım çıxa gər tabitə, Telli.

Zülfi-siyəhin saldı dili-zarı əyağə,
Yüz vermə ona payə çalıb ta bitə, Telli.

Ərər nəçidir sərvi-qədintək ola azad
Gül kimdi, gül arizinə ta bitə, Telli.

Hicran qəmini çəkməsə dil vəslə yetərmi,
Xalis olumu görməsə zər ta butə, Telli.

Lazımdı müjən suzən ola, riştə siyəh zülf
Kim, edə rüfu zəxmi-dirun ta bitə, Telli.

Asi nə rəva vəsli-rüxumdan ola məhrum,
Bil, yaxşı degil bu hərəkat, a bütə, Telli.

*********

Rəhm qıl, dəymə səba, zülfi-kəci —dildarə,
Nə rəva kim düşə vüs'ətdə ikən dil darə.

Eşq ruyində urub lafi-ənəlhəqq guya,
Çəkilib zülfdə Mənsursifət dil darə.

Hər xədəngin səfi-müjgandan əgər kəm bulsa ,
Kimsəyə etmə güman, zülfün ara, dildarə.

Qoyma kim, şanə dəyə zülfə, özün məhrəmsən,
Şərhə-şərhə ol onuntək, onu, ey dil, darə.

Asiya, çini-səri-zülfdə qom buldu könül,
Zülməti-şəb tanımaq qüdrəti yox dildarə.

## TƏCNİSLƏR

Siyəh zülfün bir dəm etmə pərişan,
Əhatə etməsin dövri-rüxsarı.
Divanə aşiqdən sən ey pərişan,
Kim dedi ki, qəbqəb gözlə rüx sarı.

Müraat et, ədəb şanə, şan şanə.
Gəl döndərmə xəstə dili şan-şanə.
Etmə siyəh zülfü pərişan, şanə,
Yüz qoymasın o rusiyəh rüx sarı.

Yox taqətim arizindən, gözəlim.
Yüz növ əgər əzab etsə gözəlim,
Tərlan baxışına rəhm et gözəlim,
Mən' eyləmə bir dəm duta rüxsarı.

Mülki-dildə atlanıbdı ata şah,
Fərzin tək üç dilfinə ata şah.
……. dili yanacaqdı ataşah,
Yüz qoyubdu çün piyadə rüx sarı.

Salıbdı Asini hicrin ayağa,
Cakərinəm, tərəhhüm qıl, ay ağa.
Saqi, şitab eylə bir dəm ayağa,
Gülgün ləb hicrindən olub rüx sarı.

********

Qorxum budur imanımı əlimdən
Süzgün baxmaq ilə gülən göz ala.
Sənansifət döndəribən elindən,
Zünnari-zülfilə sala gözala.

Məhəbbət tapılmaz dilə xalından.
Dil mürğünə daim verir xalından.
Ey gül, sənin zülfü xəttü xalından,
Yüzüm bir dəm istəməyir göz ala.

Ey dil, girmə bəhri-hicrə, dərindi.
Nihali-vəslidən səmər dər indi.
Gör necə düzülüb yüzə, dər indi.
Çün alır aşiqdən xumar göz ala.

Zülfi-siyah hüsni-yar aşiqidi,
Hər kəs onu sevməz, yar aşiqidi,
Bir ahu baxışlı yar aşiqidi
Könül, mail olmuyasan gözala

Ruxi-alə düşüb zülfi-asiya.
Zinət nə lazımdır, xoşdur asiya.
Vəhşi könül qəzalini, Asiya,
Mahir səyyad imiş, götdü göz ala.

******

Siyəh zülfü çin-çin tökmə gərdanə,
Aşiqlərin ixtiyarın az alə.
Könül mürğü təmə etsə gər xalə,
Siyəh xalın onu salə azalə.

Kəhrəbatək rəngim qəmdən saralır,
Əğyar ilə ol dilruba sar alır.
Bir tərlanın şikarını sar alır
Məəttələm nəqşibəndi azalə.

Arizində xoşdur zülfü tərsayə.
Məşşatə ta əl vurmasın tərsayə.
Zinət vermə o dilbəri-tərsayə,
Günəş cəmalını döndər azalə.

Ləbin şərabından kamıncəm alı,
Görseydi Züleyxa bu gün cəmalı,
Yusifə verməzdi ölüncə malı,
Satardı malını bişək Azalə.

Könül həsrət atəşinə di yanır
Vüsalını bahar anır, diyanır.
Asi, məgər qəm məncərə dіyanır,
Hücum etsə Rüstəm ilə Azalə.

## BƏHRİ-TƏVİLLƏR

### Müxəmməsi-bəhri-təvil

Ey zülməti-zülf içrə yüzün mehri-münəvvər,
Vey baği-rəşadətdə qədi sərvi-sənubər,
Məqbul yaratmış səni ol xaliqi-əkbər,
Vermiş sənə zinət Məşşateyi-qüdrət.
Yox sən kimi löbət, Bu nazü nəzakət,
Bu lütfü lətafət, Bu qəddü bu qamət,
Həm hüsnü məlahət, Ey ayeyi-rəhmət,
Yox kimsədə əsla, ey dilbəri-ziba,
Olmaz sənə həmta Şirinü Züleyxa.
Layiqdi ki, Yusif ola sən sərvərə çakər
Ey qaməti ər-ər, dodağı qəndi-mükərrər.

Ruyin çəməni-hüsndə ta qaldıdı beydəğ,
Gül urdu müqabildə məgər lafi-ənəlhəqq,
Gülbün qurubən dar onu asdı müəlləq,
Kim batma vəbalə, Düşmə bu xiyalə,
Olmaz gülü lalə Həmta o cəmalə,
Xurşid misalə, Ol arizi-alə,
Bu çeşmi-qəzalə, Bu xəttü bu xalə.
Bilməm bu nə gisu, nə silsileyi-mu,
Nə nərgisi-cadu kim, canın alıb bu,
Əbru, necə əbru kim, olub bir-birə mülhəq,
Qan tökməyə amadə edib tiği-düpeykər.

Sən simbədən, zülfü rəsən, qönçədəhənsən,
Aşubi-zəman, sərvi-çəmən, babi-fitənsən.
Sən sib zəgən, ruy səmən, vəchi-həsənsən,
Ey ruhi-rəvanım, Qarətgəri-canım.
Ey qönçədəhanım, Əbrusi kəmanım.
Ey muyi miyanım, Qılmanü cinanım,
Vey tuti zəbanım, Məhmudi-zəmanım,
Şəmsü qəmər üzlüm, hər ləhcəsi duzlum,

Tutu kimi sözlüm, süzgün ala gözlüm,
Ahuyi-Xütən, sərvi-çəmən, dürri-Ədənsən.
Çatmaz ləbinə abi-bəqa, çeşmeyi-Kövsər.

Qan yaşım axar nərgisi-caduni görəndə.
Kim tifltək vəpu edər ahuni görəndə.
Divanə könül silsileyi-muni görəndə,
Dərdim ola pabənd.        Yüz mərdi-xirədmənd,
Ta vurmıyalar bənd,        Müşkül eşidər pənd.
Ey dilbəri-dilbənd,         Hicran qəmi ta çənd.
Verrəm sənə sövgənd.    Bir et məni xürsənd.
Ver buseyi-pünhan, canım sənə qurban.
Kim, möhnəti-hicran bağrım eləyib qan.
Kafər də yanar hali-digərguni görəndə.
Sən həm mənə bir rəhm eylə, ey şuxi-sitəmgər.

Sənsən güli-bağü ləqəd kərəmül-insan.
Mazağə, bəsər çeşmi-xumarında nümayan.
Vəşşəmsi-züha zülfü rüxin vəsfinə tibyan.
Ey dilbəri-ziba,          Süni-şəhi-yekta,
Ruyində hüveyda.     Gər etsə təcəlla,
Ol arizi-həmra,          Mədhuş olu Musa.
Olmaz yədi-beyza,    Ol nur ilə həmta.
Ey sevgili yarım vey çeşmi xumarım,
Gör haləti-zarım, yox səbrü qərarım.
Zünnari-səri-zülfə uyub Asiyi-nalan,
Az qaldı rəhi-eşqdə, ey büt, ola kafər.

**YENƏ DƏ**

Saqiya, ey büti-zərrinkəmərü sərvi-səmənbər,
Sənəmi-qönçədəhən, simbədən, mahi-münəvvər,
Üzü lalə, gözü alə, dodağı qəndi-mükərrər,

Dolanım başına, bəsdir bu təğafül, bu təkahül, yetişib fəsli-bəhar, açdı bu gün laləvü sünbül, Ucalıb cəh-cəhi-bülbül, yetişib göylərə qülqül, açılıb nəstərənü gül, səmənü mövrədi-qərənfil,

Qəm əlindən tutulub dil, tutuban bəzmdə mənzil, tökə yağ içrə bu gün mül, necə mül, Vəh-vəh-vəh, ruhi-rəvan, rahəti-can, lə'li-Bədəxşan, nəçidir abi-bəqa, şəhdi-müsəffa, onun əksində hüveyda. Olub e'cazi-Məsiha, eyləyir mürdələr əhya, çata bilməz ona əsla,

Qəmzədalıqda yəqin eyləgilən, çeşmeyi-kövsər.

Belə mövsümdə rəva görmə dönüm başına, saqi
Ki, qalıb guşeyi-möhnətdə çəkəm rənci-fərağı,
Məni gəl salma ayağa, ələ al bir dəm əyağı,

Nə rəva möhnəti-gərdun edə mən bikəsi dilxun, qalam avarəvü məhzun, ola qəm günbəgün əfzun,
Nola gər yar ola bəxtim, açıla talei-vajun, dolana hali-digərgun,kərəmet,eybüti-mövzun, Edibən könlümi məmnun, tök əyağə meyi-gülgun. Necə mey, vəh-vəh-vəh badeyi-dilkəş,meyi-biqəş, Ola hər kimsə müşəvvəş, odu bişək ona dərman, yaradıb qadiri-sübhan onu sərçeşmeyi-heyvan, qələt etdim bu sözü. Nəçidir çeşmeyi-heyvan, nəçidir lə'li-Bədəxşan, nəçidir, ey dili-qafil, nəzər et bir dəm, ol aqil,
Ona zəmzəm demə, ey dil, hanı onda bu fəzail,

Ona tay olmaz əqiqi- Yəmənü laleyi-əhmər

Bir neçə cam peyapey yetir, ey saqi, edəm nuş,
Elə bir ləhzə məni badeyi-gülgunilə mədhuş,
Eyləyib könlümü qan hicri-ləbi lə'li-bənaguş,

Neçə müddətdi ki, mən həsrətəm ol çeşmi-qəzalə, səri-zülfü xətü xalə olubam dərdə həvalə, çəkərəm hər gecə nalə, tökülüb mahcəmalə,
O siyəh zülf çü halə, bir diyən yoxdu, nədim mən, deyə ol ləbləri balə,nola, ey gözləri alə, yetişib qürbi-vüsalə, Baxam ol arizi-alə, necə yüz, vəh-vəh-vəh şö'leyi-Musa, yədi-beyza, nəçidir laleyi-həmra, bu sözüm oldu xəta, Mehrimünəvvər nəçidir? Xosrovi-xavər nəçidir mehri-dirəxşan, ola bilməz belə taban, gətirməz heç gülüstan belə bir növ güli-xəndan,

Çün odur şə’şəeyi-nuri-Xuda, nəyyeri-əkbər.

Gül ruyə olub əfşan, nə gözəl zülfi-pərişan,
Yoxsa gülşəndə gül ətrafın alıb sünbülü reyhan,
Nə əcəb çahi-zənəxdan, nə gözəl nərgisi-məstan,

Bari, ey badi-səba, sən məni-zarə nəzər eylə, o büti-mahvəşin kuyinə bir dəm güzər eylə, tutubən damənini ərz eylə kim, Rəhm qıl, ey tazə nigarım, yüzü gülbərgi-bəharım, gələ gör haləti-zarım, kəsilib səbrü qərarım, gözü sərməstü xumarım.Necə göz, vəh-vəh-vəh nərgisi-şəhla, nəçidir can edə yəğma. Nəçidir nərgisi-məstin belə fəttanımı var? Navəki-müjganımı var? Afəti-dövranımı var? Qəmzeyi-pünhanımı var? Şiveyi-məstanımı var? Xəncəri-bürranımı var?

Nəçidir navəki-müjgan kimi xunriz ola xəncər?

Şükr qıl, qədrini bil aləmara qadiri-biçun
Sənə lütf eyləyib, ey sərvi-rəvan, qaməti mövzun,
Şərhi-hümmi-düxandır səri-zülfün, dəhənin nun,

Olub əğyar ilə yar ol büti-gülpirəhənim, gülbədənim, simtənim, qaməti sərvi-səmənim, gözləri babi-fitənim, qan içənim, əzmi-siyahət qılubən, rəşk oduna yaxma tənim, axırı bədnam olusən, ərzimi güş eylə bənim, ey sənəmi-mahvəşim, arizi ali günəşim, ləbləri badəkəşim, Muyi siyahi-həbəşim, yox necə mu, vəh-vəh-vəh mişki-müəttər,nəçidirqaliyeyi-tər, nəçidir sünbülü reyhan, Ola bilməz belə əfşan, ona pabəstədi yüz can, edə gərşanəpərişan onu, min dil olu nalan,

Nə münasibdir ona nafeyi-Çin, töhfeyi-ənbər.

Rəhm qıl Asiyi-dilxəstəyə, ey sərvi-dilara,
Səbr ara, məni hicran sipəhi eylədi yəğma,
Sənin eşqində olub Qeys kimi mənzili səhra,

Verəli könlü səni-sərvərə bimehrü məhim, kəc kübəhim, kəc nigəhim, padşəhim, qibləgəhim, zülfi dirazü siyəhim,

türreyi-çini-zirəhim, Xaki-dəri səcdəgəhım, dərdə giriftar olubəm, hicr ilə bimar olubəm, xar olubəm, zar olubəm, həsrəti-didar olubəm səndən iraqə, düşübəm, nari-fəraqə, məni qəm salmış ayağə, necə qəm, vəh-vəh-vəh, atəşi-suzan nəçidir, zəhməti-neyran nəçidir, Ne'məti-vəslin nə qədər ləzzəti vardır, anın, ey şux, yüz anca qəmilə möhnəti vardır,

Belə cansuz qəmə dəhrdə tuş olmaya kafər.

Oldu çu xəzan Kərbəlada,
Ol gülşəni-novbəhar Zeynəb.
Qaldı bu qərib macərada
Bimunisü qəmgüsar Zeynəb.

Oldu çu əsir Ali-Heydər,
Əz zülmi-Yəzid Şümrə bəstər.
Gördü ki, şəhid olur yeksər
Bir-bir məhi-gülüzar Zeynəb.

Ey qürbət ara qərib qardaş,
Qurban sənə dilfigar Zeynəb.

Bir yanda düşüb şəhi-ələmdar.
Doğranmış əlim olub nəkunar.
Söylərdi ki, ey qəribi-biyar,
Hanı şəhi-namdar, Zeynəb.

Aç bir gözünü eylə nəzarə,
Bax Qasimü Əkbəri-figarə.
Gör necə olubdu parə-parə,
Ey şahi-büzürgvar Zeynəb.

Gördü kü, düşüb o çöldə bisər,
Ol tazə nihali-baği-Heydər.
Olmuş bədəni nəyləsə əhmər,
Başa dögüb etdi zar Zeynəb

Gülşən pozulub xəzanə döndü,
Güllər solub ərğəvanə döndü,
Bülbültək işi fəqanə döndü,
Nagəh dili-biqərar Zeynəb.

Ey miveyi-gülşəni-nübüvvət,
Ey küşteyi-Sümri-bimürvət,
Bu Asiyə lütf edib şəfaqət,
Yet dadına tacidar Zeynəb.

**********

Abad ola evin qəmxanə, Kərbəla,
Çox hörmət eylədin mehmanə, Kərbəla.

* * *

Mirabi-kövsərin oğlu çəkib fəqan.
Qürbi —Fəratda ləbtəşnə verdi can,
Adətdi dəhrdə başın kəsən zaman,
Mərdüm su göstərər qurbanə, Kərbəla.

* * *

Əflakə çulğanıb fəryadi-əl-ətəş,
Ətfali-əhli-beyt çün düxtərani-nə'ş,
Su, su deyib edər axır təmami qəşş,
Qəmdən gəlibdilər gör canə, Kərbəla.

* * *

Banuyi tahiri, xatuni-binəzir,
Zeynəb cəfasına nə olmusan gəlir,
Qolları bağlanıb, Şamə gedər əsir,
Rakibdi nağeyi-üryanə, Kərbəla.

Bu mubanlığın eylər səni məlul,
Etsə sual əgər məşhər günü qəbul,
Düşmüş qum üstünə güldəsteyi-rəsul,
Dörd min yara ilə meydanə, Kərbəla.

* * *

Ey abruysuz, abın bu dəştara
Bir qətrə içmədi övladi-Mustafa,
Dönsün görüm sənin, ey dəşti-pürcəfa,
Abi-Fəratını al qanə, Kərbəla.

* * *

Xuni-cigər olub bimar şərbəti,
Aya, deyilmiş bəs bu təb hərarəti,

Abbasi-Əkbərin ənduhü firqəti,
Getdi o bikəs gər canə, Kərbəla.

Etməm sənə şəbih Kə'bə diyarını,
Firdovsi-həştümün baği-simarını,
Ağuşə çəkməsən Əkbər məzarını,
Yar olmasın əcəb cananə, Kərbəla.
* * *
Mədfundu səndə çün ol sərvəri-qərib,
Gərdi-rəhin verər ərşi-Xudayə zib,
Axır nəfəs ona ta olasan nəsib,
Həsrəti-Asiyi-divanə, Kərbəla.
* * *
Yıxdılar atdan çü Əli Əkbəri,
Səslədi Abbasi-ələmpərvəri:
Nadə Əliyyən, Əliyən, ya Əli!
* * *
Gül bədənin Xəvlivu Şimrü Sənan
Etdilər amacı-xədəngü sinan.
Zərrəcə rəhm eyləməyib kufiyan,
Qətlinə məcmuisi oldu cəri,
Nadə Əliyyən, Əliyən, ya Əli!
* * *
Xeyməgəhə üz tutub ol məhliqa,
Ərz elədi key şəhi-Kərbübəla,
Gəl, başımı al dizinə, ya əba,
Payinə isar eyləyim bu səri,
Nadə Əliyyən, Əliyən, ya Əli!
* * *
Almamışam mən bu cahan içrə kam,
Etməmişəm toy otağında məqam.
Xeymədə yol gözlər o bikəs anam,
Yox bu qərib ölkədə bir yavəri,
Nadə Əliyyən, Əliyən, ya Əli!
* * *

Qoyma, baba, bikəsü biyavərəm,
Hüsndə mən saniyi-peyğəmbərəm,
Bir nəfər et, axır Əli Əkbərəm,
Qoyma dəxi kim, uralar xəncəri,
Nadə Əliyyən, Əliyən, ya Əli!
* * *
Gəl, özünü Əkbəri-zarə yetür,
İstidi qum, başımı yerdən götür,
Leyk gələndə anamı həm gətür,
Sağ görə bəlkə Əliyyi-Əkbəri,
Nadə Əliyyən, Əliyən, ya Əli!
* * *
Çünki eşitdi bu sədanı Hüseyn,
Qoydu belinə əlin ol şahi-din,
Günbədi-çərxə yetirib şurişin,
Eylədi piçidə o dəm ləşkəri,
Nadə Əliyyən, Əliyən, ya Əli!
* * *
Ta ki, başı üstə yetirdi özin,
Eylədi balış altda dizin,
Pak eylədi qandan o şəhla gözin,
Aldı qucağına o məhpeykəri,
Nadə Əliyyən, Əliyən, ya Əli!
* * *
Ərz elədi Əkbəri-gülgunkəfən,
La əbəta, həqqi-imami-Həsən,
Mən gedirəm, lütf eylə Leylayə sən,
Zeynəbə tapşırgilən ol müztəri,
Nadə Əliyyən, Əliyən, ya Əli!
* * *
Hansı cəfalar ki, o qövmi —dəğa,
Görmədilər şahi-şəhidə rəva?!
Qoydular ol Qasimə qandan bəna,
Tirə hədəf eylədilər Əsğəri,
Nadə Əliyyən, Əliyən, ya Əli!
* * *

Ləşkəri-küffar çü səf qurdular,
Ol şəhin ənsarini öldürdülər,
Xeymeyi —peyğəmbərə od vurdular,
Etmədilər yad şəhi - kövsəri,
Nadə Əliyyən, Əliyən, ya Əli!
* * *
Zinəti —əhli —hərəmi hər nə var,
Qarət edib ləşkəri —kin aldılar,
Etdilər üryan dəvə üstə səvar,
Zeynəbi —biçarəvü qəmpərvəri,
Nadə Əliyyən, Əliyən, ya Əli!
* * *
Fatimə, ol düxtəri —sibti-rəsul
Gərçi murad almayıban qaldı dul,
Qeyrəti-Qasim necə eylər qəbul,
Şamə gedə, olmaya bir mə'cəri,
Nadə Əliyyən, Əliyən, ya Əli!
* * *
Qıl nəzər, ey padişəhi-məşriqeyn,
Yekcə qalıb Kərbübəladə Hüseyn,
Hanı o əl eylədi fəthi-Hüseyn,
Götürdü şirar dəri —Xeybəri,
Nadə Əliyyən, Əliyən, ya Əli!
* * *
Lütf eylə, ey novgüli-baği-Xəlil,
Asiyi-miskin sənə olmuş dəxil,
Qoyma ki, məhşər günü olsun zəlil,
Rövzeyi-rizvanə sən ol rəhbəri,
Nadə Əliyyən, Əliyən, ya Əli!
* * * * * *
Əntə məmnu' min əl-ma'i-Fərat Hüseyna, Hüseyn.
Əntə məzlum fil-cəsərat Hüseyna, Hüseyn[*].

[*] Fəratın suyu sənə qadağan olunmuş, sən cəsarətli zülm çəkənsən.

Ey olan təşnələbü ətşan,  Hüseyna, Hüseyn.
Qumlar üstə düşən üryan, Hüseyna, Hüseyn.
Şövqilə ümmətə qurban Hüseyna, Hüseyn.
Bulaşan qanına qəltan Hüseyna, Hüseyn.

Kəsdi ol Şimri-bədərkan Hüseyna, Hüseyn.
Zülmilə başını daldan, Hüseyna, Hüseyn.

Gətiribdi məni bu bəşər genə təngə,
Zülmilə düşmən ilə ahi-Səkinə yengə,
Gəldi küffar cəfası ilə sənə cəngə,
Əntə məmnu' min əl-ma'i-Fərat Hüseyna, Hüseyn.

Ey qoyan Zeynəbi avarə, Hüseyna, Hüseyn,
Qalmışam bikəsü avarə, Hüseyna, Hüseyn.

Buyur Abbasi-ələmdarə, Hüseyna, Hüseyn.
Çəkdilər Zeynəbi bazarə, Hüseyna, Hüseyn.

Yaraşırmı o vəfadarə, Hüseyna, Hüseyn
Şimrə Zeynəb gedə yalvarə, Hüseyna, Hüseyn.

Ey verən şövqilə ümmət yoluna ətşan başı,
Gün həya eylərdi başına düşsün qır daşı.
İndi istər ki, Yəzid eyləyə bacın qardaşı,
Əntə məmnu' min əl-ma'i-Fərat Hüseyna, Hüseyn.

Yol uzaq, naqələr üryan, Hüseyna, Hüseyn.
Zülmilə başını daldan, Hüseyna, Hüseyn.
Bir tərəf naləvü tuğyan, Hüseyna, Hüseyn.
Bir tərəf ahi-əsiran, Hüseyna, Hüseyn.
Qönçətək bağrım olub qan, Hüseyna, Hüseyn.

Mən hara, Kufə hara, kuçə hara, Şam hara?
Deyiləm rumü firəngü ismivü islam hara?

Baş açıq bəzmi-Yəzidi-səgi-xudkam hara?
Əntə məmnu’ min əl-ma’i-Fərat Hüseyna, Hüseyn.

Başını, ey şəhi-əbrar Hüseyna, Hüseyn.
Şamın övrətləri daşlar, Hüseyna, Hüseyn.
Yoxdu tavan dəxi zinhar, Hüseyna, Hüseyn.
Ola məni-zarə həvadar, Hüseyna, Hüseyn.

Hanı bəs Heydəri-Kərrar, Hüseyna, Hüseyn.
Ey çəkən tiği-şərərbar Hüseyna, Hüseyn.

Mən həman Zeynəbəm, ey sibti-Rəsuli-mədəni,
Sinəsi üstə anam Fatimə bəslərdi məni.
İndi zəncir vurub boynuma bu Şimri-dəni,
Əntə məmnu’ min əl-ma’i-Fərat Hüseyna, Hüseyn.

Ey düşən peykəri meydanə, Hüseyna, Hüseyn.
Bulaşan şövqilə al qanə, Hüseyna, Hüseyn.
Oturub sizdə divanə, Hüseyna, Hüseyn.
Ol şəfi Asiyi-nalanə, Hüseyna, Hüseyn.

Rəhbər ol rövzeyi-rizvanə, Hüseyna, Hüseyn.
Qoyma duzəxdə yanə narə, Hüseyna, Hüseyn.

* * * * * * *

Ey salan Zeynəbi avarə, Hüseyn.
Çəkdirən kuçəvü bazarə, Hüseyn.

* * *

Çün səni qövmi-dəğa qıldı şəhid.
Qoydu yüz xeyməyə ki, əhli-Yəzid.
Nofəlü Xunivü münğəz qəyid,
Qıldılar zülm binasını pədid.
Hanı, dadə yetə Əbbasi-rəşid.
Dəstgir etdi səni Şimri-pəlid,
Neyləsin Zeynəbi-biçarə, Hüseyn?!

* * *

Şami-şum içrə çəkildi çü qətar,
Cəm olub cümlə zənani-küffar,
Çaldılar çəngü dəfü bərbətü tar.
Necə tab eyləsin o Zeynəbi —zar
Çıxıban qürfəyə qövmi-əşrar,
Səri-pürxunini daş ilə urar.
Edələr tənə məni-zarə, Hüseyn,
Gah bu abidi-bimarə, Hüseyn.

* * *

Məclisə çəkdi Yəzidi-səgi-dun
Üsəranı, hamı dideyi-pürxun.
İstədi bəzmdə Şimri-məl'un
Kim, kəniz eyləyə gülbünimi o dun.
Qalmayıb səbr bəhəqqü biçun,
Yox əlacım gərək axərül-nun.
Əcz üziylə bu günüqarə Hüseyn,
Yalvarə qolsuz ələmdarə, Hüseyn.

* * *

Oxşuyub ağladılar Zeynəbilə hicran Əkbəri.
Simtən, gülgunkəfən, sərvi-xuraman Əkbəri.

Şanə çəkdi Ümmi-Leyla zülfi- mişkəfşanına,
Ta gedə ol hüsnilə qövmi-dəğa meydanına.
Şimri-zilcövşən batırdı kakilin al qanına,
Vermədi bir qətrə su öldürdü ətşan Əkbəri.
Şahi-xuban Əkbərim, Zülfü reyhan Əkbərim,
Nazi-bu cinan Əkbərim, Naneyi-qəltan Əkbərim.

İstəsə hər kim ziyarət eyləyə peyğəmbəri,
Şəhri-şürbdə görərdi çeşmi-şəhla Əkbəri.
Şəhidi-səladkəfən düşmüş yerə gül peykəri.
Yoxdu bir kəs denən, qılsın qanə qəltan Əkbəri.
Şəhi-peyğəmbər Əli, Varisi-Heydər Əli,
Peykəri-yeksər Əli, Nizəvü xəncər Əli.

Dağ edər bu qəm məni kim, almadı dünyada kam.
Şərbətin könlündə qoydu ləşkəri-bişərmi-Şam.
Aya, kim imdadına yetsin bu gün Heydər babam,
Qoydular həsrət toya bu qövmi-ədvan Əkbəri.
Əkbəri-gülgunkəfən, Sərvi-rənayi-çəmən,
Simtənü qönçədəhən. Həq yolunda baş verən.

Zövqilə ümmət yolunda qurban olmağa.
Vəsli-bəzmü vüsali-qürbi-canan olmağa.
Asiya, gər istəsən müvəffəq üsyan olmağa
Zikr qıl novbadeyi-şahi-şəhidan Əkbəri.
Çün edib ol məhliqa ümmətə canını fəda,
Saxla hər sübhü məsa ol cavanə əza.

**Fərdlər**
**(Azərbaycan dilində)**

Gəlmişik meydanə biz əllərdə tiği-intiqam,
İstərik şahzadədən bakirə düxtər qanlısın.
* * *
Sevinirsənmi, köpək, Xan qızını həcv eylədim,
Səni də həcv eyləsəm ……… kim kəsən əst?!
* * *
Tövbə, vallahi əgər Kə’bə üzün görmüş ola,
Bu hara, Kə’bə hara, öylə məkan, böyülə tula?!
* * *
Ünas adı ilə zikr olmağın nöqsanı vardır zatə,
Yapış Pəri yaxasından takim, sənə pədər tapsın.
* * *
Şenidəm ke, bər piri keşiş-e deyr şodi,
Xoş be hal-e şoma, aqibət be xeyr şodi[1].
(Eşitdim ki, qocalıqda kilsə keşiş-i olmusan,
Xoş sizin halınıza ki, aqibətiniz xeyir oldu)

---

[1] 1974-cü ildə S.Ə.Şirvani Şamaxıda ruhani məclisinin açdığı məktəbdə işə girən zaman dostu A.Asi bu fərdi zarafatla fars dilində yazıb ona göndərmişdi.

## MÜŞAİRƏ

Nəva:

Saqiya, məclis ara çay gətir.
Mütriba, çəngü neyü nay gətir.

Asi:

Mən ki, şair degiləm dünyadə,
Mənə bir toxmaq ilə yay gətir.

Nəva :

Axund, sənə nə səyaq xoşdur?
Sarıqmı və ya papaq xoşdur?
Başa sarınan əmmamələrdən
Yaşıl, ya sarı, ya ağ xoşdur?

Molla İsmayıl:

Yox çayü çörək bu dudmanda,
Bir nəqşəli boş otaq xoşdur.
Gər cürətim olsa, xan, deyərdim:
Bir xəlvət otaq, uşaq xoşdur.

## HƏCVLƏR

### Kərim ağanı həcv

Saqiya, ey nigari-gülrüxsar,
Qəflət etmə, yetişdi fəsli-bahar.
Lalə tutdu piyalə gülşəndə,
Nuş edib, nərgis oldu məstü xumar.
Laf urub quyiya ənəlhəqdən,
Qönçəyə şaxdən qurubdu dar.
Nə rəvadır ki, böylə mövsümdə
Qala üşşaq künci-hicrədə zar.
Dolanım başına, ayağə durub
Tök əyağ içrə piyaleyi-gülnar.
Badədən ta ki, vəcdi-hal bulub,
Sənə razi-dilim qılım izhar.
Mədh edim bir Kərimi-bikərimi
Ki, yəqin bir dirəxtdir bibar.
Xəlqə məşhur olan həmaqətinə
Özü insafən etməsə iqrar,
Cümləsin eyləyim ona sabit,
Deyim, ey bikəmal, misli-həmar.
Yoxdu dünyadə sən kimi murdar,
Əhməğü ziştruyi-nahəmvar.

xxx

Xəlqə məşhurdur ki, sən xərsən.
Ona şəkk yoxdu, bəlkə bədtərsən.
Qoymayıb fərq ziştü zibayə,
Əqlinə hər nə gəlsə, eylərsən.
Baftalı arxalıq geyib daim,
Həm taxıb kahi-vəznəzər sən,
Qorxmuyub tə’ni-dustü düşməndən,
Bağlayırsan qızıllı xəncər sən.

Gərçi məyussan təkəllümdən,
Olasan kaş, kor, həm kar sən.

Bir ərizə yazıb qoburnatə,
Edib əlhah, ondan istərsən.
Almısan ta ki, evpulu məndən,
Olasan xak ilə bərabər sən.
Aqibət, etdilər onu atqaz,
At ilə bəhs etmə, sən xərsən.
Bağı-Dursunda ismi xərmöhrə,
Gərçi məqbul, kani-gövhərsən.
Yoxdu dünyadə sən kimi murdar,
Əhməğü ziştruyi-nahəmvar.

xxx

Bu nə işmək, nə vəznədür, nə papağ,
Bu nə Şiraz qəlyanıdır, sarsag!
İtireydim sənin təki atanı,
Gecə-gündüz gəzeydin əldə çırağ.
Madərin hamilə olanda sənə,
Yeriyində içibdi şiri-ulağ.
Sən əzəldən bu günə əhməq idin,
Götürdün yoxsa sora xibti-dimağ.
Səntək eşşək, adın edib bədnam,
Yoxsa arif məkanıdır Qarabağ.
Heyf kim, dövri-çərxi-dunpərvər,
Gərdiş etdi genə bir özgə səyağ.
Verdi Bilqeys həşmətin badə,
Aslan ata cahandan oldu fərağ.
İntiqal etdi aqibət irsən,
Səni-dilazarə mülkü dövlətü bağ.
Şimdi adam edib səni dövlət
Yoxsa min rütbə yeydi səndən ulağ.
Yoxdu dünyadə sən kimi murdar,
Əhməğü ziştruyi-nahəmvar.

xxx

Şəhri-Tiflisdə qalıb müddət,
Qayıdıb saldın aləmə şöhrət.
Kim şahənşahdan təvəqqə edib
Yazmışam key şahi-qədri-qüdrət,

İsmətin şəldi, yoxdu basirəsi,
Xəlqə ondan yetir müdam afət.
Həm dilazarü bisərü padır,
Nə ruzdur tapa böylə izzət.
Etdi məğbul guya sözünü,
Onu məzul eylədi dövlət.
Buna kim etibar edər, əhməq,
Buna kim bavər eylər, ey nükhət?!
Kəndin koxasın çıxarmağa
Sənə zakon verməyib qüdrət.
Ənazüli-əzəl nəsbinə nə rəva,
Sən qarışmağa edəsən cürət.
Bir də bu gunə söz desən, billahi,
Cümlə aləm oxur sənə lənət.
Yoxdu dünyadə sən kimi murdar,
Əhməğü ziştruyi-nahəmvar.

xxx

Mötəqiddir buna səqirü kəbir,
Xəlqi icad edəndə heyyi-qədir,
Yaradıb əqli, leyk cismlərin
Cümləsin abü gildən edib xəmir.
Qəmu əcsamə əql verdi Xudaya,
Eylədi əqli mülki-cismə əmir.
Yetdi itmamə əql ənbarı,
Qaldı biçarə, qalıbən dilgir.
Ol zəman vəhyi-Xudayi-əkbər,
Yetişib key məlayiki-təsvir,
Eybi yoxdur, Kərim qalibini
Əqilsiz abü gildən et təxmir.
Ol səbəbdəndi fərq qoymazsan
Ləlü xərmöhrəyə, nədir təvfir.
Çünki arisən əqldən, ey dun,
Vurula payına gərək zəncir.
Bir də sən adəm olmağın, heyhat,
Səxt müşküldü, yox ona tədbir.

Yoxdu dünyadə sən kimi murdar,
Əhməğü ziştruyi - nahəmvar.

## ASİNİN XAN QIZI NATƏVANA YAZDIĞI HƏCV

Beşno, ey dil, süxənəm töhfeyi-hər əncümənəst.
Uyma dünyayə, bu dünyayi-dəni çünkühənəst.
Çox cəvanani-Siyavuşsifəti Zali-fələk,
Xuneşan rixtə, karəş həmə məkrəstü fənəst.
Sağəri-badeyi-gülgun bekəfe-meyxoran,
Kaseyi-fərği-Fəramərz-o ləbe-Təhəmtənəst.
Dad əz dəsti-qəzavü qədəri-bədhərəkat
Ki konun qədri-xəzəf beh ze əqiqi-Yəmənəst.
Be cəhan nist kəsi əz sirri-zəmirəm vaqif,
Çarə yox dərdimə, bu dərd məni öldürənəst.
Ruzü şəb xuni-cigər mixorəm, allah bilir,
Hasilim şəhri-Qarabağda dərdü mühənəst.
Şikveyi-dil be ke quyəm ki, be təng amədeəm,
Çəkə bilməz bu qəmi kimsə ədər kərgədənəst.
Xofte rubahmisalan bekonəne- şiran,
Qafi-Simürq siyahətgəhe - zağü zəğənəst.
Guş qıl ta ki, yüzündən birini şərh qılım,
Zan süxənha ki, məra baisi-rəncü mühənəst.
Xastəm zəmmeyi ze ənduhi-xodəm şərh konəm,
Dil be mən xəndəzənan qoft ki, in …..zənəst.
Düxtəri-xani-Qərabağ bebin, həmrazəş
Biri Şirin, birisi Şəkkəri-şəkkərşikənəst.
Gecələr sübhə kimi söhbət olur yanında,
Yoxdu bir özgə söz, əhval, ….. …dirənəst.
Çənd tən gəşte müqərrib be hürurəş daim
Biri Cirti, biri Sadiq, birisi kor Həsənəst.
Sadiqi məhrəm edibsən nə üçün kinyaza,
…əcəkdir uşağı qoyma ki, o …….. əst.
Bir içim çaydan ötər Şeyx Həsən şamü səhər,
Qapını dövr edər çünki səgi-Əsgərənəst.
Malü əmlakını verdin yelə sən şəhvət üçün,

Xişü əqvamuva bax, ….., acından ölənəst.
Füqara silkini məhrum eyləyib bilmərrə,
Nəsli-sufi düzülüb bu qapıda bir çətənəst.
Hikkəsin gör ki, anın qeyzi dutan saətdə,
Küsübən Xan Bağına payi-piyadə gedənəst.
Ey könül, etmə təəccüb bu həman ……dür
…dirən mehtəri-qatırçıya vəqti-keçənəst.
Yox məzəmmət yeri çoxdandı qısır qalmışdı,
Bir uşaqdan ötəri yüz min ocağı gəzənəst.
Bala həmmam adına bağda …..xanə tikib,
Axirət guşəsinə ….. əcəb göz tikənəst.
Xof edər öldürələr Seyyidi, getməz uzağa,
Xan bulağından buraya, burdan oraya köçənəst
Bu həman …..di, yaran, gecələr kəndir ilən,
Təğini dəlv kimi pəncərədən çəkdirənəst.
İftixar etmə gəlir yanuva bir şəxsi-əmir,
Mürği-çay birdir, hər kəs ona dən verənəst.
Pərdə dalında qoyub şövhərivi, ey kosdəh,
Gecələr hakimi-şəhr ilə nə xəlvət süxən əst.
Bu nə xəlvətdi ki, divani-şəriət sözünü
Şeyyidə məsləhət et, şeytana papuc tikənəst.
Yoxdu gər özgə işin,qapıda qoymaq nə üçün,
Şövhərin çünki sənin sirrivü cümlə bilənəst.
Dutalım ki, o qurumsaqdı, çi insaf əst in,
Məgər in şiveyi-şəriəyə mərd əstü zənəst.
Yurdun  yox, nədi bu tülküsifət, kəcgərdən
Barı bizlər kimiyə …dirə kim, tirtəpənəst.
…..lik felini örgətdi ona Fatma xanım
İndi  həm tanıram Bədruyinə soxduranəst.
Piş əz in Fatma xanım sərzədə əz rövzəneyi
Bud pişxidməti-u Məmməd gürgi-kühənəst.
Alətin rast edib soxdu onun fərcindən,
Fatma xanım dedi eşşək kimi in kari-mənəst.
Guft Məmməd: - Əgərəm razı neyi, baz kəşəm
Guft: - Heyhat, məkəs, baz çe cayi-süxənəst.
Sən nə cürət eylədin, bu işə iqdam eylədin,

Dedi xanım, çəkərəm, qeyz ilə cürmi-mənəst.
Fatma xanım buların fələyi-sərkərdə idi,
İmdi bunlar ona sərkərdəyi-hər felü fənəst.
Əhd qıldım ki, üç il bəndə ola bağï həyat
Bitirəm Hacəri, əfsus, o biri səhvi-mənəst.
Etməzəm həcvini mən, layiqeyi-şər degil,
Həcvini etsəm əgər, kim bu …imi kəsənəst.
Novbəhar eyşinə istərdi yetə Xanbikənin
Şiddəti-didə qalıb Bəhmən ruyinə tənəst.
…digim şəhri-Qarabağda bir səg yox idi
Naxçıvan iti bizə, şalü üzük göndərənəst.
Xan xiyal eyləyibən Xanbikəni verdi ona,
Xan, xiyal eyləmə, ….., sənə …… çəkənəst.
Aman, allah, yaşasın torpağı sanı Qubuşun,
Bəhri-yek rumğa ərəği-fin atasından küsənəst.
Aman, allah, beli nisbət edibdir Qubuşa,
Bu köpəkoğlu, köpək Qubuşa zəhmət verənəst.
Xan yəğmayə gedib, Gövhəri-dürdaneyi-xan,
Xatəmi-pakı-Süleyman be kəfi-Əhrimənəst.
Div bər bord  pəri ra kəməri-Şişə şikəst,
Axər in əmri-əcəb töhməti-əhli-vətənəst.
Be hər daməd vələd nəzdik bayəd
Seyyidin mədhinə dut guş, əcayib süxənəst.
…iylə Seyyidi-səlatsərayi-sümsüvü saz
Həft sin ilə səbahə kimi təhvil verənəst.
Qələt etdim ona seyyid dedim, adəm degiləm,
Bu Yezid oğlu əgər əz nəsli-Hüseynü Həsənəst.
Be xodavü be Əli nist müttəla cəddəş,
Sufiyi-Kufədi bu əsli kosyalyanəst.
Diqqət ilə bu dəni dəhrə baxın, ey yaran,
Məsnədi-Xanda sufi balası əgləşənəst.
Bu nə tavus, nə bulvarü nə İsa bulağı?
Ey papaqcı köpək oğlu, belə dövran keçənəst.
Sədri-məclisdə keçib  Xan kimi aram tutar,
Bir deməz təklədə bez satdığım axər dünənəst.
Unudub ata-babasın, geyər çəkmeyi-rus,

Bu köpəkoğlu, köpək gör ki, necə simtənəst.
Ey əmisi köpəkoğlu, de görüm sən nəçisən?
Qardaşın oğlu məgər məndə sənü səndə mənəst?
İki övladı on ildə güc ilən əkdi Xasay,
Səgbəçə sərçə kimi həftədə bir qız əkənəst.
Knyazın qardaşının gəldi sədasın eşidib
Bikənin şalvarının atda qaçıb gizdənənəst.
Var idi bundan əzəl müflüsi-dinar, fülus,
Taciri-şalü qədək şimdi yedək çəkdirənəst.
Yetişibdir necə gör səltənəti-üzmayə
Səltənət kimi pərilər ona qəlyan verənəst.
Ah əzin gərdəni-mina ki bər u zülfi-siyah
Şahmarist ki, piçan be səri-narvənəst.
Çeşmi-caduyi kəhilü səri-zülfəş biməsəl,
Fitneyi-kişvəri-Çin əstü Xətavü Xütənəst
Rəft mətlub ze kəfəm mand Xanoğlan, ey dil,
Qoyma qalsın anasın …… vay deyənəst.
Qar basıbdır ocağa zərrəcə yox əqlü şüur,
Qeyrətəş çün pedəri-xod, be səfahət çü mənəst.
Varisi-Xana baxın, başına torpağ, Qarabağ,
Naümidəm mən əz u çünki ze nəsli-çeçenəst.
Bir görün bu sufizadə necə tuğyan eyləyib,
Xan kimi məsnədi var, ədlidə divan edənəst.
İn həmin dərgəhi-üzmast ki, xanani-cəhan
Elçi, hədiyyə təməllüq edibən göndərənəst.
İndi viranə qalıb ağzı günə, bayquş ular,
İki dılğır gədə qalmış, nə gələn, nə gedənəst.
Xastəm ta ze səri-şövq dəhəm tul kəlam,
Təb qom kərd rəhi-nəzm tufan əstü çənəst.

**Asinin Xan qızını həcv etməsinə cavab olaraq Seyid Əzimin ona ünvanladığı həcv müxəmməs**

Asiya, sözlərivün hər biri min canə dəyər,
Bir sözün dəhrdə yüz min düri-qəltanə dəyər,
Nəzminin hər biri yüz lə’li-Bədəxşanə dəyər,

Bəhri-təbin ki, gühər kanıdı, min kanə dəyər,
Xatirin gülşəni yüz rövzeyi-rizvanə dəyər.

Gərçi tifli-süxənə çoxlar olubdur dayə,
Leyk bihudə salıblar başını qövğayə,
Dəstrəs olmadı hər kəs gühəri-mə'nayə,
Gərçi çoxlar bu ərusi eyləyir pirayə,
Sanma xamən kimi zülfi-süxənə şanə dəyər.

Şişə içrə səni ol kimsə ki, etmiş iycad,
Hər pərizad visalilə edibdir dilşad,
Xatirin xoş meyi-gülgun ilə, tə'bin mö'tad,
Fərəhin çox, kədərin yox, dəxi mülkün abad,
Bu şərəf qədr ilə yüz mənsəbi-sultanə dəyər.

Bu da bir lütf ki, aləmdə Xudavəndi-kərim,
Lütf edibdir kərəmindən sənə bir təb'i-səlim,
Olu viranə bu mə'murədə hər mülki-qədim,
Leyk itməz əsərin, şer ilə bir dürri-yetim,
Bu fərəh, həqqi ki, yüz mülki-Süleymanə dəyər.

Təb'i-şe'rin ki, sənin şöhrət edib dövranə,
Leyk, əfsanəyə sərf eyləməyin əfsanə,
Gəldi bir həcv bu günlərdə yenə Şirvanə,
Demiş idiz onu bir nəsli-əzimüş-şanə-
Ki, dəri-dövləti yüz dərgəhi-xaqanə dəyər.

Tapmısız eyb bunu ol gühəri-yektadə —
Ki, gedib seyyidə, namusunu vermiş badə,
Bu deyil eyb, təfərrüc eyləsəz mə'nadə —
Ki, bu xanzadə isə, ol biridir şəhzadə,
Həqqi kim , aləmi-mə'nada bu iş canə dəyər.

Yəzdgürd padşəhinin qızı, ey Asiyi-məst,
Bəs neçün verdi Hüseyn ibn Əli dəstinə dəst?
Bu haman nəsldir, ey taqiyi-gusaləpərəst,

Haşəlillah, yetə bu əmrdən ol mahə şikəst,
Ya ki, bir töhmət o şəhzadeyi-dövranə dəyər.

Bu haman Xan qızıdır kim, buna yox şübhəvü şək,
Eləyibdir neçə pambıq satanı dəhrdə bəg;
Asiya, söylə itirmək nə rəva həqqi-nəmək?
Bəli, adət belədir kim, ola hər kəs eşşək,
Yesə hər kəslə nəmək, sonra nəməkdanə dəyər.

Görə bir şəxs ki, bir şəxsi-kərimin kərəmin.
Cudü bəxşayisü feyzü kərəmi-dəmbədəmin,
Çəkməyə fərq bəlasın, dəxi bu dəhr qəmin,
Dönübən həcv edə axırda vəliyyün-nəəmin,
Bu sitəm gəbrü nəsaravü müsəlmanə dəyər.

Biz eşitmişdik olur əhli-Qarabağ qəyur,
Gözləyər bir-birini işdə bəqədri-məqdur,
Səndə bərəksinə bu əmri-əcib etdi zühur,
Edib öz əhlinizi həcv, həm etmək məşhur,
Arif ol kim, bu rəviş məşrəbi-ürfanə dəyər.

Asiya, gərçi müzəkkər görünürsən, dişisən,
Aləmi-xakdə növ'i-bəşərin iymişisən.
Bisəbəb tutdun, əzizim, nə üçün bu işi sən?
Yoxmu qeyrət əsəri səndə, sən axır kişisən!
Həcvi-zən eyləməyin şiveyi-mərdanə dəyər?!

Gərçi ol zən dəxi bir şirzəni-yektadır —
Ki, bu zənlikdə bizimtək kişidən ə'ladır,
Ol biri seyyidi-alinəsəb, həm ağadır,
Zadeyi-şiri-Nəcəf, zeyqəmi-bipərvadır —
Ki…sən təki yüz min köpək alsanə dəyər.

Şaira, həcv demək izzətə bir mayə deyil,
Şe'rdir, yaxşı-yamanı olu, bu, ayə deyil,
Həcvə adət eləmək şairə bir payə deyil,

Kişilik mayəsi ancaq xayə deyil,
Var elə zən ki, biri əlli min oğlanə dəyər.

Şuri-mey yoxsa sənin başına qətti həşəri.
Məst olub saxlamadın hörməti-xeyrül-bəşəri,
Həcv edib nəslini, tutdun bu qədər şurü şəri,
Adını qoyma dəxi şieyi-isnaəşəri,
Ali-peyğəmbəri həcv eyləmək iymanə dəyər.

* * * * * * * * * *

Gör səni kim bəg edibdir, bir utan adından!
Yoxsa, Asi, çıxıb əyyami-sələf yadından?
Bir xəbər tut soruşub haləti-əcdadından,
Get, xəcalət çəkəsən, şərm elə ustadından —
Ki, sənin bu əməlin şiveyi-şeytanə dəyər.

Seyyidə həcv dedin, yaxşı deyildir bu sayaq,
Ay qoduq oğlu qoduq, şairə sən atdın ayaq,
İndi bundan sora tut sən də dəxi həcvə qulaq,
Yay günündə babanın başına çallam toxmaq.
Tollanıb……….həllac kimi ranə dəyər.

**Gəncəli Mirzə Mehdi Nacinin həmin münasibətlə Asiyə yazdığı həcv**

Beşno əndərzi-məra fayizi-hər əncümənəst.
Əndəlibi– soxənəm cəhcəhguyi-çəmənəst.
Pişi-ərbabi-həsəd nist murad ra ğədəri,
Bər əshabi-bəsarət həmə dürri-Ədənəst.
Çeşmi-əhli-nəzəran ra həmə zəvast-o zeya,
Kərdən-e əhli-həsəd ra həmə tövğ-o rəsənəst.
Nəzd-e ərbab-e qərəz təlxtər əz hənzəl-o səbr,
Bəhr-e ətfal-e təbiət həmə şəhd-o ləbənəst.
Qafil olma, göz açıb nik nəzər ilə gələn,
Ançenin ğövli-xurafat ze qafil şodənəst.
Pəs ayində durmuş biri təlim üçün,
Hər kəsin tuti təbini o kəs ogrədənəst.

Qoyulub büxlü həsəd qəlbivə əvvəldən
Çək əzabundu sənin, bu sənə dərdi-gərdənəst.
Fe'li-əqrəb ki, be inğövl güvah əst səhəc,
Dayima əz peyi-azar be fikri-zədənəst.
Düxtəri-xana nöçün siz olasız movəzqu,
Karvana nə qədər it hürə, karvan keçənəst.
Və'z ol yerdə gər gedər sözü məsmu olana,
Nə ki ol kimsəyə ki, kəlama çezənəst.
Bu hamı xam təmə'lik yoludur, başlamısan.
Küçügün nəfsini gör, qəysəvədən pay umanəst.
Sizə şayəstədi bir çömçə ilə sağsı çanaq,
Buna göz tikmə,bu bir çətənü barfitənəst.
Bir xiyal eylə, gör, oğlan, kimin övladıdı bu.
Ata-babası bunun faili-çəngi-peşənəst.
İbrahim xan degildirmi ki, sizdən həmə şəb
Bir nəfər düxtəri-pakizəvizi çəkdirənəst.
Hanı Qəleyi-Şişə, o Pənah xan hanı?
Rəzmü çəngi həmə övğat anun səfşekənəst.
O, Pənah xandı ləşkər çəkib İrana gedib,
O ruhi-hakimi Sadıq xana göndərən eşənəst.
Ata-babalaruvuz it kimi quyruq buluyub,
Dərbarında oların hamusu yal içənəst.
Şimdi bu gərdişi-əyyam təğazasından
Sən kimi itlər ona of-of edibən hürənəst.
Heç xiyal eyləmədin xani-əzimül-şandan
Feyzül-qamı onun şamili-hər mərdü zənəst.
Neçə nakəsləri kəs eylədi ol kani-kərəm,
Bivətən kimsənələr sahibi-mülkü vətənəst.
Əbri-feyzü kərəm cuşə gələn dəmdə onun,
Baisi-zendegi susü sərvü səmənəst.
Düxtəri-xanə baxınca özüvə eylə nəzər,
Karuübarın həmə ruzanü şəban məkrü fənəst.
Seyyidün hüsnü cəmalı sənə çox bəd görünür,
Öz gözüylə bax ona, onu ona görkəzənəst.
Görmə bihudə bu ayində çox zadlar var
Demə dünyayə ki, dünyayi-dəni …….əst.

Çərm həmvarə şikayət o gəzanədən eylər.
Fe’li-kəffaşdı bunlar nə ki cümrü gəzənəst.
Fe’li-bəd çoxdu bu dünyadə qəmudan bədtər
Dəhəni-bəd, dəhəni-bəd, dəhəni-bəddəhənəst.
Nə rəvadır ki, ola xan qızı sizdən ancaq,
Hər kimə baxsa görər ki,o da ondan kəsənəst.
Neyləsin düxtəri-xan, hansını etsin razı,
Bu təmənnaya düşən sən kimi çox … verənəst.
Adəti-dəhr budur, doğru deyibsən o sözü,
İbn Davud məqamında duran Əhrimənəst.
Nə təəccüb yeri var munda ki, siz eylərsiz,
Şahbaz ovlağı cövlanına zağü zəğənəst.
Bax təvarixə, nəzər eylə gələn əxbarə,
Ruzigarın işidir, gərdişi-dövrü zamənəst.
Padşahani-Kəyan noldu, hanı Keykavus?
Pəhləvanani-cəhan səfşekənü tiğzənəst.
Hanı Cəmşid bina eylədi ahən qayırıb,
Məzrəi-dəhri həmə şüxm eyləyib əkdirənəst.
Hanı İskəndəri-zərtac, hanı Nuşirəvan?
Qüdrəti-hökmləri ta be Xətavü Xütənəst.
Pəhləvanani-cəhan noldu, qəmu düşdü yola,
Bexüsus olardan sər səfi ol Töhmətənəst.
Hanı üşşaği-bəlakəş, hanı Vamiq, hanı Qeys?
Biri Şirin həvasilə gedən kuhkənəst.
Dərdi-möhnət çəkənin biri Züleyxa idi.
Baisi-rənci onun Yusifi-gülpirəhənəst.
İki məşuq həvəsilə gəzərdi Xosrov,
Biri Şirin, birisi Şəkkəri-şəkkərşikənəst.
Düşdü səhravü biyabanə o Məcnuni-həzin
Leyli, Leyli-deyibən mənzili-mərgə yetənəst.
Şimdi gəl, mən sənə bir ərz eləyim, ey şair,
Düşmə seyidlə bu miqdar ki, cəddəş Həsənəst.
Gör onun cəddinə düşmənlik edənlər noldu,
Həmə dər zəhmətü rəncü ələm, əndər mühənəst.
Şəqq eylər bədənin cəddi onun şəqçidir
Şəqq etdi qəməri göydə ki, şəqq eyləyənəst.

Ol Yəzidin başına gəldi nələr dünyadə,
Aqibət nari-əzabi-əbədə həm düşənəst.
Biri ol Şimri-ləin ibni-ləin, ibni-ləin.
Baisi-xuni-şəhidan həmə peyyi-kəfənəst.
Biri ol İbni Ziyad idi be henqami-rəza
Ki yazıblar onu dəftərlərə kim itəmənəst.
Asiya, asiyi-dərgahi-Əli olmagilən,
Zülfüqari-Əlidən eylə həzər, tizkəsənəst.
O, Əlidir, o, Əlidir, o, Əlidir, o, Əli,
Tifl vaxtında ki gəhvarədə əjdər bölənəst.
Xaneyi-qəlbüvü nür eylə Əli hübbü ilə,
Hübb qəlbində olan kimsə ədisi - qərənəst.
Kim ki, övladi-Əliylə eyləsə düşmənlik,
Sən yəqin eylə anı, Əkbərə zərbət verənəst.
Bir məqam idi verib həqq ona əlşəkk, sənə nə,
O kişi vermiş ona, aləmə yol göstərənəst.
Bu qədər büxl, həsəd səndə ki,var qafilsən,
Bu mərəz rəgə çəkib bağrıvu axər sökənəst.
Bu mərəz böylə mərəzdir ki, bulunmaz dərman.
Bavər etmə bu sənin bəd bədənindən gedənəst.
Bədənindən bu mərəz heç sənin əl çəkməz,
Laəlac olmağı hər təbbədə bu məmtəhənəst.
Atəşi-həqdi, həsəd bir belə atəşdir kim,
Düşmə bu fikrə ki, hər ab anı söndürənəst.
Siri-madərlə içibsən anı henqami-riza
Ol zamandan təni-napak üzə ol gəzənəst.
Mərgdir, mərg əlacı ki, ölüb qurtarasan,
Qorxuram anda dəxi ol küsüb gedənəst.
Fikri-xeyr ilə düşübsən bu xiyalə, likən
Dütma ümmid ki nəxli-əməlin barverənəst.
Saxla ağzun, həzər et, bağla dilin, ol xamuş
Ki, bu söz sahibinə səxt duvəz göndərənəst.
Tabe olma bu qədər nəfsivə, məqul əgləş,
Çox dogərlər o gözü görsə boyun çəkmiyənəst.
Babun ol toxmağ ilə yayı alardı əlinə,
Sübhdən axşamadin atduğu panbuq dü mənəst.

Bir qulaq ver, əzizim, vəzli vəzdən səs gəlir,
Çox uzaq vaxt degildir gözüm, oğlan, rövşənəst.
Biri öz nə ……. sacına həcv deyə
Nə təəccüb yeri var zadeyi-banbuq atanəst.
Nə cavab ilə əda eylərsən sən bu sözü,
Gər sual eylərsən, siz bəg olanı haçanəst?
Adəmiyyət necə mə'dum olubdur sizdən
Nəslivüz cümlə tamam yedigi qaba …. əst.
….. ol toxmağının dəstəsinə mən babavun
…….. sallıyıban payə bezən ha-bezənəst.
Əlbəttə can, yaxşısı bundan sora həm dağı gəlir
Bu ki bir həcv degil cümləsi çərən —pərənəst.
Təlx bar versə əgər nəxl nədir bais ona?
Bilməzəm təlxdədir, ya ki, o nəxli əkənəst.
Bizeyi-zağı əgər pərvəriş etsən nur ilə,
Axərində görüsən zağdı, ya sağsağanəst.
Bir libası ki, əgər eyləyə xəyyat xərab,
Tikənin təqsiridir, ya ki, onu tikdirənəst?
Boşalıb budağı, gər düşsə yerə miveyi-bağ,
Meyvənin təqsiridir, ya ki onu düşdürənəst?
Kimdə bir elçi əgər danışa nalayiq söz,
Elçinin təqsiridir, ya ki, onu göndərənəst?
Gəzdirə bir koru bir kimsə, sala çahə anı
O korun təqsiridir, ya ki, onu gəzdirənəst?
Biyzədən dişrə gəlib beççəyi—büt öz kəcidir
O anun felidi, ya kim anı bəradər verənəst?
Yox məzəmmət yeri bu babidə hərgiz səndə.
Ki, dəbistani-əzəldə sənə təlim verənəst.
Zən hesab eyləyibən cürət edib həcv etdin,
Genə aslan balasıdur, demə ona ki, zənəst.
Çək atun başını çox cürətlə səgritmə,
Çox sən kimlər qəbrqazan, gorkənəst.
Gülü gülzar Qarabağda bu tazəvü tər,
Ya şəqayiqdi və ya susən, ya yasəmənəst.
Dürri-yekdanə deyim, ya ki, əqiqi-Yəmənəst,
Şali-Kəşmir deyim, ya zərbəfti-dükənəst?

Demə biqədr ona, qüdrəti var, qadirdir,
Huşyar ol, əzizim, o nə mən əstü nə sənəst.
Demə ki, acizədir, gəlməz əlindən bir zad
Nütfeyi-şiri-jəyandır, genə düşmən basanəst.
Qədəhini gördüm anun təbimə çox pis gəldi
Deməsin kimsə ki, boşqabə badımcan düzənəst.
İstəsə mədh əvəzində bizə ən’am edələr,
Bir danə xələti-şayəstə beh əz səd tümənəst.
Naciya, dur yola düş, bəsdi dəxi dünyadən,
Çəkmə bari-qəmi-dünyanı ki, səngin, gerənəst.

**Qarabağlı Abdulla bəy Asi təxəllüslünün həcvinə gəncəli M.M.Naci təxəllüslü yazıb**

Asiya, istərəm bir neçə əfrad sənə,
Xatirin şad elə, ta kim yetişər şad sənə.
Olma bikarə cavabın tez əda eyləgilən,
Ta kım ol barədə biz həm edək imdad sənə.
Pişrəvsan, deyilir nəzmdə həm kamilsən
Şüərayi-Qarabağ cümləsi minqad sənə,
Qalanın abü həvası necə gör naqis imiş,
Etməyib tərbiyəti-kamil o bərbad sənə.
Çəkəsən qırağın ta ləb gör, ey Asi,
Nəzmi-əvvəldə bəsi çaxmışam otaq sənə,
Toxmaq ilə yayı hər yerdə ki, görsən, yandır,
Ki, olar qoydu cəhan içrə belə ad sənə.
İsmi-Həllacı götür, qoy nənəş oğlu özü də
Ar olursa ki, ola bir belə Əhdad sənə
Olma dilgir bu ismü bu nəsəbdən, oğlan,
Cəddüvüz ruzi-əzəl böylə qoyub ad sənə.
Qüdrəti yoxdu edə həkk bu ismi səndən.
Ciddi cəhdilə verə gər tişəni Fərhad sənə.
Qıllanıbdır ….. yoxdu sənə bir səməri,
Gətiməz nəf dəxi mözeyi-mötad sənə.
Elə bir … ki, xuda dərdə xuda vermişdi,
Çox mədaxil gətirirdi o xudadad sənə.

Heyf, səd heyf ki, getdi o cavan dünyadan
Dəhr zülm eyləməli, eylədi bünyad sənə.
Yumuşalmaz ürəgin böylə əməldən, bilirəm.
Verə gər ….. yüz mərtəbə həddad sənə.
Xəmr edibdir bədənində dəmi ol qəndi-qəliz
Ayda bir fəsd ….. gərək eyləyə fəssad sənə
Nə üçün verdin əl zeylinə bir ustadın,
Ta verə bir para təlimlər ustad sənə.
Böylə deyirlər ki, uşaqlıqda olubsan sabun,
Hər vilayətdə verirlər belə əsnad sənə.
Bu qədər fisqi-fücura ki olubsan mötad.
Duta bilməz dəxi bir kimsənə irad sənə.
Əl götür qaziül-hacatə yapuş oradə,
Bəlkə imdad eləyə axəri övrad sənə.
Səcdə qıl dərgəhi-məbudə axıt göz yaşıvu,
Olu ki, rəhm eyləyə seyyidi-səccad sənə.
Körpütək qəddüvü xəm eylə ki, keçsin məxluq,
Həməməldir bu əməldə poli-Bəğdad sənə.
Gələsən yanıma bu barədə var məndə əlac,
Yetibən səhhətə məlum ola bir zad sənə.
Olmuyubdu bu əməl səndə yəqinimdi mənim,
Əməlindən yetişib bir belə əfsad sənə.
Sən ki, öz nemətüvün sahibinə ağ oldun.
Layiq oldur deyələr dəhrdə Şəddad sənə.
Zəfi-sevda götürübdür damağun, ey napak,
Lazım oldur verilə həbbi-zərnabad sənə.
….. mövsümü keçmiş, sənə yox faidəsi,
Kuni-Teymurə gözdən tək o verir zad sənə.
Şeşü pəncilə qəza qoydu səni şəşdərdə,
Atdı bu möhrəni gör kim neçə nərrad sənə.

## Qarabağlı Xarrat Qulunun Naciyə cavab olaraq yazdığı birinci həcvdən bir parça

Çöp uzatmaz aranın deşiyinə bir əhməq,
Çünki niştər kimi var nişi onun, niş uranəst.

Təmə'i-xəl'ət ilə özünü saldın tələyə,
Bəli, quyruq görə tülkü tələ içrə düşənəst.

Mehdiya, məhdi-təfəkkürdə idi tifli-xəyal,
Oyadıbsan yuxudan, eylə yəqin yatmayanəst.

Dəxi bundan sora tab eyləgilən, gör ki, sənin
Həcvinə rağib olanlar nə qədər əhli-fənəst.

Yusifi, Asivü Novrəs, biri Mahmud, Fəna,
Biri Salar, biri Sadiqi-gürgi-köhənəst.

Dəxi Agahü Qara, Nizamü Məhzun, Şəhid,
Fənni-əş'ardə hər birisi bir Əhrimənəst.

Katibü Aşiqü Məxfiyyü Həkimü Müznib,
Azərü Sabitü Hicriyyü Vəfara hünəpəst.

Şüəra əllərinə düşdü əcəb dəstaviz,
Etməyincə səni rüsvayi-cəhan əl çəkənəst?

Ol xəbərdar yəqin «Beyti-xəmuşan» əhli
Hər biri həcv yazıb qulluğuna göndərənəst.

Şiri-dərrəndələrin saxlamışam zəncirin,
Yoxsa rübah şikar etməyə cümlə gedənəst.

Müntəzirdir şüəra Gəncə ara ta görələr
Bəyü xanzadə nə gunə sənə tənbeh edənəst.

**Molla Ağa Hacı Tağı oğlu Bixudun Abdulla bəy Asiyə məktubu**

Xabdən çün səhər oldum bidar,
Yadə düşdü sənəmi-laləüzar.
Çeşmi pürxunimə yol tapdı sirişk,
Dili-məhzunuma əyləşdi qübar.
Həsrəti-zülfi-rüxindən o məhin
Ruzi-rovşən mənə olmuş idi tar.
Yad edən dəm ləbi-şəkkərbarın
Qan yaşım xaki edərdi gülnar.
Zülfi-pürtabı düşəndə yadə,
Qıvrılardım neçə kim, qıvrılı mar.
Hər zaman sövt ilə, ya dust, deyib,
Xaki əşkimlə edərdim gülzar.
Gəh yer üzrə tökülürdü əşkim,
Gəh çıxardı göyə ahimlə şərar.
Gəh edərdim qəmi-əbrusində
Sinəmi naxüni-həsrətlə figar.
Gəh mənə xəndə edərdi qümri,
Gəh görüb halımı, ağlardı həzar.
Nə müğənni ki, edə rəf'i-məlal,
Və nə saqi ki, verə cami-əqar.
Əlqərəz, yüz qəmü ənduh ilə
Keçirirdim məni-qəmdidə mədar.
Nagəhan basdı qədəm mənzilimə
Ol büti-sərvqədü gülrüxsar.
Vəh nə büt, qaməti sərvi-Kəşmir.
Vəh nə büt, qeyrəti-mahi-fərxar.
Görsə tər sünbülünü zahidi-xüşk,
Atubən səbhəni, bağlar zünnar.
Tağı-əbrusinə gər düşsə gözü,
Dəxi mehrabə əgilməz, zinhar.
Eylədi mənzili ol huriliqa,

Əksi-rüxsari ilə rəşki-bəhar.
Nafe-nafe dağıdıb hər tərəfə
Zülfi-pürpiçi-xəmi mişki-tətar.
Sındırıb şəhdi-şəkər rövnəqini,
Açdı güftarə ləbi-şəkkarbar.
Məclisə tökdü ləbi-canbəxşi,
Lölöi-gövhərü dürri-şəhvar.
Dedi yüz naz ilə ol qönçədəhən,
Müjdə olsun sənə, ey Bixudi-zar
Ki, gəlib naməsi bir şəxsin kim,
Arzusuydu sənə rəsmi-şüar.
Yad edərdik onu hər sübhü məsa,
Zikr edərdik sözünü leylü nəhar.
Dedim, ey məh, hanı bəs ol namə,
Ta edim canımı mehrinə nişar.
Ta ki, e’zaz ilə ol mahliqa
Çıxarıb naməni qıldı izhar.
Alubən şövqilə sürtdüm gözümə,
Oxuyub zövqilə dil tapdı qərar.
Saqiya, dur mənə ver cami-şərab,
Mütriba, saz ilə, ahəng ilə tar.
Üz vurub bəs ki, mənə vəcdi-şürur,
Gəl qılam rəqs deyildir mənə ar.
Çərx vurub çərxə atam gər küləhi,
Qılmasın eyb mənə xürdü kübar.
Qılıb ol namədə yüz lütf əyan,
Eyləyib hali-dilim istifsar.
Artırıb rütbəmi bir payədə kim,
Qalıb idrakına aciz pəndar.
Eyləyib qətrəni bir bəhr hesab,
Həm qılıb zərrəni xurşid şümar.
Lütfdən sə’veyi-bibalü pəri,
Söyləyib namədə şahinşikar.
Bu kəraməti, könül, sanma əcəb,
Gəlməsin hiç sənə bu söz düşvar.
Bu həmin şəxsi-fələkrütbədi kim,

Nəcm bəxtidi ona xidmətkar.
Kimiyayi-nəzəri düşsə misə,
Edər əlbəttə zəri-kamiləyyar.
Ta ola qədri-zər aləmdə füzun,
Ta ki, iksirə tapanmaz asar.
Ola əhbablərin zərtək əziz,
Düşmənin, şairi-Dərbənd kimi xar.

**Mola Ağa Hacı Tağı oğlu Bixudun məktubuna Abdulla bəy Asinin cavabı**

Şükr kim, tərbiyəti-badi-bahar
Etdi səhni-çəməni rəşki-nigar.
Çaki-pirahən edib Yusifi-gül,
Gərm olub Misri-çəməndə bazar.
Türreyi-sünbülü məşşatə misal,
Eyləyib badi-səba qaliyə bar.
Lalə camına töküb mey, jalə,
Nuş edib nərgis, olub məstü xumar.
Dönüb atəşkədəyi-Zərdüştə,
Atəşin gül qədəmindən gülzar.
Başlayıb şur ilə mürğani-çəmən,
Naleyi-zirü bəmü musiqar.
Dili-üşşaqə salıb süzü güdaz,
Naleyi-dilkeşi-ümrivü həzar.
Mahü hur etmiş əyan arizi-gül,
Dağılıb gülşənə ondan ənvar.
Hər dəm onunla büzürgü küçik,
Eşq qanunun edərlər təkrar.
Belə novruzda dili-neyrizin
Edib abad o büti-gülrüxsar.
Verməyib guş müxalif sözünə,
Aşiqi-xəstədilə olmuş yar.
Ol büti-sadə ki, nuri-rüxinə
Eyləyib səcdə bütani-fərxar.
Zülfünü görsə şərifi-Məkkə,

Şeyx Sən’an kimi bağlar zünnar.
Zülməti-zülfi nişani-şəbi-qədr,
Şəmsi-rüxsari ziyabəxşi-nəhar.
Çeşmi səyyadi-qəzalani-Xütən,
Kaküli kasedi-mişki-tatar.
Vadiyi-vəhdətə rüxsari dəlil,
Aləmi-kəsrətə zülfi açar.
Dəhəni sirri-ədəmdən bir rəmz.
Varlıq əmrinə eylər izhar.
Əlqərəz, o büti-məhpeykər ilən
Bağda tutmuş idim izzü qərar.
Sayeyi-bidü kənari-cudə,
Gərm edib məşğəleyi-bus kənar.
Bir tərəf nəstərənü süsənü gül,
Bir tərəf cami-şərabi-sərşar.
Bir tərəf nəğmeyi-mürgi-xoşxan,
Bir tərəf çəngü neyü bərbətü tar.
Yar sərməsti-şərabi-gülgün,
Mən xərabi-nigəhi-çeşmi-xumar.
Dolayıb dəstimə zülfi-siyəhi,
Axtardım dilimi tarbətar.
Nagəhan bir-birə dəydi dəri-bağ,
Yetdi bir qasidi-fərxəndəşüar.
Çıxarıb izzət ilə bir namə
Dedi: Ey Asiyi-bisəbrü qərar,
Al ki, bu namə ilə yad qılıb,
Səni şəmsül-ürəfaül-əxyar.
Buraxıb həlqeyi-zülfi-siyəhi.
Əl uzatdım alım ondan tumar.
Bunu görgəc o məh oldu qəzəban,
Dedi: Ey şairi-bisəbrü qərar,
Bu həman zülfdü kim, hicrində
Ruzi-rövşən sənə olmuş idi tar.
Sənə ram etmiş idim bu zülfi
Ki, müqəyyəddir ona min dili-zar.
Şanəyə gah edər idin labeh.

Yetməsin könlünə ondan azar.
Yalvarıb gah səbayə derdin
Ki, bu dil məcmə'inə eylə güzar.
İndi noldu, onu əldən qoydun?
Çalsun öz sayı səni bu şəhmar!
Bu necə naməvü əş'ardı kim,
Şe'ri-zülfümdən ola xoşkirdar?
Dedim: Ey qibleyi-ərbabi-vəfa,
Eylə bu cür ətindən istiğfar.
Bunu bir şəxs yazıbdır ki, edər
Fəzlinə külli - xəlayiq iqrar.
Naməsi nasixi-nəzmi-qüdəma,
Xaməsi mə'dəni-dürri-şəhvar.
Deməyə vəsfini dil qasirdir.
Bəlkə yol bulmaz ona hiç pəndar.
Çarə oldur ki, vəfa şivəsini
Eyləyim sübhü məsada təkrar,
Ta ki, var baği-cəhanın əsəri,
Ta ki, gül vəslinə məhrəmdir xar.
Gül kimi dostu olsun xürrəm,
Düşməni, xar kimi bimiqdar.

**Abdulla bəy Asi günahları üçün tövbə etdiyinə görə Şirvan şairlərinin ona təşəkkür məktubu (tərcibənd)**

İlahi, məscidə meyxanə dönsün,
Tökülsün badəsi, peymanə dönsün.
Ola meyxanə bayquşlar yatağı,
Uçub bir mənzili-viranə dönsün.
Nə güldən ötrü bülbül nalə etsin,
Nə dövri-şəm'ə bir pərvanə dönsün.
Çəmən səhnində olsun dağ lalə,
Yanıb bir atəşi-suzanə dönsün.
Pozulsun rövnəqi-ordibeheşti,
Gülüstani-cəhan neyranə dönsün.

Səfayi-kainat olsun küdurət,
Bu aləm xəlq üçün zindanə dönsün.
Sənin minbə'd, ey piri-xərabat,
Şərabi-lə'li-famın qanə dönsün.

Neçün kim, Asiyi-zarü fitadə
Edibdir Şişə içrə tərki-badə.

Edib tə'sir ona zahid kəlamı,
Salıb gözdən şərabı, lə'li-famı.
Çəkib əl xublər zülfi-rüxündən,
İbadətlə keçirir sübhü şamı.
Dili-aşiqtək ol səngindil etmiş
Şikəstə sağərü minavü camı.
Təhi-xümdə Fəlatun kimi badə,
Qalıb zillətdə, yoxdur ehtiramı,
Pozuldu Kə'beyi-ərbabi-hacət,
Səfadən düşdü meykeşlər məqamı.
Şərabi-nab bağrı qanə döndü.
Olub meykeşlərin sağər həramı.
Ola xak ilə yeksan, bari-İlahi,
Nə kim meyxanə var, səğf eylə bamı.

Neçün kim Asiyi-zarü fitadə
Edibdir Şişə içrə tərki-badə.

Şikəst olsun xumi-səhbayi-xillər,
Tapa meyxanələrdə zib minbər.
Müğənni tərk olub meyxanələrdən,
Ucalsın naleyi-allahu əkbər.
Tökülsün xakə əşkimtək o mey kim,
Cəmali-yar üçün olmuşdu məzhər
Nə bəng olsun cahan içrə, nə badə,
Nə cam olsun, nə minavü nə sağər.
Məzacı bərhəm olsun səlsəbilin,
Dönə zəqqumə, ya Rəbb, abi-kövsər.

Əsasi - işrətimtək bərhəm olsun
Fələkdən əğdi-pərvin qütbi-məhvər.
Cəhan mülkündə olsun badə nayab,
Besani-kami-nayabi - Sekəndər.

Neçin kim, Asiyi-zarü fitadə
Edibdir Şişə içrə tərki-badə.

Xərab olsun fəzayi-gülsitanlar,
Xəzan cövrilə udsun qönçə qanlar.
Qurusun şaxü bərgi-taki-əngur,
Əli qoynunda qalsın bağbanlar.
Vüsali-düxtəri-zibayi-rəzdən
Ola məhrum, ya Rəbb, növcəvanlar.
Edib saqilərin zülfün pərişan,
Tuta mey matəmin piri-muğanlar.
Sürudi-şe’r ilə mey matəmindən
Cahan mülkündə qalsın dastanlar.
Ola meyxanələr viranə, yə’ni
Pozulsun rövnəqi-darül-əmanlar.
İlahi, görməsin minbə’d meydən
Səfavü zövqi-asayiş rəvanlar

Neçin kim, Asiyi-zarü fitadə
Edibdir Şişə içrə tərki-badə.

Əgər mey olsa kövsərdən ibarət,
Dəxi, Seyyid, yoxumdu hiç rəğbət.
Meyi-gülfamdan, əstəğfürullah,
Mənü səccadəvü künci-ibadət.
Şikəst et, Bixuda, cami-şərabı,
Dürüst et, Zöviya, əsbabi-taət.
Oyan, Qafil, götür əl cami-meydən,
Səni məst etməsin bu xabi-qəflət.
Gözün yum, Didə, ruyi-dilsitandan,
Şərabi-nabə, Rağib, etmə rəğbət.

Səfa, düşsün səfadən təbi-pakın,
Zühur etsin Zühuridən küdurət.
Pozun, ey dustan, divani-şe’ri,
Meyü məhbubdən etmən rəvayət.

Neçin kim, Asiyi-zarü fitadə
Edibdir Şişə içrə tərki-badə,

**A.Asinin tövbə etdikdən sonra Şirvan şairlərinin məktubuna cığatay və türk ləhcəsində yazdığı mənzumə**

Əla, ey saqiyi-məqbuli-sadə,
Yetür meyxarlərcə  cami-badə.
Peyapey sun şərabi-kəhrübayın,
Olubmin gahi yüz birlə fitadə.
Bəla tufanı tuş-tuşdan qopubdur,
Qalıb min zarü sərgərdan aradə.
Fəlatun minmasa xum kəştisiğə,
Onu ox qərq edərdi işbu adə.
Məni sirab etmək mümkün irmas,
Əgər dur eyləsən məndən ziyadə.
Mənə əhbab itar tə’nə neçün min,
İtaydır Şişə içrə tərki-badə.
Bu zəmmin dəf’inə bir cami-mey dut,
Ki, ta seyr eyləyüm kuyi-fənadə.
Salay bu dövrü çərxə bir əlalə,
Ki, bulsun Zöhrə xiynagər səmadə.
Məqami-liməəllah əzmin edib,
Bu fərdi eyləyün hər dəm iadə:
Meyi-vəhdət məsəllün ğəmzida yox,
Fəna mülkiğə böylə rəhnüma yox.

O meydən sun, koni işgac Məsiha,
Quyaş həmxanəligni etdi mə’va.
Olubdin aşina ərni onunla
Ölüklər durquzurdu eylab əhya.

Xəlil etkac onun bir cür’əsin nuş,
Ona gülşən bulub odlar sərapa.
Onun tə’siri Yusif sürətida
Olubdur hadiyi-qürbi-Zəlixa.
Rəvanbəxş eyləgac, saqi, kərəm qıl,
Til eylab rəbbikul-ə’layə quya,
Əlimğa cam uzat fəxric yəduk deb —
Ki, əlimdən toğa ənvari-beyza.
Urub bəhrəm təpaninü cəmalın.
Fəna deyin itam bir ləhzen ca.
Əlayiqnin cünudi quzğalaşmış,
Etür bu tilbə dil şəhrini yəğma.
Yerit bir tamcı mey kim, səhl bulsun,
Vücudim tamcısiya vəsl dərya.
Meyi-vəhdət məsəllün ğəmzida yox,
Fəna mülkiğə böylə rəhnüma yox.

Məni derlər ki, tövbəkar imiştüm,
Müğan piriğə bədkirdar imiştüm,
Mənə pir altida mənlik bulub məhv,
Məgər min xod aradə bar imiştüm.
Ki, tövbə eyləgay, ya eyləmaymim,
Bu işdə guyiya muxtar imiştüm.
Əzəl ustadidin alsam ni tə’lim,
Edib əzbər anı aytar imiştüm.
Nidər bu zərreyi-əhqərğə cür’ət —
Ki, mehr altida ziənvar imiştüm.
Məniyyətdən neçün mənlik uray kim,
Düşüb təhtüşşüaə xar imiştüm.
Bulub qafil həqiqət mənzilidən,
Dəriğa, maili-zünnar imiştüm.
Küniştü Kə’bə yeksandır əgərçi,
Çü min xod talibi-didar imiştüm.
Degil çün zöhdü üsyan biməşiyyət,
Neçün bilməm mən üsyankar imiştüm.

Meyi-vəhdət məsəllün ğəmzida yox,
Fəna mülkiğə böylə rəhnüma yox.

Müjənnin yadidin olmam kənarə,
Edibdür, saqiya, köksümi parə.
Çıxar hər sağbədən min nov'i - əfqan,
Bu dərdə istəsən gər bir də çarə.
Töküb ol cami-zərğə badeyi-nab,
Söylə ta mütrib olsun zəxmə tarə.
Nola gər olsa nabi-ney tililə,
Dəmi məşğul həmidi-giridgarə.
Məni qafil deyən rəğmiğə saqi,
Kim özin əhli-hal idər şümarə.
O odluq abdan bir cam tut kim,
Ura ol xərməni-canğə şərarə.

Meyi-vəhdət məsəllün ğəmzida yox,
Fəna mülkiğə böylə rəhnüma yox.

Dəxi tərk eyləgil, Asi, fəsanə,
Səlamın eylə Şirvanə rəvanə.
Səvadi-didədən yaz bir rəqəm kim,
Görərma Didəni bulsun bəhanə.
Zühuri birlə Bixud həzrətiğə
Yetür ixlasi-ərzin bixodanə.
Mən aşru rağibəm Rağib yüziğə,
Səfadən ğaib olmam ğaibanə.
Səba, etğil mənə sən hər bir imdad —
Ki, imdadın kəsib məndən zəmanə.
Əlin öp Seyyidin ondan son ərz et —
Ki, Həcc əzmilə tuşgandin cəhanə,
Künişti-Rumdə, ya kim hərəmdə,
Bulubmu mətləbindən bir nişanə?!
Və ya məndək o da məhrum qalmış.
Arayıb gərçi düşmüş xanə-xanə.

İrişdirmiş əgər mə’lum üçün elm,
Xoşa hali şərikdir cavidanə.

Meyi-vəhdət məsəllün ğəmzida yox,
Fəna mülkiğə böylə rəhnüma yox.

**S.Ə.Şirvaninin Abdulla bəy Asiyə məktubu**

Həzar naləsi hər güşədə həzar olacaq.
Həzar şükr, könül, mövsümi-bəhar olacaq,
Hənuz Hutdədir Yunisi-cəhanəfruz,
Həməldə zahir olan gündə özgə kar olacaq.
Səba xəbər verəcək mö’cüzati-İsadən,
Nəsim baisi-ehyayi-ruzigar olacaq.
Şükufə xəl’əti-əşcarı nüqrəduz edəcək.
Behişt əlaməti gülşəndə aşikar olacaq.
Dəhani-yar təkin qönçələr olub xəndan,
Səhab dideyi-aşiqtək əşkbar olacaq.
Şükufədən dönəcək bağ ruyi-cananə,
Bənəvşə bağdə manəndi-zülfi-yar olacaq.
Səba kəsad edəcək nırxi-müşkü şəncərfi
Zibəs ki, tərbiyəpərzadi-laləzar olacaq.
Kənari-səbzə olub pürəbirü ənbərdən,
Dəhani-lalə dolu dürri-şahvar olacaq.
Dili-zəmin edəcək gənci-şayegan zahir,
Çəməndə gövhəri-şəhvarlər nisar olacaq.
Bənəvşə türrəsinə cilvələr qılıb  hərdəm,
Dəmi-nəsimi-səhər türfə müşkbar olacaq,
Sədayi-kəbki-xüramanü naleyi-dürrac,
Səfayi-rövnəqi-səhravü kuhsar olacaq.
Gəvəznlər çıxacaq dəşt-ara güruh-güruh.
Külənglər düzülüb çərxə yüz qətar olacaq.
Həsari-günbədi-firuzə şurlər düşəcək,
Nəvayi-dilkəş ilə əndəlib zar olacaq.
Qürur ilə çıxacaq seyri-bağə gülrüxlər,
Gülün lətafəti bülbül gözündə xar olacaq.

Əyaği-laləni şəbnəmlə görçəyin məmlüv,
Əlində rindlərin cam xoşgüvar olacaq.
Nə yanə əzm edəsən, camü şahidü sağər,
Nə səmtə meyl edəsən, saqiyü əqar olacaq.
O qədər şişeyi-mey cəm' olur gülüstanə
Ki, Şişədən ürəfa dövrinə həsar olacaq.
Kimə bu mövsüm olur vəsli-yar ilə cənnət,
Kimə fəraq ilə gülşən bəsani-nar olacaq.
Düşən həvayi-rüxü zülfi-yarə gün görməz,
Nə yerdə olsa, qara günlərə düçar olacaq.
Xoşa ol aşiqi-xoşbəxtə kim, bu mövsümdə
Onunla seyri-gülüstanda yarı yar olacaq,
Yəqindir ki, mənə ol büti-şəkkərləbsiz
Şərabi-nab bu mövsümdə zəhrimar olacaq.
Rəqibə eylədiyi meyldən müşəxxəsdir —
Ki, ənqərib məni-xəstədən kənar olacaq.
Nə kim ki, barə edər rəf' möhnətü dərdim,
Nə qəmli xatimə Zöv'i qəmküsar olacaq.
Nə Rağib eyləyəcək hal sormağa rəğbət.
Nə Qafil əmri-əcibimdə huşyar olacaq.
Zühuridən nə edər halıma zühur kərəm,
Nə Didənin gözü bu qəmdə əşkbar olacaq.
Nə bir səfa verəcək xatiri-həzinə Səfa,
Minayi-eşqdə dil zarü-biqərar olacaq.
Vəli bu fikir ilə şadəm ki, dərdi-hicranə,
Hədisi-Asiyi-dilxəstə sazkar olacaq.
Nə Asi, ol ki, dəri-izzətində Seyyidi-zar
Qulamı olmaq ilə sahib - e'tibar olacaq.
Nə Asi, ol ki, xəyalı rəhi-məhəbbətdən
Könül səraçəsinə şahi-tacdar olacaq.
Səfa ilə gələcək nəzmü nəsri Şirvanə,
Görüb o nəzmləri Zöv'i şərmsar olacaq.

## Asinin ölüm xəbərini Şamaxı şairlərinə çatdırmaq üçün qarabağlı şairlərin yazdıqları mənzumə

Xəzan olsun görüm fəsli-bəharı,
Dəmadəm tirə bulsun ruzigarı!
İlahi, yetməsin bülbül muradə,
Çəkə gülşəndə daim rənci-xarı.
Dəxi baş çəkməyib düşsün həvadən,
Cahan bağında sərvi-cuybarı.
Təravət tapmasın gül, qönçə qalsın,
Ola sünbüllərin aşüftə, tarı!
Solub düşsün görüm mərdüm gözündən
Dəmadəm nərgisi-məsti-xumarı!
Axar sular görüm al qanə dönsün,
Qurusun nəhr içində abi-cari.
Təəyüş məhv ola səhni-çəməndə,
Tuta xaşak tərfi-kəştizarı.
Bahar olcaq əzəl çəksin xəcalət,
Bənəfşə, qasidi-fəsli-bəharı.

Neçün kim, Asiyi-zarü fitadə
Əcəl peymanəsindən içdi badə.

Ola eşq əhlinin eşqi məcazi,
Həqiqət birlə yoxdur imtiyazi
Neçün ağaz qılsın dildən aşiq,
Nəvadi-dilkəşü suzü güdazi.
Olub sakit, deməz Məcnun üçün el
Dəxi əfsaneyi-tulü dirazi.
Bəli, Mahmud şahın var həqqi,
Fəramuş eyləsə mehri-Əyazi.
Sanır Fərhadi-məhzun təlx kamın,
Edə Şirin ona gər şivə, nazi.
Züleyxa vəslini tərk etdi, bulmuş
Məhi-Kən’anə töhmət eşqbazi.

Dəxi bundan sora əhli-məhəbbət
Edərmi şövq ilə razü niyazi?!

Neçün kim, Asiyi-zarü fitadə
Əcəl peymanəsindən içdi badə.

Şəhid olsun şəhidi-kuyi-canan,
Tapa bəlkə təriqi-kamrani.
Bu şəhər içrə həsari-ümdə salar
Bülənd etsin gərək suzi-nihani.
Qaranan ruzigarı tirə bulsun,
Pərişankönlü olsun zülfü sanı.
Qılıb Məxfi fəğanın aşikara,
Yanıb bu qüssədən cism ilə canı.
Qaradığı bu dağ içrə yanıbdır,
Ola bərhəm bu dövrü-asimanı.
Fəna seyr eyləsin rahi-fənanı,
Odur vaqe'də ömri-cavidanı.
Qutarmaz Yusifi çahi-bəladan
Görə gər vəsləti-Yusifliqanı.
Olub bu qüssədən Agəh xəbərdar,
Dəmadəm künci-qəmdir aşiyanı.
İlahi, Novrəsi-məğmumü məhzun
Görərmi bir də ruyi-şadimani?

Neçün kim, Asiyi-zarü fitadə
Əcəl peymanəsindən içdi badə.

**Abdulla bəy Asi və Xudadad bəyin vəfatı münasibəti ilə Şirvan şairlərinin yazdıqları məzmuə**

Bu necə zülm idi, ey çərx ki, bünyad etdin,
Niyə zülm etmək üçün təb'üvi mö'tad etdin?
Bir utan, ey fələki-süflə, bu dövranından,
Gör kimi zarü həzin, kimləri dilşad etdin!
Atəşi-hadisədən çox gözü qıldın pürab,

Min Süleymanı salıb torpağa bərbad etdin.
Gah atıb tiri-bəla oxladın Abdullahı,
Gah çəkib tiği-cəfa qəsdi-Xudadad etdin.
Ta ki, Mərrixə inayət eylədin tiği-sitəm,
Bilmədin ki, onu bikəslərə cəllad etdin.
Zülmkar ismi ilə aləmə oldun məhşur,
Yeri, ey çərx, adın batsın, əcəb ad etdin!
Qüssədən günlərimi şamə bərabər qıldın,
Giryədən gözlərimi Dəcleyi-Bəğdad etdin.
Oldu Şirvan mənə Yə'qub kimi Beytül-hüzən,
Ta ki, gürgi-əcəli Yusifə səyyad etdin.
Bilmədim, heyf ki, ey çərx, nə əfsun oxudun,
Qəl'eyi-Şişədə təsxiri-pərizad etdin.
Hanı Yusif? O əzizi ki, sən əvvəldə onun
Türbətilə şüəra silkinə ustad etdin.
Niyə qıldın onu, ey çərx, sən axırda zəbun,
Bu nə ayinü rəvişdir ki, sən icad etdin?

Ah, bu hiyləgərin dad əlindən, səd dad!
İstəməz dəhrdə ərbabi-vəfanı dilşad.

Cövrgüstər fələka! Bu nə cəfadır, nə sitəm?!
Eylədin qamətimi bari-müsibətdən xəm.
Bəs deyilmiydi bizə daği-əzayi-Fələk?
Bəs deyilmiydi bizə matəmi-Həssani-əcəm?
Bəs deyilmiydi bizə daği-Xudadad, ey çərx?
Eylədin sən yenə amadə bir özgə matəm.
Nə verirsən bu qədər aləmə dərd üstən dərd?
Nə tökürsən bu qədər könlümə qəm üstən qəm?
Qayəti-hüzn ilə əzbəs ki, yanıbdır cigərim,
Saçılır aləmə odlar nəfəsimdən hər dəm.
Necəsən indi ki, bir ahı-şərarbar çəkim,
Yandırıb eyləyim, ey çərx, əsasın bərhəm?!
Zatın olmuş məgər ənduhü bəladən təxmir,
Dəmbədəm aləmə səndən yetişir dərdü ələm?!
Hansı kəsdir ki, ola dəhrdə səndən dilşad,

Hansı dildir ki, ola dövrdə səndən xürrəm?!
Neyləyibdir sənə, ey qatil, ənvaiş-bəşər!
Neyləyibdir sənə, ey zalim, nəsli-Adəm?
Hər şürurundadı yüz dərdü müsibət müzmər,
Hər nişatındadı min qüssəvü möhnət müdğəm.
Ağlasam ol şəhi-iqlimi-vəfadən ötrü,
Ahü fəryadıma eyb eyləməyin, ey həmdəm!
Necə ah eyləməyim, ah ki, şahım getdi!
Qoydu tənha məni ol püştü pənahım getdi!

Yenə ərbabi-vəfa aləm ara xar oldu,
Əhli-dil ney kimi fəryadə gəlib zar oldu.
Ey könül, bu güli-gülzari-vəfadən ötrü,
Əşki-gülgun ilə gözlər yenə gülnar oldu.
Dağlərdir çəkilən sinələrə lalə kimi,
Ey cünun, seyr eylə kim, mövsimi-gülzar oldu.
Ta ki, qərq oldu bəla bəhrinə ol dürri-yətim,
Sədəfi-didələrim bir düri-şəhvar oldu.
Mə'rifət gövhəri olmuşdu cəhan içrə kəsad,
Ona sərrafı-əcəl gəldi, xiridar oldu.
Saldı qəm daireyi-möhnətə üftadələri,
Könül ol dairədə nöqteyi-pərgar oldu.
Qafili etdilər agah çü bu möhnətdən,
Möhnəti-hadiseyi-dəhrə giriftar oldu.
Getdi mi'rati-dili-safi-Səfadən rövnəq,
Ta ki, bu möhnəti-üzmayə xəbərdar oldu.
Rağibin rəğbəti bilmərrə gedib dünyadən,
Şad olub mərginə öz ömrunə bizar oldu.
Bixudun əxtəri-iqbalına üz verdi vəbal,
Sabitin kövkəbi-əşki üzə səyyar oldu.
Seyyidi-bəxti-qəranın günü oldu qara,
Zöv'inin çeşminə məcmui-cəhan tar oldu.

Saldı torpağə fələk zülm ilə mehrü mahı,
Ya həlak etdi  Xudadad ilə Abdullahı.

## ASİNİN FARSCA ŞEİRLƏRİNİN TƏRCÜMƏSİ

## QƏZƏLLƏR

Nə üçün saqinin adı minbərlərdə pislənir?
Mey  zikri nə üçün abidlərdə atəş kimidir?

Nə mey kövsərdir ki, şeyxi onun adını çəksin,
Nə saqi huridir ki, abid onu çağırsın.

Ay səfeh, mey odur ki, Quranın əsas mənasında
Xudaya onu çox faydalı hesab etmişdir.

Məscid meyxanədə qalmaz ki, oradadır
Mey, saqi, mütrüb, noğl və şahid.

Bəsdir, ey Asi, oyan, məsciddən çıx
Ki, onlar saysız-hesabsızdırlar, sən isə məst və vahidsən.

* * * * *

Xürrəm (nazlı) rəftarına fəda olum,
Uca Tanrı səni qorusun.

Ürəyim ağlın əfsununu qəbul etmir,
Bimar ilanın (saçların) kimi cansızdır.

Vüsal məclisinə yar olmasam da,
Başımı divarının altına qoyaram.

Vüsal arzusuna cürətim yoxdur
Ki, mənim söhbətimdən ar etməyəsən

Sənin məqsədin məni qətlə yetirmək olsa,
Sənin qaniçən qılıncını nəvaziş edərəm.

Mən sənin üçün özümü öldürərəm
Ki, bir kəs sənə cəfakar deməsin.

Hicrindən canım boğazıma yığışdı, gəl,
Bəlkə sənin didarından feyziyab ola.

Səbr mayası hicrə sərf olundu,
Daha sənə nə ilə xəridar olum.

Haçana kimi imanımı aparıb üzüm yeyəcək,
Ürəyimi zünnarının bir tükünə də bağlamaz.

Dodaqlarından Asiyə bir az şərbət ver,
[O], bimar gözlərinin xəstəsi olmuşdur.
*****************
Əgər əzançı o qəddü qamətin nazını görsə,
Qiyamətə qədər o qəddü qamətin söhbətin edər.

Onun gözəlliyinə başqa zinət və zivəri artırmaz
Ki, özü bu hüsn ilə onun xatirində qalsın.

İki zülfünü şübhədən elə uzaq saxla ki, ürəyimə
Vida söyləyib deyəm: ey ürək, salamat get.

Məgər dostun məhləsinin vəsfini etmişdi ki, Adəm
Əlində səkkiz beheşt ola-ola orada oturmadı.

Mənim qulağıma əql padşahının əmri söyləyir:
Eşqin oturduğu yer ürək mülkündə xilafət təxtidir.

Eşq yoluna təvəkkül ayağını basmamalıdır
O kəslər ki, məlamət dilindən çəkinirlər.

Ey Asi, bütün olanlarını eşqə versən,
Haqqın haqqına çəkməzsən sonda xəcalətdən.

******************

Şəhərin darğası əgər şüşə və sağəri sındırsa,
Monastırın qoca sahibi əcəb olmaz ki, onun əvəzinə baş sındıra.

Şəhərin zahidi qırmızı meyi haram hesab etsə,
Peyğəmbərin dindar bəndələrinin şəriət rövnəqini sındırar.

O aya  səcdə edərəm ki, [onun] iki əyri qaşı,
Mehrabın tağını çökdürüb, minbəri sındırar.

Ey türk, sənin sıralanmış kipriklərin ürəkdeşən oxlarda
Nəinki bu ürəyi aparar, bəlkə qoşunun sırasını pozar (sındırar).

Əgər səba sənin qara zülfünü pərişan etsə,
Xütən müşkünün qiyməti ənbər tabağını sındırar.

Sənin eşqini ürəyimin qapılarını elə sındırıb fəth edər
Necə ki, Əli Hicaz səfində Xeybərin qapısını sındırar.

Ey Asi, onun əyri zülfünə biçarə ürəyini bağlama,
Nəvaziş etsə də, axırda qəzəblə sındırar.

* * * * *

Açıq-aydın deyirəm ki, mənim allahım bu tərsadır [gözəldir]
Ki, İsalıq qüdrəti onun iki şirin dodaqlarındadır.

Əgər cənnət bağının gözətçisi sənin hüsnünü görsə, əcalətdən
Behiştdə olanların hamısını —huri gözlüləri oradan qovar.

Ey canan, sənin saf bədənin başdan ayağa ruhdur.
Deyə bilməzsən ki, bu cisim maəntəhindəndir[1].

O ay üzündən uzaqda [olduğum üçün] səhərə qədər gecə, hər gecə
Kipriklərimdən süzülən göz yaşından ətəyim pərvinlə[2] doludur.

---

[1] Maəntəhur —möminlərin behiştdə içəcəyi pak şərab. Son dərəcə təmiz su.
[2] Pərvin —Ülkər ulduzu (burada məcazi mənada göz yaşı)

Ey ürək, onun əyri zülfünə üzünü çevirmə
O nə çindir, nə də maçin, çinin ortasındadır.

Sənin vəsfini edən kəs ağılsızdır
Əgər bir kəs sərvi eşitmişsə [bilər ki,] rəftarda budur.

Ürəyimi və dinimi onun iki zülfünün əlinə verdim.
Qoy deməsinlər ki, Asi cahanda dinsizdir.

************

İstəyirsən ayın üzünü bulud altında gizlədəsən,
Üzündən o iki qara zülfü bir yana çək.

Sənin xəttini üzündə görən hər bir kəs deyər ki,
Hind şahı Ruma qoşun çəkibdir.

Sənin qıvrım zülfünün yadı ilə ayrılıq gecəsi,
Könlümün ahının tüstüsünü aya çatdıraram.

Şahənşahın eşqinin vəsfində bunu demək
Kifayətdir ki, o, padşahı bəndlərə qul edər.

Ey piri-muğanın lütfü feyzi, bizi düz yola gətir,
Meyxanədən Kəbəyə gedən yolu itirmişəm.

Ey zahid, xudavənd o cəhənnəmi ki, yaradıb,
Biz bilirik ki, o, xanəgahdan ibarətdir…

Asi nə üçün sabahın qəmin çəksin ki,
Qiyamət günü şəfəqqət saqisi günahı bağışlar.

* * * * *

Əfsanədən öncə məclisin saqisidir bizə,
Lə'l yad etmək üçün camı sən verdin bizim əlimizə.

Qafil öz meydanını [yerini] Kəbə və monastırda axtarır,
Daşda dostluq axtarır bizim bütpərəst ürəyimiz.

Bu badələrdən [bezmişəm] kədərliyəm, dosta məxsus məclisdə
Ürək özündə olmamağı tələb edir, biz məst deyilik.

Bədən qəlibini onun eşqiylə sındırmasam,
Dostun əliylə bizim sınığımız sarınmaz.

Bu məqamdan müqəddəs yuvanın zirvəsinə qədər
Bizim qol-qanadı bağlı humayımız necə uça bilər?!

Vəslinə yol olmadığı fikrinə biz əmin olsaq da,
Dostsuz bir dəm özümüzdə ola bilmirik.

Asi zərrə kimi dostun üzünün mehrindən yox oldu.
Kim ki yoxdur, onun bizim varlığımıza, yoxluğumuza yolu
yoxdur.

* * * * *

Badə içənlərin gül rəngli mey sağəri dadlı olsun,
Əgər bir gün uzaqlaşdırılmış yarı yada salsalar.

Dərd kimi küpün yanında illərlə məskən salmasa,
Piri-muğan tövbəkarların günahlarını necə bağışlayar?

Ey ayüzlüm, sənin qəmindən nəğmə, avaz yaratmıram,
Qəmküsarların qəlbində dostun qəmindən nə qəm ola bilər?

Mənim ürəyim bülbül kimi min nalə avazlıdır
Gülüzlülərin xəttindən tikan kimi xar və həqirdir.

Gəl, Asi, onun eşqində göz yaşlarını axıt
Ki, bu, gecə səhərə kimi ulduz sayanların adətidir.

* * * * *

Ürəyimin səhrası rəna qəzalların[1] otlağıdır,
Qan kimi qaraxallıların göbəyində müşk olmaq xəyalına
düşüb.

---

[1] Qəzal —bala ceyran (buynuzu hələ çıxmamış)

Səba hər dəm o pərişan zülfləri hərəkətə gətirir,
Halı qarışıq olanların hamısını bir-birinə vurur.

Şirin danışığının hədisi elə ki, araya gəldi,
Şirin danışanların şirinliyindən dodaqlar bir-birinə
yapışdı.

Dünya dəqiqləri [saçlarının] arasında bir əlaməti çox
axtardılar,
Zərif xəyallıların əlinə baş tükündən başqa bir şey
gəlmədi.

Bağda sərvin qəddi qibtədən quruyub qaldı
Ki, onun qarşısında başını dik tutması ədalətsizlik
olardı.

Naləli sinəmin ahından onun qəddi hər tərəfə
meyil edər
Çünki soyuq külək novbaharları yerindən oynadar.

Ey şəhərin şeyxi, monastır qocalarının canına
and olsun,
Kiçikyaşlıların eşqi, sənin əfsunun Asinin qəlbindən
çıxmır.

* * * * *

Bu bəsdir ki, torpaqdanam, dünyada mən və qəm
Dünya ananın doğuşunda bir qarında olmuşuq.

Fəna mülkünə Xızırın eşqi yoldur,
Xoş o kəslərə ki, belə bir yola qədəm basa.

Dünya mülkü malının hamısı öyünmək üçündür.
Bundan fənanı sevənlərin nəsibi nə az, nə çox.

Ey ürək, vəslə qanad açma, hicrandan nalə etmə,
Dostdan hər nə gəlsə, ona sevin.

Sənin o camalın yoxdur ki, sənin hüsnünün vəsfini
Qələmin dili olduğu kimi şərh etsin.

Sənin qaşlarına «qaf» surəsi xitaba gəldi,
Ayə şübhəli, yaxud möhkəm [təsdiq olunmuş]
olsa da.

Asini öldürmək üçün niyə qılınc çəkirsən?
Şəriətə görə müqəddəs yerin ovunu qətlə
yetirməzlər.

* * * * *

Ey dost, sənin zülfünlə ürəyimin nə işi var?
Kifayətdir ki, cəza günü cəfadan nicat verən var.

Pərdəni götür, üzünü göstər, dünyanın xalqlarını
Divanə etmə, desinlər ki, pəridir.

Dünən qarageymiş daraq zülf səfərindən qayıtdı,
Bizim itmiş ürəyimizdən onun xəbəri var.

Bu ürək yandıran hüsnün ki var, demək olmaz ki,
Qüdrətin hövsələsində yeni bir bəşər var.

Demirəm ki, gözünün lütf baxışı yoxdur.
Vardır, ancaq mənə yox, başqasına tərəf var.

Ey yolunu itirmiş zahid, meykədə qapısının
torpağından başqa
Ümid yeri olan bir qapı varsa, göstər.

Asi, hicran gecəsi səhərin intizarını çəkmə,
Tutalım səhər var, ancaq sənin ahın ona əsər
edərmi?

* * * * *

Əgər behişt tuba ağacını nazla yetirsə,
Onun acığına rəna qəddini nazlandır.

Asimanın ayı sənin gözəlliyinə bənzəməz (çatmaz),
Qızıl suyuna çəkilmiş misin saf gümüşə nə nisbəti
ola bilər?

Sənin nur üzünün qarşısında şüa altında qalar
Əgər xudaya Sina şüasını yandırsa.

Sənin üzünün xəyalını sinədə məhbus etmişəm,
Eşq yolunda Züleyxanın ardınca gedirəm.

Dünya və dini sənin xalına qurban edərəm,
Xacə[1] kimi təkcə Səmərqənd və Buxaranı yox.

Vüsal qapısını üzümə açmaq ümidi ilə
Sənin kuyində «Fətəhna» ayəsini oxuyuram.

Ürəksiz Asi sənin qara gözlərinin yadı ilə
Özünə səhra ahusunu munis etmişdir.

* * * * *

Sənin üzün günəş, qıvrım saçların qara buluddur.
Bu qara buludların haçana qədər günəşin hicabı
olacaq?

Yox, xəta etdim, sənin üzündə zülf bulud ola bilməz
Bəlkə qənbər[2] suda sənin üzünün qarşısında
dayanmışdır

Ya da atəşpərəst hinduçənin alın tərindən
Özünü yandırmamaq üçün atəşə su vurur.

---

[1] Xacə —Burada Hafiz nəzərdə tutulur.
[2] Qənbər —qara çaylaq daşı

Əgər dünyanın ən dəqiq tədqiqatçıları sənin zülfünü şərh etmək istəsələr,
Onların hamısı onun saçlarının qıvrımlarına düşüb qalarlar.

Mənim zarıncı ürəyimdə sənin üzünün və saçlarının xəyalı
Guya xarabalıqda olan xəzinə üzərində yatmış şahmardır.

Dünyada ayrılıq oduna adət etmiş hər bir kəsə
Cəhənnəm odu ilə əzab versələr də üşüyər.

Ey Asi, əgər sən dostun üzünün günəşinin bir zərrəsisənsə,
Bəs nə üçün həmişə sənin gözlərindən üzünü örtür.

* * * * *

Saqi, o Rey məclisini bəzəyən reyhan arağudan bir böyük piyalə ver.
Mütrib, canım boğazıma yığışdı, nay nə neyi çal.

Əvvəllər əyri zülfünün sövdasını asan göstərdi, lakin
Ürək onun yoluna qədəm basanda əvvəlki get-gəl yoxa çıxdı.

Ey peymanını kəsən dilbər, nigarların həsəd çəkdiyi
Zülfünə ürək verən hər bir kəs cövr əlindən vay-vaydadır.

Ayüzlülərlə xoş məzəli şərab içmək xoş olar,
Xüsusilə o zaman ki, gül şaxından deyin[1] düşmənləri qaçar.

Dostun mey kimiləlinin hicrindən nə zamana kimi ürək qanı içəcəyəm?
Buna baxmayaraq düşmənə saqi və ay simalı mey vermişdir.

Mey içənlərin hücumundan meykədədə yer dar olsa da,
Asinin nəzərində (yanında) bu Keyin[1] ölkəsindən də genişdir.

---

[1] Dey —İran təqvimində onuncu ay.

* * * * *

Ey saqi, sənin iki yarımməst gözlərin məni badəpərəst edibdir
Daha bir an ayıqlıq istəmirəm, qalan meyi də ver

Çəngsiz, dəfsiz, neysiz və saf badəsiz ləzzətsiz olar
Gəl ney çal, ney oynat, ey mütrüb və sağі.

Çəmənin gül seyrində ey gül, qana bulaşıb öldün.
Əgər səba müştaqların halının hədisini soruşsa nə olacaq?

Mənə barı bir kömək e tki, üzünün quranında
Vüsal məktəbində aşiqlik dərsini oxuyum.

Əyilmiş mehrab, tağının qarşısında səcdə üçün
Ey bitişik tağlı, (çatma qaşlı) sənin bir cütünə.

Ey pəri, barı sənin divanən olan Asiyə kömək et
Dildarlıq əhdi bağladığın üçün süstlük eləmək olmaz.

* * * * *

Saqi, səlsəbilin[2] qibtə etdiyi meyi gətir
Ki, onun özü əlil qocaları da cavan edər.

Qorxuram ki, şəhər şeyxlərinin müridləri həşr günü,
«Ləm əttəxiz-fülanən xəlil»[3] i söyləsinlər.

Məstliyin təsirindən muğların yolunu itirmişəm.
Xızr hümmətinə de ki, səbili[4] göstərsin,

---

[1] Key —Keykavuş nəzərdə tutulur.
[2] Səlsəbil– Cənnətdə çox ləzzətli suyu olan çeşmənin adıdır.
[3] ...özümə filankəsi dost etməyəydim (Fürqan, 28)
[4] Səbil– yol üzərində cavab üçün su saxlanılan bina, ehsan olaraq paylanılan su.

Mənim gözlərim qarşısından getmə, ey əziz Yusif,
Və gözlərimdən Nil çayını axıtma.

Musa Tura eşq göstərdi, ildırım nurutək
Əgər yarım gözəl cəmalını göstərsə,

Xızır kimisinin yüzü sənin saçlarının zülmətində itər,
Bu kədərli ürək bəs dəlili harada axtarıb tapar

Asi, qanının bəhası budur ki, o nigar
Gözünün ucu ilə bu öldürülmüşə nəzər salsın.

* * * * *

Ey günəşüzlü saqi, şərabsatan.
Fəna ərbabının qibləsi —şərabsatan.

Dünənki meydən başım ağrıyır,
Dur, allah xatirinə gəl, ey şərabsatan.

Sən qəlbə həkk olmusan, qədd ruh mədənidir
Fəəhyahu mutəşarəl-xumar.[1]

Cam və səbu məni doyurmaz,
Küpün üstündəki kərpici aç, meysatan.

Bahar fəslidir, bu vaxtlar,
Badə dəvadır, gəl, ey meysatan.

Badə ver ki, sirlərdə qeyb
Olum, yol göstər, meysatan.

Asinin üzünə fəna yoluna
Qapı aç, qapı aç, meysatan.

* * * * *

[1] Bir az şərabla ona can ver.

Ey ürək, əgər o qıvrım saçlarda dolaşsan,
O həlqələrdə əbəbi olaraq saçların həbsinə
düşəcəksən.

Bir eşqi və gözü ilə xalqın ürəyini özünə çəkdi
(oğurladı)
Əfsunla dolu şəbədəbaz caduları ilə.

Ağılı mühakimə yeri hesab etmir.
Çünki qanlı eşqi ürəkdə taxta oturub.

Qaşlarının ortadan iki hissəyə bölünməsi
Məhəmmədin Ayı barmağı ilə şaqqalamasına
bənzəyir.

Arxaya baxırsan, məndən çıxmaz
Qasid, qəsd, mə’bud və məqsud xəbəri

Hər kəsi yerindən çıxarmaq məqamı gəldi:
Bizi meyxanədən, abidi məbəddən.

Qara xəttü xal, müjgan və kakil
Hamısı nizamla Asinin ziddinə çevrilmişdir.

* * * * *

Bütün aləm inkardır və sən isbatsan,
Sifətini görə bilmirəm ki, zatın özüsən.

Üzün gah ayda təcəlla edər, gah güldə,
Gah da yerdə zahir olursan, gah səmalarda.

Biz hamımız sənin günəşinin bir zərrəsiyik,
bəs nə səbəbə
Zərrələrinin görünüşündən qeyb olursan?

Hicabda nə üçün üzünün nuru gözlərimdədir?
Sənin özün görənsən, əkssən və güzgüsən.

Hicabın özü özünsən, Asi, qalx, əgər
Məqsədə çatmaq və səadətə qovuşmaq istəyirsənsə.

* * * * *

Dünən meykədənin qapısından keçirdim.
Gördüm ki, badəsatan bir gözəl dayanıb.

Küpə onun mey rəngli dodaqlarının əksi düşdüyü üçün
Saf mey vəcddən cuşə gəldi.

Ona səcdə edib, əbədlə dayandım.
Əlimi sinəmə qoydum, qulağımı fərmana.

Bir sağər əlində mey qarşıma gəldi,
Badədən üzü gül rəngində olmuşdur.

Dedi doldurmağa nə ehtiyac var
Sinəni bu qədər yırtıb şivən etmə.

Reyhan meyinin bir camı
Dəstarı[1] başımdan, ağlımı isə huşumdan aldı.

Artıq meyin görünüşü məni heyran etmirdi.
Ürəyimin qanı qüssədən cuşə gəldi.

Elə ki, bu sözü eşitdi, qəzəbi tutdu
Dedi, ey aşiqi-divanə, sus.

Mən bilirəm ki, düzgündür.
Ey dərdli, bir neçə sağər iç.

---

[1] Dəstar —Əmmamə, dəsmal, çalma

İçəri gəl, buyur, əyləş
Məni can kimi ağuşuna al.

Noğul əvəzinə ləl dodağımı öp,
İstiəyirsən qədəh süzüb, badə iç.

Pulunun azlığına görə xəcalət çəkir,
Asidən ayrı şərab alıb içmə
* * * * *
Hər kəs ki, canı sənin küfr zülfünə bağladı,
Sənin iki zülfünün qəmi imanımı qoymadı.

Ey şah, sənin gözlərinin müqabilində nərgis məğlub olar.
Necə ki, cadugər Qeys İmranın qarşısında oldu.

Sənin üzünü gördüm, bildim ki, Xəlil nə üçün
Ali-İmranə məhi-taban dedi.

Türk və Xita qoşununu məğlub edər pənah arxalı
Əgər kiprik qoşununu düzsən.

Üzünün eşqinin xəzinəsi, ey hüsn xəzinəsinin sahibi,
Əvvəldən viran olmuş ürəyin bir küncünü özünə vətən
etmişdi.

Sən allah, heç kəsi Allahın yolundan əyri yola çəkmə,
Hicranınla o cəhənnəmi xalqa göstərmə.

Hərgiz ey şux, sənin mey kimi üzünün yadıyla,
Hər kim ki, sənin dərdinlə yatar.

Ürəyimi gözümün bəbəyi edib namə yazaram
Ki, hiylə ilə iki gözümün didəsi canana baxsın.

Hünərli Asiyə eşq üçün novcəvan ürəyi ver,
Bəzən gözəllərin gözü şirləri də ovlayır.
* * * * *
Ayrılıqdan o qəddü qamət ürəkdə qalar.
Yüz əlif dağı qiyam və qiyamətə qədər.

Zərrə əzəmətli yanan nura misaldır.
Sənin qarşında, ey lətafət günəşi.

Ey gözəllər şahı, bütün dadlıların müqabilində,
Məlahət şahları ən yüksəkdə dayanan dadlı-duzlulardır.

Mey eşq xəstəsinə və qəmi-eşqə ləzzət verir.
Onların ayrılığa, salamatlığa təmənnaları yoxdur.

Eşq yolçusundan başqa hər yolun yolçusunun
Qəflətdə olan mürşid kimi aqibəti peşimançılıqdır.

Dürrə, tağa və qapıya ehtiyacım yoxdur,
Əgər hekayət sərvdirsə və yer imarət.

Sənin hüsnün də zar edən Asinin eşqinin çəkisidir.
Bunların hər ikisindən başqa ziyarət dərəcəsi yoxdur.
* * * * *
Ey qara xətli, qara xallı və qara saçlı,
Sənin zülfündən mənim günüm və üzüm qara oldu.

Sənin dodaqlarının küncündə xal oturub, sanki
Həyat suyunun [bulağının] gözündə qara hindu balası oturub.

Yüz qara əlif dağı var sinədə,
Sənin nəvazişli qəddü qamətinin hicrinin qara qəmindən.

Məst aşiq hara, mehraba səcdə hara.
Mənim üçün qiblə olan qara qaşın küncü bəs edər.

Lətafətdə bir nöqsanı yoxdur, nə edim ah, əgər
Qarabuğdayı gözəl üzü kimi qara xasiyyəti də yaxşı olaydı.

Mənim biçarə ürəyim qara geyinib pərişan oldu
Ki, bu rənglə qara saçlara məhrəm ola bilsin.

Məqsəd Yusif və Yaqubun köynək məsəlidir
Asi əgər səba yelindən qara saçlarının qoxusunu alsa.

* * * * *

Ey can, müjdə ver onunçün ki, qapıdan gəldi
O mahpeykərdən qasid yox, yarım.

Məktub nə gətirdi? O xətti ki, canan
Orada mənim adımı, bəli, təkrar-təkrar yazıb.

Daha nədən? Tər gözlərin halətindən (yazıb)
Özgə hicr gecəsinin cəzasından onlar nəyi soruşdular?

Ürəkdən heç bir şey yazıbmı? Yazıb, bəli.
Necədir, əsirdir, zar və zəlildir?

Ayağında nə var? —Zəncir, qandal halqası.
Harada sakin olub? –Ənbər qoxulu zülfdə

Halı necədir? —Pərişan və qarışıqdır.
O atəşpərəst və kafərin cəfasından

Paltarı nə rəngdədir, nə geyinib?
Nə üçün Allahu əkbər xirqəsinin əzasındadır?

O həlqədə təkdir, yoxsa dostu da var?
Azdılar, yoxsa mindən çoxdurlar?

Yenə yazır ki, nəyi salamat çatdırdı?
Dilbərin məclisində vaxtında hazır olan kimdir?

Mənim ayım məclis qurub mənsiz, ah,
Onun məclisindəki saqi və sağər nədir?

Daha nə mey və noğul, daha nə mütrüb?
Ki sitəmgər rəqib orada hazır olub.

Rəqib nə üçün mənimlə salamlaşıb?
(Onun üçün) ki, qibtədən kül altındakı qoru şiddətləndirsin.

Asi, daha əlini yardan çək!
Nə üçün? Ona görə ki, qeyrisi onu yanına çəkib.

* * * * *

Çəmən yenə də xoruzgülü cücərtilərinə qərq oldu
Əzranın üzü, Vamiqin göz yaşı kimi.

Qırmızı rəngli gülə mədh oxumaq üçün
Xoş sədalı bülbül natiqliyini yüz dəfə artırmışdı.

Gül öz yarpağından hikmət dəftəri açmışdı,
Dünyanın sirlərindən dəqiq kəşflər edirdi.

Ey gülüzlü saqi, eyşi-nuş məqamdır,
Qalx, müvafiq mey içənlərə mey ver.

Bir az badə ilə məni özümdən al ki, ürək rahatlansın.
Qara sevdadan (malxulya) qayğı və əlaqələrdən

Mən o qədər təcrübəli deyiləm ki,
Mənafe güdən zahidlərin dediklərinin ardınca gedəm.

O yol deyil ki, siratpərəstlikdən
Bəlkə köhnə həqiqətə çata bilsin.

Badə gətir ki, axirət dünyasının fikri
Azadə aşiqə layiq deyil.

Miskin Asiyə şəfəq rəngli badə camını ver
Ki, onun vücudu haqqa dəlicəsinə vurulsun.

* * * * *

Kimin ki boynunda sənin zülfün zünnar deyil,
[O kəs] küfr həlqəsindədir, [o] arif və dindar ola bilməz.

Yaysan sənin qara zülfün üzdə ənbəri sındırar,
O elə ətirdir ki, əttar dükanında olmaz.

İki gözün mənim ürəyimi əlindən necə salamat buraxar?
Ovun canı iki ovçudan [kamandardan] salamat qurtarmaz.

O qara gözlüdən ürəyimin dərdini soruşdum, dedi.
Ki, xəstənin qəminin əlacı xəstədə olmur.

Hicran çəkməyən kəs vəslin qiymətini bilməz,
Tutulmayan [qəfəsə salınmayan] quş gülün qədrini bilməz.

Bu biçarə ürək dostdan uzaq düşəndən bəri
Heç vaxt gül və gülzar seyrindən şad olmayıb.

Saqi, qalx, bizim atəşin meyimizə su çilə,
Onun dodaqlarının hicrinin çarəsi yalnız meydir.

Ey yolunu azan zahid, meyi nə təmənna ilə tərk edirsən,
Cənnətdə iki qapı var, ora aravuranların evi deyil.

Divanə Asi ilə dostluq sənə ar gəlməsin,
Söhbət tikandan getməsə, gülü iki qapılı saymazlar.

* * * * *

O məst gözlərinin qaşlarınla yaxınlığı var,
Sanki iki məst türkün əlində qılınc var.

Ürəklərin izdihamından ürəyimdə yer dardır,
Onun zülfündə yüz mənim kimi ayağıbağı var.

Zülfünün əsiri olandan bəri ürək mənimlə davadadır,
Həmsöhbətindən [onun] təsiri ilə tündxasiyyətlilik öyrənmişdir.

Tərsa ürəyimin sənin üzünə pərəstişi bu gün deyil,
Lap çoxdan onun dili onun zikrini edir.

Əgər zahid səcdəyə layiq bilməsə,
Ona nə Asi, nə meypərəst inanar.

* * * * *

Əgər ənbər qoxuyan zülfün atəşpərəst deyilsə,
Nə üçün üzüyün atəşinə səcdə edir?

Hüsn və üzdə [surətdə] heç kəs sənə bənzəməz.
Əgər xasiyyətin də sənin üzün kimi olsaydı.

Xəttdən (yeni çıxmış saç) üzünün səhifəsinə fərman verilib
Ki, hindu xalına Hind bac versin.

Lakin iki gözlərin qoymadı, onun qanını tökmədi,
Hansı şirlər sənin ahunun tələsinə düşüb ovlanmadı?

Ürəyimin qara bəxtli olmasına bax ki,
Xalqın ürəyində, saçlarında özünə yer tapmadı,

Ürəyim kilsə və Kəbə dığdığasından (iztirabından) azaddır.
Çünki sənin kəbeyi-kuyinə yol tapıb.

Əgər bağban çəmən sərvi ilə fəxr edirsə,
Ürəksiz Asi sənin ürək ovlayan qəddinlə öyünür.

* * * * *

Bayram günüdür, mən bu xirqə və dəftəri neynirəm?
Əgər badə yolunda girov qoymasan, daha onu neynirəm?

Əgər o meysatan gəncin yolunda can qurban etməsəm,
Çiynimdə ağır yük olan bu başı neynirəm?

Mənim ki mey əlimdə, dodağım saqinin dodağındadır,
Ey zahid, nə üçün hurini istəyim, kövsəri neynirəm?

Ey müfti, kabab bişirmək üçün odun yoxdur,
Yol göstər, minbəri yandırmayım, bəs nə edim?

Əziz şey ona görə varımdı ki, verəm şərab alam.
Yoxsa gümüş nə işimə yarayar, bu qızılı neynəyirəm?

Ağ bədənli gözəlim qara saçlı saqidir,
Belə qiblə olan yerdə, Azər meyxanəsini neynirəm?

Dəfələrlə bədxasiyyət zahidi yanımdan qovmuşam,
Ey Asi, belə eşşəyə əl qaldırmayım, bəs nə edim?

* * * * *

Dodaqlarına şərab piyaləsini toxundurmaq
Yəhyanın əli ilə Məsihinin bədənini yağlamasına bənzəyir.

Yox, səhv oldu, bunun ona nisbəti yoxdur, çünki
Əgər dodaqların danışmağa başlasa o fələyə qaçar.

O zülf dedi ki, Musa öz möcüzəsi ilə
«Kəlim» olsa da onun qarşısında pəltək qalar.

Əgər Misirli Yusif sənin qarşında özünü satsa
Onu al, hüsnün qulu et, özü də ucuz səkkizdə bir qiymətə.

Düz məst nərgizinin [gözünün] baxışının bir küncündə qaldı.
Xütən səhrasının hürkmüş ahusunun sevdası.

Şəkər dodaqlarının acı zəhəri də şəkər kimidir.
Dadına baxan zaman onun dodaqlarının adını çəkəndə ağzım
da şəkər kimi olur.

Mən Asinin ondan başqa təmənnam yoxdur ki, həşrə qədər
O harada olsa, onun yanında mənə məskən versinlər.
* * * * *
Elə güman etmə ki, o ay öpüşü ucuz verir,
Biçarə aşiq dodaq deyib, can verir.

Xəlqi-aləm əgər çətinliklə mələyə can verirlərsə,
Öz mələk simalı gözəlinə aşiq asanlıqla (canını) verir.

Sənin bu hüsnünü əgər Züleyxa görsə, xəcalətən
Öz Yusifini Kənan oğlunun əlinə verər.

Məst gözün əgər kiprik qoşununun cərgəsini bəzəsə,
Türkan şahı talan qorxusundan şəhərin bacını verər.

Necə ki, mən əsir, miskin ürəyin zarıncı vəziyyətini gördüm,
Öz ürəyimi o pərişan zülfə tapşırıram.

Hər kimin ki, başı qəm cəfasının daşına dəydi,
Ürək şüşəsini   pozğun uşağa tapşırır.

Ey zahid, dünən gözəllərin eşqini qadağan etdin, bu gün
Ürəksiz Asi onun zülfünün küfrünə imanını tapşırır.
* * * * *
Onun məst, şux və cadulu qara gözlərindən fəqan!
Ki, Türk və Xita şahı onun hindu qulamı oldu.

Ürəyim xəta etdi, sənin saçını mişk hesab etdi,
Sənin uzun zülfün kimi onun üzü qara olsun.

Min sənin kimi qarabəxti zəncirə bağlayıb,
Ey ürək, onun saçının çininə ehtiyatla get.

Əyri  gedənlər Mehrab güşəsinə meyl etməzlər,
O kəslər ki, onun qaşlarının tağı qarşısında səcdə edərlər.

Asinin ürəyinin çapıqları bir daha sağalmaz,
Onun ənbərin saçından müşk qoxusu çəkibdir.
* * * * *
Ey zülf sənin qıvrımlarının sonu yoxdur.
Əyri olsan da, uzunluqda qiyamətsən.

Əgər qamətin əyri olmasaydı, ey zülf, deyərdim
Ki, qəddin uzunluğunda almədə yüksəklik əlamətisən.

Gözəl qamətlilər arasından hüsnə qaldırdı
Onun qəddi, sənin ələmini, qara ələm bayrağını

Səni Xəta müşkü hesab etdimsə, məni üzürlü hesab et.
Xəta etdim ki, sən vallah, ayələrin ayəsisən.

O sənəmin üzünün aynasında öz əksimdən başqa
Sənə bənzəyə bilən bir şey yoxdur

Ömür sənin çətinliyindən dəyərsiz bir kitabdır
Və yəlda gecəsinin hekayəti ona görə qaradır.

Onun hər bir əyrisində türk satan dükanı var,
Bəh-bəh, nə yaxşı ticarət edirsən.

Ürəyim daraq cövrü və badi-səbaninın (əlindən)
Özünü himayət üçün sənin canamazına (səcdənə) atdı.

Sənin cəfa və zülmün haçanatan olacaq, ürəyini sənə
tapşırmaqdan başqa
Miskin Asinin səninlə heç bir ədavəti yoxdur.
* * * * *
Ey üzüqara zülf və ye dostun xəta görmüş xalı,
Və ey dostun vüsal yolunun hindu yol kəsənləri,

Hər ikimiz qara Abbasilər kimi qara geymişsiniz
Dostun cəmal mülkünün xilafətindəsiniz

Mani xəcalətdən Ərjəngin qanını tökər,
Əgər dostun misalında Çinə təsvir göndərsələr.

Əgər onu huri  hesab etsəm, hurinin əksi gözümdən gedər.
Aynada dostun camalından başqa bir şey qalmaz.

Yeni ayın gözünə yeni ay barmaq uzadar.
Dostun hilalı qarşısında cərx xəcalətdən.

Ey bağban, sənin becərdiyini kim böyütmüşdü?
Hüsn və qamətdə dosta bənzəyən sərvi.

Asi, yarın cəfasından Allaha şikayət etmə,
Ehtiyatlı ol, dostun dost yanında xəcalət çəkməsini istəmə.

* * * * *

Onun kök sağrısının arxasının şövqündən su rəqs edir,
Onun sağrısı da suda civə kimi rəqs edir.

Gah onu ağuşuna alıb ondan nur kəsb edir,
(Sanki) Günəşin şüası suya düşüb rəqs edir.

Yeni ay kimi  yeni  quyuda suya qərq olub,
Yaxud ümmanın dibində dürr şadlıqla rəqs edir.

Həddindən çox soyuğun əzabı təsir etdiyi kimi,
Elə əsir ki, sanki qırmızı şərab piyalədə rəqs edir.

Asi onun sağrısının tamaşasından elə lovğalanır ki,
Sanki yumşaq quzu quyruğunun ətrafında qəssab rəqs edir.

* * * * *

Sizin pərişan zülfünüz Rüstəmin kəməndidir,
Çahi-zənəxdanınız isə aşiq olmuş Bijəndir.

Dində olduğu kimi bizim peyğəmbərlərimiz, peyğəmbərdən
sonrakı sələflər
Ləğv olundu Yusifin qissəsi sizin hüzurunuzda.

Cənnətin bağbanı tuba ağacını kökündən çıxarar,
Əgər sizin sərvi-xuramanınız onun qarşısında nazlansa.

İmdad istəyənlərin hücumundan qorxuram ki, məhşər günü,
Ürəyim sənin ətəyindən tutmaq üçün əl yeri də tapmasın.

Sənin atəşini (əzabını) cənnət hesab edirəm, mənə eyb tutma.
Sənin vəslin və hicran əzabın mənə cənnətidir.

Küfr zülfünün yolunda dinimi və ürəyimi bada versəm də,
Ürəyi başına fırlat, iman sənə qurban olsun.

Ürək şəhristanında qəm ləşgərinə yer vermisən
Ki, sənin viran etdiyin mülk abadlaşsın

Yavaş-yavaş ürəyi oğurladın, axırda başqasının yarı oldun,
Ey bimehr, bizim əhdü peymanımız necə oldu?

Eşq dərisini sən müshəfdən dedin, ilk ustad
Sizin məktəbin tifili Asiyə öyrətdi.

**********

Bilmirəm ki, neçə huridən doğulmuş, zöhrə alınlısan?
Bu sifətlə sənə demək olmaz ki, soltansan.

Pəri oddan yaranıb, bəşər gildən (palçıqdan).
Sən nə ona, nə də buna bənzəyirsən, sən məhz qəribə
nurdansan.

Əgər səni lətafətdə aya və günəşə bənzətsələr,
Xəta olar: sən nə osan; cəfa olar sən nə busan.

Sənin üzünün qulamı ay olar, qəddin şümsaddır.
Sən nə ona, nə də buna bənzəyirsən, sən məhz qəribə
nurdansan.

Nər nədisə, ey ürək, əgər həqiqətə baxsan,
Dostun üzünün günəşinin kölgəsindən özgə şey görməzsən.

Miskin Asi sənə ürəyindən və dinindən başqa şey vermədi.
O nə etmişdir ki, indi onunla kin saxlayırsan?

* * * * *

Nə qədər ki, ürək quşu qoşa zülfünün əsiridir,
Onun gözləri daraq və səba yelindədir.

Əgər məni öldürmək əzmində olsa o qıyqacı papaqlı
Xəncəri əlinə alıb qəbasının altında gizlədib.

Ey gümüşü rəngli, bürqəni üzündən götür.
Canan, mənim gözlərim illərdir ki, onu görmür.

Ürəyə paxıllıq etdim ki, nə əzabla
Sənin zülfünün qatlarının zənciri onun əl və ayağına vurulmuşdur.

Ayrılıq gecəsi şam kimi dibinətək əridi,
Asi, ürəyin onunla gərək vuruşsun.

* * * * * *

Sənin o xalın adəm üçün on qaniçən quldurdur,
Əgər onun aşiqi yüz min olsa, yenə də azdır.

Əvvələr mehrabın hörməti bu qədər deyildi,
Sənin qaşlarının tağı ilə indi belə möhtərəmdi.

Düzgünlüyü seç ki, bu alçaq dünya
Qəmdə olduğu kimi kiçik və böyüklə müxəlifətdədir.

Ey mütrüb, dəf, tar, çəng və ney çal.
Saqi, şərab ver ki, şadlıq əyyamıdır.

İraq, Fars, Nişabur və həm də Hicaz mülkü
«Dilkəş»in üzüyü, Cəmşidin camı altındadır.

Mütrüb elə ki tənbura qulaqburması verir,
«Hisar»dan aşağı oldu, onun mizrabı bəmdədir.

Məşşatə [onun] qara zülfünə daraq çəkdikdə
Ürəyim darağın [dişləri arasında] sənin zülfünlə qarışıq [daranır]

Yenə rəqib mənim dilimdən ona nə demişdi ki,
Ətəyini yığıb Asini öldürməyə qərar vermişdi.

* * * * * *

Zahid, mənə meyxanədən Kə'bəyə getməyi təklif etmə,
Adəm kimi cənnət bağını əfsanəyə dəyişən deyiləm.

Kövsər suyu səndən inciyib səni and verirəm,
Bir daha mənim yanımda peymanəni tərk etməkdən danışma.

Hansı aqil nəğdi nisyə vədəyə satar?
Üsulunu kənara qoy və həkimanə cavab ver.

Bir əldə cami-mey, başqa birində saqinin saçları,
Məhşərə gedirəm, əgər sən yüz dənəli təsbihlə gəlsən.

İlahi, o ölkəni Lut şəhəri kimi viran et.
Ki hər guşədən qəm-kədər gəlməsin, məstanə hay-küy (gəlsin).

Adı itmiş və rusva olmuş dəli ürəyimi yadıma salıram,
Əlində daş tutmuş tifil kimi viranə ətrafında dolaşır.

Bilmirəm nə üçün o ay Asi ilə sərxoş kimi davranır (qaçır)
Bu adətdir ki, pəri divanə ilə ünsiyyətdən qaçmaz

* * * * *

**Qətlə yetirilmiş mərhum Mahmuda**

Sərvi-xuraman kimi gözəl qamətinə heyif.
Ki əcəl bağbanının əli bu yaşında onu kəsdi.

Ey çərx, məgər ürək üçün şahmar zülfü bəs deyildi,
Onun pərişan zülfü xarabalıq ilanının yuvası
olmuşdu.

Bilmirəm nə Yusifsən ürəkdə ay üzlülərin var
Ki, harada bir Yusif görsən zindanında məhbus
edirsən

Qaşlarıyla yrəyimə qılınc vuran o güləndam,
İti qılınc yarasıyla qanlı torpağa tulladı.

Səba, məgər xəcalət çəkmədinmi gülüstanda?
Onun parlaq üzü nəsrin gülünü xatırladırdı.

Nə üçün parlayırsan, ey günəyş, onun zülfü kimi?
Qara olsun üzün, onun parlaq ay üzünün
qürubundan sonra.

Gözüm ağlasa bulaq olar, məndən daim qan süzər.
Qara torpağın zülmətində həyat suyunun qapısı kimi

Öz əslinə vasil olub, ey ürək bir daha tapmazsan,
Minlərlə əsr əgər axtarsan nə aşkarın və nə
gizlisini.

Məgər onun bizə müraciəti müraciət edilmişə ağır gəldi?
Dostlarının arasında bütün deyilənləri özünə götürdü.

Əgərçi onun küfr zülfü imanları qarət edəndir,
Ey xudavənd, iman əhli olması ilə onu məşhur et.

Yarəb, onun qamətinə zahiri gözəllik, zinət ver.
Əgər şərafətlisənsə onu bu cürə üryan yaratdın.

Bədən torpaq olmadı, qan saçan gözün kor, aqibətdə, Asi,
Torpaqla qan arasında öz gözümlə qəltan olduğunu gördüm.

* * * * *

Əgər sənin adını çəkib, mədh edirəmsə,
Hamı bilir ki, mən sənə pərəstiş edirəm.

Bu gözəllik işığı Adəmin zatında olduğu üçün,
Bütün səmavat əhli sənə  səcdə etdi.

Ey dost, nə istəsən et, çünki sənin gözəlliyinə
Qiyamətdə də layiqli mükafat alarsan.

Güzgü tək üzünə diqqətlə baxsam,
Allahın nurundan özgə heç nə görünməz.

Əgər Asi «Allahdan başqa heç nə yoxdur» sözünü dilinə gətirsə,
Hamını inkar edərlər, təkcə səni yox.

* * * * *

Əgər ürək sənin zülfündən özgə yerdə qərar tutsa
Dəlvin baş həlqəsini niyə rüsvaylığa çəkirsən?

Qara məst gözlərin qaşlarının küncündə heyran qalıb,
Sanki, hindu uşağı kilsə tağında yatıb.

Baxışlarının təsirindən özünü itirən günəş,
Bulud altında xəcalətdən gizlər.

Səlman pəncəsini mənim qanıma büləməyə nə hacət var?
Gəl onun zülfü, üzü və qəddinə bax, ey Musayi-İmrani

Nə ağac verdin, bu nə tubadır, nə ağlıqdır?
Can nəğdi ilə alıcıyam, lakin səni tapmıram,

Ey ay üzlülərin vəsfi olan məta, bilmirəm nə malsan?
Səri-zülfünün küfründən özgə Asinin məzhəbi yoxdur,

Nə mömünsən, nə dindarsan, nə rahibsən və nə tərsasan?

* * * * *

Gözəllərə rəhmsiz kafirlərdən yüz zərbə dəyər,
Müsəlmanlar görmüşlər bunu ki, bütsündüran kafərdir.

Ürək quşum onun saçlarının çinində yuva qurub,
Çünki axşam harada düşsə, ora qəriblər üçün vətəndir.

Kədər evinin sakinlərinin hərgiz əlacını görmürəm,
Məgər ki, badi-səba o köynəkdən ətir qoxusu gətirə.

Əğyarın deməsi ilə mənim türküm məni tərk etdi,
Nə qədər ki, canımda can var onun eşqini tərk etmərəm.

Onun məhləsinin dilənçisi olmaq şahlıqdan yaxşıdır
Ki, danışan tuti şəkkər dodaqlı və şirin sözlü olar.

Məgər zülfün Rüstəmin kəməndi kimi ürəyimi tutar,
Yaxud Bijən o alcaq quyuda olduğu kimi bəndə düşər.

Asi, o şəkər süzülən dodaqların söyüşündən incimə,
Gözəl üzü olan hər kəsin cavabı çirkin olar.

**********

Əgər nigarım bu surətdə görünsə,
Qiyamətin həyəcanı yüz dəfə artar.

Çətin ki, bundan sonra dünya anası
Sənin kimi cavan bir gözəl doğsun.

Çətin ki, Şuşada sağlam bir adam qalsın,
Bu pəri belə ki, ürəkləri aparır.

Tatar müşkünün bazarı kasad olar,
Əgər nigarım ətirli saçlarını açsa.

O şirin ləbindən bir cavab buyur,
İstər acı, istər şirin ola, yaraşır.

Onun ləblərinin hədisini hər kim etsə,
Sözlərindən şəkər süzülər, Asi.

* * * * *

Elə ki zülfünü üzündə pərişan yaratdılar,
Bunlardan küfr və iman yaratdılar.

Dünya fitnədən bir dəm azad deyildir,
Məst türkan gözləri yaratdıqları üçün

Misir qadınları o dəm əllərini kəsdilər
Ki, Kən'anda Yusifi yaratdılar.

Bağda bülbülün ahü nailəsi üçün
Qönçənin ağzını xəndan yaratdılar.

Aşiqin qara bəxtinin arqacından
Hicranın qara gecələrini yaratdılar.

Kəbəyə bənzər məhləyin həsrətindən,
Ürəkdə alkasia tikanı yaratdılar.

Əgər sənin hüsnünün eşqini ölçsələr,
Ölçü yaratsalar da, ölçüyə sığmaz.

Sənin üzünün eşqinin atəşində
Xəlil kimi gülüstan yaratdılar.

Üzün Nəmrud kimi «ənəlhəqq» söylədi,
Əlindəki oxu kipriklərindən yaratdılar.

Asi eşiq sultanının bəndəsi olduğu üçün
Onun qulamını yüz sultana bərabər yaratdılar.

* * * * *

Ürəyim dalğavari saçlarının toruna düşdü.
Bundan sonra işlərim lap müşkülə düşdü.

Deyərdim ki, heç kəsə mən könül verməərəm,
Nə edim ki, səylərim faydasız oldu.

Sərv qaməti tək nazlanmaq istədi,
Bağda ayağı gülə ilişdi.

Zülfünün ətrini badi-səba bağlara apardı,
Bundan sünbülün hali pərişan oldu.

Ləblərindən bir qətrə mey dadmamış,
Ürəyim mey satılan yerdə divanəlik küpünə düşdü.

Sənin dəli etdiyin təkcə Asi deyildir,
Aqil olan hər bir kəs sənin həbsinə düşdü.

**Sədinin qəzəlinə təxmis**

Bahar gəldi, bəhmənin[1] gözlərindən yaş süzüldü
O bəhmən ki, gülü soltandan qaçaq etdi.
Özünə qəzadır heç nəsiz gülüstanı seyr etmək,
Ruha peyvənd edər bu müşk saçan külək.
Ey nədim, səhərin növbə vaxtıdır, qalx.

Mən o deyiləm ki, şeyxə şübhə edəm
Gül mövsümündə meydən və məşuqdan yaxşı nə var?
Saqi, gəl məclisi bəzə və mey ver,
Şahid, oxu, şam yandır və gül qoy,
Ənbər saçan udu yandır və mey süz.

Ey tünd təbiətli türk, məni imtahan etdikdən sonra
Nə vaxta qədər qəmzə oxlarınla, tük ipinlə məni
öldürəcəksən?
Sənin qiymətli ayaqlarına canımı əsirgəmərəm,

[1] Bəhmən —İran təqvimində on birinci ay.

Əgər qılınc vursan indi sipər mənim vücudum olar.
Əyar Əxtərizin ölümümü iddia edər.

Ey ürək, dünyanın var-yoxuna ehtiyacın olmasın,
Cah və mal nəhrində təlaş etmək layiq olmaz
Ki, təxt, bəxt, sənin üzün, qızıl və şövkət dolanışıq vasitəsidir.
Elə ki dost əl verir heç nə demə,
Onun şahı kimi evlənməmiş cehizsiz gedərsən.

Ey badi-səba o tərəflərə güzarın düşsə,
Məni - xarabdan bu xəbəri ona çatdır:
Haçanatan vüsal vədəsi ilə mənə əzab verəcəksən?
Bulud dürr əmrini istidən verir.
…xəstə «la-fa» deyə-deyə təşnə ölər.

Barı macəra vaxtı (heç olmasa) lütf göstərib,
Mənim nə'simin üstündə (baş tərəfinə) onun ayağını rəsm edin.
Hər iki cahanda mənim iddiam sənin vəslin olduğu üçün
Sabah ki, torpaqdan yenidən baş qaldırsam,
Onda qyamət günündən azad olaram.

Ey dilbərlərin qibtə etdiyi, mənim sərvinaz gülüm,
Sənin üzünün eşqi mənim üçün həqiqi, əbədi və məcazimdir,
Qibləm sənin qaşlarındır, mənim razü niyazımdır.
Qiyamətədək mənim namazım özü hara çatar?
Mən üzümü sənə tutur, başqaları isə möhrə.

Ey gözəllik şahı, üzünü görən hər kəs mat qaldı,
Sənin eşqin ürəyimə bağlanmış fildir, hicranı qovdu.
Asi bu burulğandan canını necə qurtara bilər,
Sə'di eşqinin tələsində ayağı bağlı qaldı.
Həbs etmədi ki, qaça bilsin.

**Natamam qəzəllər**

İşvəkar dilbər yenə də cövlana gəldi,
Baxışları aşiqlərin ürəyini əfqana salan gəldi.

Canlar alan tər saçları bütün gözəllərin ürəyini aldı,
Əyri-əyri saçları ürək və can tələsi olan gəldi.

Şəkər dodaqları aləmə şur saldı,
Fitnə baxışlı dövranın fitnəsi gəldi.

Qara füsünkar gözlü məst türk,
Bütün gözəllərin sırasını pozan səfdər gəldi.

Gah cigər yandıran kipriyi ilə ürəyimi deşdi,
Gah da qara qövsü (qaş) ilə zər saçan gəldi.

************

Zahidə azar vermək qəsdi ilə məstanə
Məscidlərdən bir məscidə tərəf keçdim.

Mehrabda bir şeyxin oturduğunu gördüm,
Əlində təsbeh Mahmuda dua edirdi.

Müridlər səfbəsəf onun arxasında dayanmışdılar,
Duanı yamsılamaq üçün səcdəyə durmuşdular.

Bir saatdan sonra dua, namaza başladılar,
Yüz işvə ilə zahid minbərə çıxdı.

Bir qədər əmri-mərufdan söhbət etdi
Sonra insdən, münkirdən, dalınca da əqidədən.

Düz yerimdən qalxdım elə ki, söz
Mey və gümüş biləkli saqidən düşdü.

Tutub zarafatla onu çəkdim,
Minbərdən ona dedim, ey paxıl div

************

Bu gecə nə gözəl gecədir, bu gündüzdən də işıqlıdır
Və bu ətirli məclis gülşənə bənzəyir.

Bu gecə mütrüb, mey, məşuqə yanımda olduğu üçün
Yer üzünün padşahından fəxarətliyəm.

Ənbər qoxusuna, mişk ənbərinə nə ehtiyac var?
Məclis yarın zülfündən mişki-ənbərlə dolubdur.

Sənin vəslində, ey sənəm behiştə nə ehtiyac var?
Sənin üzün mənə behişt, dodağın isə
kövsər hovuzudur.

* * * * *

Əgər ömürdən bir dəm şahidsiz və sağrsiz keçərsə,
Sınadıq, bir ömrə bərabər keçər.

Dodaqlarını şəkəristan yaratdılar
İmanın həlavətbəxşi yaratdılar

İki gözlərini iki kafər adlandırdılar
(Onları) Yüz müsəlman üçün yaratdılar

Sənə taxta çıxmış kafir dedilər
Məni Şeyx Sənan kimi yaratdılar.

* * * * *

Qalx ki, qış gedir,
Bostan və sarayın qapısını aç.

Tabağa narınc və bənövşə qoy,
Gecələr manqal qoy.

Qalx ki, novruzun sübh küləyi
Bağçada gülləri açır.

Ürəyin avazı gizli qalmaz,
Gülbən altında pünhan eşq.

* * * * *

İnsafdan olmaz o ürəyin bənd olduğu üzü gizlətmək
Çünki o elə üz deyil ki, ondan səbrə dözüm olsun.

Sənə müştaq olalı aram və səbr necə ola bilər,
Eşitməmişəm ki, hərgiz başını candan ayırsın.

Bu gün yəqin oldu ki sən xəyali məhbubsan
Ki ürək aləmi və bütün bu can səninlə getdi.

* * * * *

Hər kimin gözəl üzü olsa, naçar
Haradan keçsə hamı ona göz dikər

Ey gül, sən bunu bülbülün xətirinə gözlə
O yerdə ki, rəng və qoxu olar, orada danışıq olar.

Gözəl üzlü bütün şəhərlərdə olar, lakin
Sənin kimi pak əxlaqlı, gözəl üzlü olmaz.

Nəfsim arzu edir ki, dodağımı dodağına qoyam,
Min ildən sonra da qoxuyucu gələr.

* * * * *

## RUBAİLƏR

İlahi, ürəyim şadlıqdan ötəri nalə edir,
Hicran gecəsi sübhə qədər nalə edir.
Öyüdümü eşitməyib, yaxşıların ardınca getdi,
Onlardan yalnız murada yetməməyə görə nalə edir.
* * * * * *
Bir cavan qoca ürəkliyə açıq dedi:
- Nə itirmisən ki, bu yolda əyilmisən?
Cavabını verdi xoş danışıqlı qoca:
Ki, gənclik əyyamını itirmişəm.
* * * * *
Ey badi-səba, əgər sənəmin sərmənzilinə yetişsən,
Ümid edirəm ki, mənim salamımı ona çatdırasan.
De ki, ürəyimin onun xətti ilə həqqi-vəfası var.
Onu ənbər qoxulu saçlarında möhtərəm saxla.
* * * * *
Saqi, daha Kövsərə həvəsim yoxdur,
Mənə meyxanədə bir cam şərab bəs edər.
Bu xirqədə çox xoşam ki, ömrüm boyu bu libasda,
Şərabxor olmuşam ki, heç kəs məni tanımasın.
* * * * *
Sənin üzünün eşqi cilovumu əlimdən aldı, qalx,
Daha məndə güc və qüdrət qalmadı, qalx.
Əzəli eşqin yolunda yaxşı və pis olmur,
Sən özün xoşluqla öz hicabını aradan qaldır.
* * * * *
Bu günüm də başqası kimi sənin fəraqından şam oldu,
Sənin cəmalını görməməkdən ömrüm tama oldu.
Axşam namazı gəldi, mənim nigarım gəlmədi,
Ey gözlərim, qan ağla ki, yuxun haram oldu.
* * * * *
Eyb axtaran bir gün Məcnuna dedi:
Ki, Leylidən yaxşısını tap
Ki, Leyli gərçi sənin gözündə huridir
Hər üzdə onun üzvü qüsurludur

## DİNİ ŞEİRLƏR

Peğəmbərin əcəl vaxtı çatanda,
Onun xələfi vilayətin şahlığına yetişər.

Məhəmməddən sonra xəlifə Əlidir.
Ondan başqa xəlifə olmamış və yoxdur.

Hər xalifin belə xələfi yoxdur
Ki, onun varlığı rəhmətə baisdir.

Əlinin zatı haqqında fikirləşmək ağıla sığmaz,
Dil Əlinin keyfiyyətini necə söyləsin?

Əlinin zatından bir kəs agah deyil,
Allah bilir ki, Əli kimdir.

Heç bir ana onun kimi oğul doğmayıb,
Dünyaya onun atasından sonra ata gəlməyib.

Sevimli Allahın srri idi Əli,
Cəbrayıla ustad Əli idi.

Həqqül-yəqin (inkaredilməz həqiqət) elminin banisi Əlidir,
Rurhül-aminin (Süleyman peyğəmbərin) sirrini kəşf edən Əlidir.

Həqiqət elminin xəzinəsinin açarı idi,
Beşikdə əjdəhanı öldürən (deşən) şah idi

İmanların imanı onun pişvasında idi,
Əql və din məzhərinin kərəm mühiti.

Müdafiə edənin (şəfi) özü dəlilin astanasi,
Səlsəbil şəhərinin Allah tərəfindən valisi.

Ərəblərin əmiri, zülfüqarın sahibi
Əzəmətli şir kimi Düldülə minib

Fələk bürcündə nurlu aydır.
Din meydanında onun kimi şahsuvar

Olmamış, dünya üzünə gəlməmişdir.
Heç kəs Əli kimi bir cavanı xatırlamır,

Onun kimi adlı-sanlısı anadan olmayıb.
Mərdanəlikdə Əli kimisi olmayıb.

Ədəmdən xəbərsiz vücuda gəlməyib,
Xeybəri heç kəs fəth edə bilmədi məgər

Xegrülbəşərin kürəkəni Yadulla.
Əlinin vəsfi dil ilə mümkün deyil,

Əliyə məhəbbətsiz can bədəndə deyil.
Oyunda fələk onun meydanının topudur,

Qəza onun zülfünün əyri çovkanıdır
Fələyin başı Əlinin ayağının tozudur,

Fələyin qəzası  Əlinin razılığı ilədir.
Hər hansı tərəfə düşsə onun ayağındadır,

Mələyin başında yeri olmağa layiqdir.
Əlinin sifətləri (xüsusiyyətləri) nəhayətsizdir,

Ağıl Əlinin zatını necə öyrənə bilsin?
Mənin bədənindəki canım Əliyə vurğunluqdandır,

Əlinin keyfiyyətlərinin intəhası yoxdur.
Hər kəs Əlini xudanın peyğəmbəri hesab etsə,

Şəfaət açarı onun əlindədir.
Əgər tərifə layiq vasitəçi varsa, odur.

Cahan onun lütfündən vücuda gəldi.
Əli olmasaydı, yaradılış da olmazdı.

Ağıl onun həsirindən işıqlı olubdur,
Cahan onun gözəl nəfəsindən gülşən olubdur.

Cahanın mövcudluğu Əlinin ətasındandır,
Cahan Əlinin hüsnü rəğbətindən paydardır.

[O] cahanın seçilmişi, hər vücudu icad edəndir,
Əli idi, Əlidən başqa heç kəs deyildi.

Fələyin hicabı Əlinin sir pərdəsidir
Yoxsa, cahan onun ecazının bir cüzvüdür?!

Yer Əlinin ayağının tozundan bəzənmişdir,
Fələk Əlinin istəyi ilə baş-ayaq (sərnigün) olubdur.

Peyqəmbəri haqq bilən Süleymanın
Üzüyünün bəzəyi Əli idi.

Aydın xətlə qüdrətdən yazılıb
Süleymanın üzüyü Əlinin adına.

Cahanın (ixtiyarı) yüyəni Əlinin ovcundadır.
Süleymanın üzüyü onun barmağındandır.

El əki, onun lütfü oda-atəşə dəlil oldu,
Onun lütfündən Xəlilə gülüstan oldu.

Büt sındırmaqda qiyam qaldırdığı üçün
Ehtiram əlaməti olaraq ayağını peyğəmbərin
çiyninə qoyar.

Əlinin şanına söylədiyimiz Əli
Əlini Allahın Əlisi kimi tanıyır.

Asi, gəl bəndəliyi özünə peşə et,
Qəflətdən çıx, bir dəm fikirləş,

Ali-rəsulun ətəyindən tut.
Ki, bəlkə qulamlığa qəbul oldun.

Onun dodaqlarının yadıyla bir piyalə iç,
Onun yadıyla cahanı unut.

Nə qədər ki, yaşayırsan ona nökərçilik et,
Bəlkə onda bu burulğandan nicat tapasan.

Onun dərgəhından özgə bir pənah axtarma
Ki, hər iki aləmdə kamyab olasan.

Asinin cəza günündən nə qorxusu var,
Mən və əlim, şiri-xudanın ətəyi.

*********

Ah o dəmlərdən ki, lənətə gəlmiş alçaq Şimrün kinindən
Şah din şahının qətli arxasınca gedir.

Elə ki, din şahının başını əzabla
O, sitəmi özünə peşə edən bədənindən ayırdı,
Cəbrayıl yüz şurü nəva ilə dedi:
Qurani-möbünün natiqi öldürüldü.

Məhşər qovğası onlara əyan oldu,
Yerdən göyə qədər fəğan oldu.
Bütün peyğəmbərlər ağlaya-ağlaya
Din şahənşəhinin türbətinin üstünə getdilər.

Şəhərin meydanında gördülər ki,
Şəhidlər şahının bədəni və başı qalıb
Başına döyüb elə va vələda dedi
Ki, dünya sanki hərəkətdən düşmüşdü.

Bu arada Rəsulun gözü
Yüz parça olmuş cigərparəsini gördü.
Qana qərq olaraq dedi, bilmirəm hansı
məzhəb sahibi
O kəs səni bu vəziyyətə saldı.

Murtuza onun taqətsiz halını,
Pak bəşərin qana qərq olmuş bədənini gördü.
Ürəkdən ah çəkib belə dedi:
Dinin sitəmxanəsi bərbada getdi.

Məryəm, Hacər, Sara və Bətul
Gözlərindən yaş süzülə-süzülə

Taqətsiz olub elə nalə çəkdi ki,
Əzəmətli ərşin şahı, həyəcanla doldu.
Dünya anası paltarını əynindən çıxartdı.
Məsiha şahı fələyə kədərlə zar etdi.

Bir tərəfdə Məryəm, bir yanda Hacər,
Başlarına toz-torpaq tökdülər.
Bir tərəfdə Asiya atasının yadıyla
Torpağa düşən şaha kədərlə növhə deyirdi.

Elə ki, şahi-şəhidin qızı gördü,
Üzünü dua edən yaxınlarına tərəf çevirdi.
Dedi, ey əmmə (bibi), sən allah, söylə,
Qərib babamın şahı həqiqətən öldürülüb?

Fəryad edərək Müztər Zeynəbin ətəyindən,
Tutdu və fəğan edib huşunu itirdi.
Dedi ki, gələrəm ey bibi,
Qətl xəbəri Cəbraildən əmin oldu.

Ümmətlərə verilən zülmdən zövq almaq üçün
Sitəm zəncirinə bağlayıb öldürdülər
Çərxdən elə bir ah, kədər qalxdı ki,
Fələk təsxir əlini alnına qoydu.

Bəşər fəxrinin övladının əzasında
Qədrdə şah başına torpaq ələyir.
Yaşlı gözlərindən xuni-cigər axıdar
Qəmli Asi, axırıncı günə qədər.

**********

Çəmən yenə də lalənin əzəmətli qədəmindən qızardı
Cənnət bağının acığına yaşıllaşdı və qələbə çaldı.

Jalənin üzünə şeh damır, onun ətrafına halə çəkir,
Bənövşə, qırmızı gül, lalə, zəmiran və rəna gülü.

Bülbülün yüz ləhndə oxuması çəmənə hay-həşir salıb.
Təravətli tər sünbüllər, mükəmməl nərgisi-şəhla,

Səba gülşənə zümrüd fərş saldı.
Nobahar buludları toz-torpağın üzünə inci səpdi,

Sərv və gül şaxında yüz vəcd və fərəhlə onu çəkdi.
Qırqovul, silsil, tuti, qumru və bulbul.

Bu avazda nolardı əgər o daş ürəkli şux Ayım olaydı.
Bu mövsümdə nolardi əgər o tərsa dilbər gözəlim olaydı

Lütf edib mənə ram oldu və əğyarın olmadığı.
Gülüstan səhnəsində o və mən hər ikimiz gizləndik.

Bir tərəfdə yasəmən və gül, xoruzgülü, nəsrin və sünbül,
Sərvin ayağına gümüşü camda şərab tökürəm.

Düşmənçiliyə baxmayaraq sevincdən süsənin ağzını açıram
Ki, bir qədəh içirdib yarıməst edəm.

Noğul əvəzinə onunləlindən şirin busə alam,
Onun üzündə ud[1] əvəzinə canımı üzərlik kimi yandıram.

Busədən imtina edib, heyifdir desə də,
Nəzakət divin görünüşüdür, və necə ki zülmət yolda mələklər.

Deyərəm, ey pəri, güya qorxmursan, rişxənd elə
O dodağa de ki, vəli, vali və valanı mədh etsin.

---

[1] Ud- Hindistanda bitən ətirli ağac.

Əli cənnətin sevimlisi
……………………………………………

Fələyimizin qüdrəti var, onun məhləsini ənbiyalar ziyarət edər
Ölümdən başqa nə varsa qadirdir, elmdən başqasını biləndir.

Məkan və yerin xudası, həzrəti-Allahın yaxın dostu
Başdan başa quran ayəsi onun zatını vəsf edir

Əlinin zatı idarə edəndir, cahan başqa şeydən düzəlib.
Əgər istəyirsənsə Allaha bax, onun zatında mövlanı gör.

Əli haqqın bəratinin mehri, Əli həqqin zatının bəratıdır.
Onun zatından haqqın sifəti əks aynada görünən kimi peydadır.

Hikmətə daxil olub ehtiyacı öyrənməyə elm azdır (acizdir).
Səmma qayasının altında əgər qırmızı gül açsa,

Fərz edək ki, onun hökmü ilə gül onun qarşısında xardır.
Onun nuru cənnətdə atəşdir, Sina ziyanı ondan alır.

Haqq Peyğəmbərinin vaxtında, aləmi-əkbərdə sabitlik olan zaman
Əli o taha mənzilində beşikdə olarkən əjdəhanı böldü (deşdi)

Onun məqsədi xalqı yaratmaq idi, aləmdə əvvəlinci onun nuru idi.
Haqdan özgələrindən o uzaqlaşdı, necə ki, İsa cuhud tayfasından.

Onun rövnəqindən qapı-qapı düşənlər də, xəndəklərdə olanlar da şərafət tapdılar.
Haqqa haq qovuşdu necə ki, tanış tanışa.

Əbədi və fani dünya onun soltanlığına tabe oldu
Dünya sirlərinin Bürhanı onu mədh edir.

Əli bağının vəkili «sin» surəsindən bəyandır.
Dünyanın şahı, dinin rəvacı İsa və Musanın müdafiəçisi

Adəmin ən yaxşı nəvəsi, aləmin xilqətindən məqsəd,
Əlidən başqa kim məhrəm ola bilər onun xəlvətgahına?

Əgər Adəmin qəlbində onun pak nuru olmasaydı,
Yuxarı aləmin asimanı ona səcdə etməzdi.

Xəlilullahın dövründə adını  vasitəçi etməzdi.
Haraya od vurdularsa gülüstan kimi ürəkaçan və qözəl (oldu)

Zülfüqarının zərbindən kim öz canını salamat qurtara bilər?
Beyca döyüşü günü Ömər, Mərhəb və Əntər olsa da.

Əgər o, həqqin zatını isbat etməsəydi məhşərə qədər,
Hamı inkarda qalıb, heç kəs «Allah» deməzdi.

Dinin pənahı Əlidir, Həqqin vəlisi, dinin şahıdır.
Onun qorxusundan din yolunda düşmənlərin ən böyük adlısı

Həmişə yerdə onun qüdrət ruhunun əksi olar.
Bu mina künbəzdə onun nəqşi hər yerdə gül çəkməkdir.

Əgər əmri carı olsa, yaxınları da düşmən olar,
Abad olan dağılar əgər «la» söyləsə.

Bu qədr və möhkəmliklə xudanın, ya şahın əlindən qafil
Qorxusuz-hürküsüz o kafərin meydanına daxil oldu.

Qeys kimi qeyzdən onu iki parça etdi,
Şəhi-mərdan vəli, alilərin alisi gül Əli.

Sən şahsan ki, səni həqiqətən həqqin Mustafası sir hesab etdi.
Dünya və aləmdə olan nə varsa onlar yüksəkdir, sən isə ağa.

Agah ol! Nə qədər ki mina çərxin və yerin dolanmağı var,
O zamana qədər həqqin sakini və vahidi-yekta da var.

Dostların həmişə bağdakı güllər kimi şad və xəndandırlar.
Düşmənlərin isə daima paşa kimi ürəklərinin qanını yeyirlər.

Ey şah, Asinin əlində üsyandan başqa bir məta yoxdur,
Ey mövla, bununla o səndən şəfahət ümidindədir.

Əgər sənin lütf və feyzinin müqabilindən kimsə qaçarsa
günah olar,
Ey dünya və aləmin şahı, əgər bir kəsi çağırsan.

Əgər lütf ilə iblisi çağırsan, o mələklərin ən şərəflisi olar,
Əgər qovsan İsgəndər və Dara dilənçidən də əskik olar.

## FƏRDLƏR

Mən öz ixtiyarımla onun cəfası üzündən getmirəm,
Onun kəmənd kimi saçları məni çəkə-çəkə aparır.

* * * * *

Aşiq öldürmək adəti qarışıq şəhər üsuludur,
Bu, onun qamətinə tikilmiş bir paltar idi.

* * * * *

Həqəqət əhli elədirlər ki, onların barını yemək olmaz
Necə ki, başqasının bağına kölgə salan ağacın barını yemək olmur.

* * * * *

Ey milçək, Simurğ meydanı sənin cövlangahın deyil,
Öz ərazində uç və bizə zəhmət ver.

* * * * *

Dil qılıncından ürəyə vurulan yaranı,
Heç bir məlhəm rahatlayıb sağalda bilməz.

* * * * *

Etdiyim hər xidmət muzdsus olar,
Yarəb, heç kəsin xidməti inayətsiz olmasın.

* * * * *

Ürəiyn özü dərdli və yaralıdır,
Sən də yaranın üstündən neştər vurma.

* * * * *

Dilbərlə vüsala yetənlərdən başqa,
Hərgiz mənsəb və mala həsəd aparmadım.

* * * * *

Pərvanə və mən yandıq, amma,
Mən can və cigəri, o isə qol-qanadını yandırdı.

* * * * *

Hicran elə bir dağdır ki, onu dağın cigərinə qoysalar,
Daş sinəsinə döyə-döyə gəlib fəryad edər.

* * * * *

Yarəb, ürəyin rəva gördüyü bu bir qətrə qan [dan ötəri]
Haçana kimi amansız ay üzlülərdən sitəm çəkməliyən?

* * * * *

«Əgər»i «məgər»lə evləndirdilər,
Onlardan «kaş ki,» adlı övlad oldu.

* * * * *

Ürəyi yüz parça olmuş aşiqi danlamaq ona bənzəyir ki,
Qılınc yarası olana, həm də iynə batırasan

* * * * *

Ölümdən qorxum yoxdur, lakin ondan qorxuram ki,
Mən öləm, sən başqasının canı olasan.

* * * * *

Kədəri olan vüsaldan
Hicran yaxşıdır

* * * * *

Ey ürək, bir qədər vüsal məzəsini daddın,
İndi ayrılıq kədərini də görməlisən.

* * * * *

Mən biganələrdən nalə etmirəm, çünki ürəyimə
Dəyən zərbə özümdən dəymişdir.

* * * * *

Ürəyi yanıqlı mən saf bir çeşməyə çatmışam,
Lakin nə faydası, onun suyu içməli deyil.

* * * * *

Səni xatırlayaraq qəflətdə olan dilimi bağladım
Ya sənin adını deməliyəm, ya da eşitməliyəm.

* * * * *

Ayinlərə xidmət qaydalarında
Çox axtararsan və mənim kimisini  tapmazsan.

* * * * *

Sirr gövhəri ilə dolu ürəyim var
Və lakin dildə bu saysız-hesabsızdır.

* * * * *

Bülbülün naləsinin bir adı var ki, o da yara görədir.
Biz iki ağlar aşiqik ki, bizim işimiz zar etməkdir.

* * * * *

Tülkü it kimi güclənərsə,
Yırtıcı şiri dişləyər.

* * * * *

Ürəyi məhəbbətlə bir araya gətirdim ki, dəhrin gülzarında.
Yarın qoxusunu heç bir həmdəmdə tapmaq mümkün deyildir.
* * * * *
Dünyada hansı bahar küləyi olub
Ki, onun ardınca xəzan növbəsi olmasın.
* * * * *
Hər kimə ki, düz dedim, o saat mənə düşmən kəsildi,
Həqiqəti deyə bilməsən, susmaq hamısından yaxşıdır.
* * * * *
Sənsiz, ey arami-canım, necə yaşayım?
Yanımda olmasan necə şadlanım?
* * * * *
Bülbülünün nəvası axı necə xoşuna gəlsin,
Bir halda ki, boş danışan (hərzəgu) quşlarla yaxınlıq edirsən.
* * * * *
Can yandıran hicran bir dəm getmir ki,
Göz yaşlarımdan saralmış çöhrəm qana boyanıb.
* * * * *
Bayram gəldi qəmimi digər qəmlərimdən çox etdi,
Matəmi olana bayram daha bir matəm olar.
* * * * *
Biz səninlə içmişik, sənsiz haçan mey içərəm
Sənsiz mey içsəm, ürəyimin qanını içim.
* * * * *
Əgər mənim qanımla, qətlimlə xatirin xoş olarsa,
Canım minnət çəkər ki, sənin qılıncın qana bulaşsın.
* * * * *
Min dəfə Misirdən Kənana getdim,
Züleyxanın gözündən başqa yolda heç kəs yox idi.
* * * * *
O qırmızı paltarlı türk səməndə mindi,
Sevənlər həzər etdilər ki, od-alov qalxdı.
* * * * *
Sən hərəkətə gələndə sərvin dayanması yaxşıdır,
Sən danışanda tutinin susması yaxşıdır.
* * * * *

Bahar fəsli yetişdi, sünbül və süsən cücərdi.
Sənin üzünün heyrətindən mənə nə gül xoşdur, nə də gülşən.
* * * * *
Sənin üzünün vəslini çərxdən təmənna edirəm,
Sənin üzündən ötəri gərək düşmənin minnəti çəkilsin.
* * * * *
Vəslinin vədəsini sabaha verir mey, ey ürək,
Onun bu gününü görən sabaha çıxarmı?
* * * * *
Yarım mənə vəfazızlıq etdi,
Mey isə mənə cəfa etdi.
* * * * *
Ağlar ürəyi çıxart ona de ki,
Gümüşü əndamla həbəşizadələrin vəslini arzulamasın.
* * * * *
Yar, sənin adın şərabdır vəfası var,
Ey həmməsləklər, qoymayın huşyar olsun.
* * * * *
Hicrindən gecə deyib, gecə nalə edirəm, dad bu gecələrdən,
Qəm gecələrində batıb qalmışam, fəryad bu gecələrdən.
* * * * *
Həvəs əhlinə məhəbbət yanqısından nə cəza ola bilər?
Bu eşq atəşidir, hər kəsi yandırmaz.
* * * * *
Allaha şükür ki, təriqət yolunu gedən arif heç kəsə demədi,
Heyrətdəyəm ki, badəxorluğu haradan eşitdi.
* * * * *
İcazə ver, ləl dodaqlarının xalını dişlərimlə çəkim,
Caiz deyil ki, hindu, Kövsərin kənarında özünə vətən etsin.
* * * * *
Yarəb, bu qara xalı dodağın üstünə kim qoyub,
Yeri səhv düşən nöqtəni əmmək (pozmaq) gərəkdir.
* * * * *
Bizi onun ay cəmalından məhrum edəni,
Yarəb, görüm onun gecəsi də biz məhşərgörənlərin gecəsi
kimi keçsin.

* * * * *

Əgər sənin qəmini iki aləmə satsam, dəyəri var.
Çünki nəğd ömrü verib, sənin qəmimi almışam.

* * * * *

Kafərlər cansız bütlərdən nə təmənna alırlar?
Barı o bütə sitayiş edəydilər ki, onun canı var.

* * * * *

Səhv edib öz yarımın səri-zülfünü əlimdən verdim,
Öz qərarsız dostuma ehtiyac duymuşdum.

* * * * *

Mənim təzə ayinli (adət) yarım üzündəki pərdəni atsa,
Cahanı şux şəlayin atəş tutar.

* * * * *

Ey heyrət aynam, sənin təcəllan dağı ki, belə yandırdı,
Sən bu nazikliklə onun görüşünün taqətinə necə dözəcəksən?

* * * * *

Ayaqyalın, baş qoltuqda gəlirəm ki, firəng yoluna çatam,
Ki mən firəng dilənçisi, sən isə firəng şahısan.

* * * * *

Əcəb deyil ki, bir busə vəd edib gülümsədi
Sən lütf elə, yoxsa, qiyamətdən tələsmərəm.

* * * * *

Ovçunun ov dalınca qaçması əcəb deyil,
Ovun ovçu dalınca qaçması məzəlidir.

* * * * *

Sənin qarşında dua oxudum, ancaq söyüş eşitdim,
Hərgiz ürəyə bundan yaxşı təsir edən şey yoxdur.

* * * * *

Hər kəsə zəkalıdır demək olmaz
Eşqbazlıq biş şeydirsə, şəhvətpərəstlik başqa şeydir.

* * * * *

Mənim qanımı nahaq tökür, Allah, sənə əyandır
Xudaya, eşqbazlıqdan özgə təqsirim yoxdur.

* * * * *

Deyirlər ki, səhər duaları təsirli olur, bəli
Təsirli olur, amma aşiqin təbinin haçan səhəri olur?

* * * * *

Yüz xəncər vursan da mən can verməرəm.
Ki, bəlkə başqa xəncərin yaraladığı yerə yara düşə.

* * * * *

Onun cəfasından nalə etmirəm ki, qorxuram rəqib
Fəryadımın təsirindən başa düşsün ki, kimdən bidad edirəm.

* * * * *

Əgər ömr xoş keçərsə həyatda əyrilər az olar,
Əgər acılıqla keçərsə nəfi çox olar.

* * * * *

Əgər dünyada sənin hüsnünə təbib olsa,
Heç kəs allahdan əzablı cəfa istəməz.

* * * * *

Xoş gəldin ki, gəlməyin mənə xoş gəldi
Min qiymətli can sənin hər qədəminə fəda olsun.

* * * * *

Əgər bəsirətsiz bir kəsin əlinin altında olsa,
Əhli-ədəb çalışmaqla nə olar?

* * * * *

O yer ki, dostun məhləsidir məgər mən oraya getmərəm?
O yer ki, yar ayağını basıb məgər mən başımı qoymaram?.

* * * * *

Özün qiymət ver, ey qoca dünya,
Yeni ay işıqlıdır, yoxsa mənim ayım?

* * * * *

Əgər dua etmirəmsə, söyüşlə məni əzizlə,
O dodaqlarından nə buyursan, acı olsa da şirindir.

* * * * *

Yuxu mənim gözümə yuxuda necə gəlsin?
Gərək sənin xəyalın çıxsın ki, [gözümə] yuxu gəlsin.

* * * * *

Xudalıq iddiasında olan o pəriçöhrə,
Gördüm ki, saqqal çıxarıb dilənçilik edir.

* * * * *

Aşiqlərin divanı qiyamətə çəkməz
Ayrılıq əyyamında bidad edərlər.

* * * * *

Mən o sübh ulduzuyam ki, ədəb gözləyib,
Həmişə günəşin qarşısında oluram.

* * * * *

Sən ki məni bu gün öldürürsən
Sabahın harayı ilə nə edəcəksən?

* * * * *

Ey nəsihət verən (naseh), sən Yusifi hacan görmüsən?
Yersiz olaraq Züleyxaya qadağa qoyma.

* * * * *

Turandan İran tərəfə bir şüşə mey gətirin
Ki, ürək qanımı Kavuş güşəsinə bağlayaq.

* * * * *

Asandırsa bayıra çıx, canana ürək sözləri var,
Qorxuram qarət ahının xədəngini özünə sipər edəsən

* * * * *

Nə küfr qəmi, nə iman əndişəm var,
Ey körpə muğ, nə qədər canım var, eşqinin yükünü çəkəcəm,

* * * * *

Hər gecə mənim gözlərim yatmış oğru kimi ağlayır,
Ürəyimi qəminlə oyadıb qaldırır, yenə də geri qaytarır.

* * * * *

Üzüm giləsini suya döndərən muğlar,
Ulduzu sındırıb günəş düzəldirlər.

* * * * *

Sən günəşdən yaxşısan (gözəlsən) sənin üzün ayda yoxdur
Allah səni bəd gözdən qorusun, ay oğul!

* * * * *

Dünyada rüsvayi-cahan, bədnam oldum
O gül çöhrəndən bir busə aldığım üçün

* * * * *

Dostlar, eşq hədisi məktuba yerləşməz,
Bizim hekayətimizi qısa etsəm bir dəftər olar.

* * * * *

Dedim ki, eşqə səbrlə dəva edəm,
Hər gün eşq çoxaldı, səbr azaldı.
* * * * *
Minlərlə düşmənim əgər məni həlak etmək qəsdinə düşsələr,
Sən dostum olduğun üçün düşmənlərdən qorxum yoxdur.
* * * * *
O iki yanağın (üzün) yaxın olması yaxşı olsa da,
Rəqib gözündən uzaq olması daha yaxşı olar.
* * * * *
Aşiqin sevdasına necə əlac etmək olar?
Bu xülyanı mənə tərgit, ey təbib.
* * * * *
Ey gül çöhrəli saqi, bir cam şərab ver,
Ey xoş nəğməli mütrüb, cəng və rübab çal.
* * * * *
Ondan qorxuram ki, mənim kamım bu gjecə acı olsun,
Mənimlə saqi arasında bir səkkərab (şərbət) var.
* * * * *
Ey dost, rəqibin acığına, dostluq xatirinə,
Mənə bir busə ver ki, eyni onun cavabı olsun.
* * * * *
Nə vermişəm ki, yardan almaq üçün nalə edəm,
Od üstünə qoyulmuş qazan kimi oturmuşam.
* * * * *
Dövrü zamanın dəyirmanı başımı kifayət qədər fırlatdı,
Hər cəfaya dözdüyümə görə alt daşıyam.
* * * * *
Bülbül kimi məst gəlib gül kimi ona dua oxumaq istədim,
Məni lalə kimi lal etdin, dilim tutulub.
* * * * *
Sənin zülfünün arasında həmişə qovğa var, canan,
Məgər iki qara zülfünü qarqadan yaratmışlar?
* * * * *
Əgər sənin hicran qəminin zəhəri canıma işləsə,
Sənə qovuşmaq ümidi başqa bir ömr verər.
* * * * *

Əcəmdə sənin yolunda can qoydum
Canan, sən mənim qədrimi bilmirsən.
* * * * *
Əlində daş olan bir uşağın viranəyə tərəf getdiyi kimi
Bu dəli ürəyimdən başıma macəralar gələr.
* * * * *
Şəbdiz kişnəməsi və Xosrovun sədası Şirinin qulağına xoş gələr.
Amma Fərhadın tişəsinin səsi ondan da xoşdur.
* * * * *
Əksərən almədə yaxşı yoldaş tapmaq çətin olduğu üçün
Kimin əlinə beləsi düşsə o kimyagır ola bilər.
* * * * *
Hər ləhzə yanımda ürəyim fikirdən qana dönür ki,
Axıra qədər mənim işim görən eşqdən necə olacaq?
* * * * *
Dostlar mənim həmməsləklərimdir ki, qapıdan gəldim
Eşq o hədis deyil ki, başdan çıxa
* * * * *
Səhər sənin evinə gəldim, sən yuxuya getmişdin
Sən ki, məni görməmişdin, niyə yuxuya getmişdin?
* * * * *
Səhər məhlənə gəlmişdim, sən ova getmişdin
Sən ki, (özünlə) it aparmamışdın, nəyə getmişdin?
* * * * *
Məgər ürəyinin halından agahdır, ey kiprik cərgəsi (səfi)
Ki, qoşun arasında nigarım həyacanlanmış ov görmüşdü.
* * * * *
Ürək gətirmişdim, beləcə ürəyin ətəyi
Cigər parələri ildə dolu aparıram.
* * * * *
Məst olanların xarab olması (keflənməsi) qırmızı meyi
içməkdəndir,
Sənin iki məstanə gözlərin, nazıyla mey içməmiş məni məst edir.
* * * * *
Yarın mənimlə həmdəm olmamasına görə yanmıram,
Onun başqaları ilə oturub-durmasına görə yanıram.

* * * * *

Fələk məni sənlə həmağuş etsə, bu
Bağbanın təzə cücərən gül şaxını uca ağaca sarımasına bənzəyər.

* * * * *

Mənim şamım bu gecə pərvanəni yandıracaq,
Qonaq ev sahibinin qurbanı ola bilər.

* * * * *

Pərvanəni yandıran şam özündən xeyir görmədi,
Eşq ahı tezliklə məşuqənin ətəyindən yapışar.

* * * * *

Gah məni bənövşə xarab edir (halımı pozur) gah da sünbül,
Bilmirəm bu çəmənlikdə ədavət kiminlədir?

* * * * *

Gah eşqdən nalə edirəm, gah da bulud kimi ağlayıram
Ona görə ki, eşq badəsində novcəvanım var.

* * * * *

Sənin qara zülfün yadıma düşən zaman
Sənin zülfünün pərişanlığı kimi pərişan oluram.

* * * * *

Fəqan olsun rəftarı pis olan dünyanın hərəkətindən,
Mənimlə yar arasına ayrılıq saldı.

* * * * *

Bu gecə mən narahatın zicrini gör, nə edirəm,
Aşiq sinədəki aha nə qədər dözsün?

* * * * *

Bilmirəm niyə üzünü çevirdin
Ürək incidənsən, ürək incidənsən, ürək incidən (dilazarsan,
dilazarsan, dilazar)

* * * * *

Ürək incitmək (dilazarlıq) əgər sənin işin deyilsə,
Sənin kipriginin  mənim gözümdə nə yeri vardı?

* * * * *

Mən və yarıma xəlvət yerdə oturmaq xoşdur
Nə rəqib dərdi-sərimiz var, nə də əğyar söz-söhbəti

* * * * *

Kaman qaşları olan o pəriçöhrənin
Hər bir kiprik oxunda bir cavanın əli var.
* * * * *
O kəs ki, ürəyini sənə verdi, vay onun halına,
Hələ dodağının altındakı xalı görməmişdir.
* * * * *
Bülbül gül üçün ağlasa, əcəb deyil,
Biz də yar üçün nə qəmlər çəkmişik?
* * * * *
Təbibin yanına getdim ki, ürəyimə əlac etsin,
Ah çəkib dedi ki, bu davasız dərddir.
* * * * *
Hər şey cənnət bağı kimi olsa da, mənim ürəyimi açmaz,
Matəmzədə gül necə şad otursun ki, onun ürək qəmi var.
* * * * *
Əcəb şux sitəmkardır, ancaq üzü şölədir,
Hər kimlə aşina olsa dudmanını yandırar.
* * * * *
Səri-zülfünə aid olan ürək,
Pərişan saçında necə cəm ola bilər?
* * * * *
Kaş məşuqə aşiqdən can tələb etsin,
Ta ki, hər nizam-intizamsız heç kəsin yarı olmasın.
* * * * *
Kaş məhəbbətin təsiri iki tərəfdən olaydı,
Sənin ürəyini çəkəndə, mənim ürəyim də çəkiləydi.
* * * * *
Şamın pərvanənin nahaq qanını tökdüyünü gördünmü?
Aman vermədi ki, gecəni səhərə çatdırsın
* * * * *
Hər kəs desə ki, gözəllərdə vəfa var,
Dünya durduqca ona lənət olsun.
* * * * *
İstəmirəm ki, sənin uca boyunun kölgəsi yerə düşsün
Elə güman etməyim ki, ayaqdan düşmüş, ayağına düşmüşdür.
* * * * *

Əgər əğyarla bir kəlmə, mənimlə yüz kəlmə danışsan
O bir kəlməyə dözə bilmərəm, istəyərəm ki, onu da
mənimlə danışasan.

* * * * *

Dünən mənim yanımdan əcəb bir qaragözlü keçdi
O, əcəb baxdı, mən də əcəb (qəribə) ah çəkdim.

* * * * *

O gözəllər şahı ürək qoşunlarının qarşısında idi,
Əcəb padşah idi, əcəb də qulam.

* * * * *

Mənim qanımı tök, camaatı töhmətləndir
Ki, bir daha sənin məhləndən az keçsinlər.

* * * * *

Onun əhvalını hərgiz heç kəsdən soruşmuram,
Qorxuram ki, rəqiblə görmüş olalar.

* * * * *

O pis xasiyyətli tifil məndən qaçır,
Onun qulamı mənəm, (amma) o qaçır.

* * * * *

Əgər Allah şəbi-hicran cəzası versə,
Kafər və müsəlmanı behiştə tərəf apararam.

* * * * *

Hər gün bir addım qapından uzaqlaşıram,
Ola bilsin ki, get-gedə kuyindən uzaqlaşam.

* * * * *

Dostun qapısı əl verər, heç nə söyləmə.
Gözəl üzlü gəlin cehizsiz daha xoş olar.

* * * * *

Baxışlarıyla torpağı kimya edəndər,
Olarmı ki, gözlərinin ücü ilə mənə baxsınlar?

* * * * *

Pişnamazın qarşısından keçən sərvi rəvan mənə dedi:
Əhli-dilin qibləsi mənəm, namazı səhv qılırsan.

* * * * *

Eşqdən doğuldum, eşqimi öldürdü heyhat, zar edirəm.
Rüstəmə heç kəs xəbər vermədi ki, Söhrabam

* * * * *

Alnını turşutsan da fərq etməz,
Min acı söz desən, yenə də şirinsən.

* * * * *

Mənim nigarımın üzündəki tər bilirsən nəyə bənzəyir?
- Gül ləçəyində bahar yağışının damlasına.

* * * * *

Səni yad etməklə ünsiyyətdə olan tənha deyil,
Söyləmə ki, mənim tənhalığa taqətim var.

* * * * *

Hamının gözü sənin üzünə nigarandı, lakin
Hamıya demək olmaz ki, görəndi.

* * * * *

Fələk ataya çoxlu xəbər göndərmək lazımdır
Ki, bir daha dünyanın anası sənin kimi bir övlad doğsun.

* * * * *

Mənim əqlimə, dinimə xilaf olanı mənə həmnişin etdi,
Mənim qolumdan tutub, ətəyimdən əl çəkmir.

* * * * *

Əgər gəlməyimdən incimədinsə, yaxşıdır,
Həmişə gözlərimi qədəmlərimə çevirib sənə tərəf gələcəyəm.

* * * * *

Heç olmasa bizə tərəf də bax
Bizim ürəyimizi ələ alıb dərdimizə dava et.

* * * * *

Çox xilaf vədələr verdin,
Heç olmasa, səhvlərinin birinə vəfa et.

* * * * *

Məni də sən bütün günlərin xatirinə,
Heç olmasa, bircə gün yada sal

* * * * *

Bu xilaf qaydanı (kənara qoy) keç
Və bu inadkar xasiyyətini boşla.

**Dayısı Abdulla bəy Asinin vəfatı münasibətilə**
**Səməd bəyin (farsca) yazdığı maddeyi-tarix**

Fəqan, yenə üzü qara çərxin gərdişindən,
Qəm sultanı ələm şəhərinə ordu çəkdi.

Şeir deməkdə və nəzm qoşmaqda ad-sanı
Ay və günəşə çatan Asi həqqin dəvətinə

«Ləbbeyk» deyib, bu vəfasız dünyadan
Allahın rəhmətinə tərəf yollandı.

Əfsus, elm və söz xəzinəsi olan o sinəyə
Ki, qara torpağın altı ona yataq oldu.

Qeybdən vəfat tarixi üçün nida gəldi.
Ruhu behişt (1291) qəsrlərini özünə yer etdi.

## MÜNDƏRİCAT

Raqub Kərimov.
Abdulla bəy Asinin həyat və yaradıcılığı ................................5
Abdulla bəy Asi. Şeirləri ...................................................... 67
Qəzəllər ..................................................................................... 69
Cığatay dilində yazdığı şeir ................................................. 88
Müxəməslər.......................................................................... 90
Tərcibəndlər ........................................................................ 94
Cinaslı qəzəllər................................................................... 100
Təcnislər ............................................................................. 101
Bəhri-təvillər ....................................................................... 104
Mərsiyə və növhələr............................................................ 109
Fərdlər.................................................................................. 117
Müşairə ................................................................................ 118
Həcvlər ................................................................................ 119
Poetik məktublaşmalar........................................................ 136
Asinin farsca şeirlərinin tərcüməsi:
Qəzəllər ............................................................................... 152
Rübailər................................................................................ 187
Dini şeirlər ........................................................................... 188
Fərdlər.................................................................................. 197
Maddeyi-tarix....................................................................... 210
Asinin avtoqrafı, azərbaycanca və farsca şeirlərinin
fotofaksimilesi..................................................................... 211